**Mürsəl Qocayevin anadan olmasının**
**95 illiyinə ithaf olunur.**

**Hacı Əli Sobulu,**
**Əbədiyaşar Mürsəl Qocayev**
Bakı: «Zərdabi Nəşr» MMC, 2021, 208 səh.

Kitab qocaman jurnalist Mürsəl Qocayevin həyat və yaradıcılığına həsr olunur.

S $\frac{4705120996 - 27}{0105 - 2021}$ Qrifli nəşr

# Ön söz

Vaxtilə Bakıya gələn Azərbaycan publisistikasının banisi H.Zərdabi ilə tanış olan bir fransız jurnalist xitabən deyir: “..... doğrusu, siz əsl qəhrəmansınız! Bizim Fransada belə bir yoxsul qəzet üçün işləmək istəyən adam tapmaq olmazdı. Sizin qüvvənizə heyrət eləyirəm. Belə məlum olur ki, siz öz xalqınızı çox istəyirsiniz!”

Bu fikirləri mübaliğəsiz olaraq Zəngilan rayon qəzeti “Kənd həyatı”nın redaktoru Mürsəl Qocayevə şamil eləmək olar.

O, 1957-ci ildə “Avanqard” qəzetinin (Qubadlı rayonu) redaktoru, rayonlararası “Kolxozçu” (Qubadlı, Zəngilan) qəzetində müxbir, 1963-cü ildən “Kənd həyatı” (Qubadlı, Zəngilan, Laçın) qəzetinin redaktoru, 1965-ci ildən 1989-cu illədək “Kənd həyatı” (Zəngilan) qəzetinin redaktoru olmuş qəzetin, dörd min sayda qəzetin buraxılışına imza atmışdır.

Əgər əsgər hərb meydanında bir cəbhədə vuruşursa, jurnalist bütün cəbhələrdə - elm, mədəniyyət, incəsənət, istehsalat, təsərrüfat və s. sahələrdə yüksək peşakarlığı, düzlüyü, tərəfsizliyi və qələmi ilə vuruşur. M.Qocayev məhz zəkalı, şüurlu həyatın bu peşəyə həsr etmiş, anlaşıqlı, aydın və sadə dillə kütləvi, ictimaiyyəti inandıracaq qərəzsiz mövqedən çıxış etməyə çalışmışdır.

Xeyli axtarış, ciddi araşdırma aparan müəlliflər – Hacı Əli Sobulu, Asif Bağırov – M.Qocayev haqqında maraqlı, oxunaqlı kitab ərsəyə gətirməyə müvəffəq olmuşlar: “Əbədiyaşar Mürsəl müəllim”.

Kitabda M.Qocayevin əhatəsi, ətrafı, həyat yolu, qohumluq qaynaqları, ali təhsil və müəllimləri, tələbə yoldaşları, dost-tanışları. İş yoldaşları – yaradıcı kollektiv, qələmə aldığı məqalələr və onun qəhrəmanları diqqət və həssaslıqla toplanıb bütün incəlikləri və dolğunluğu ilə oxuculara təqdim olunur.

Saflıq, paklıq, halallıq M.Qocayevin amalı həyat kredosudur.

Hər bir kəs zəhmətin, alın tərinin nə olduğunu bilməli, faydalı bir işlə məşğul olmalıdır.

Dədə Qorqud timsallı, müdrik, sadə əliqabarlı, dili dualı kəndli Cəfər babanı belə təqdim edir: "- Əkinçi gərək halal olsun, səxavətli olsun. Bilsin ki, torpağa atdığı toxum təkcə özü üçün deyildir. Ona görə ata-babalarımız toxumu ovuc-ovuc səpəndə deyirmiş: bu bir ovuc qarışqanın-quşun, bu bir ovuc nəzir-niyazın, xüms-zəkatın, bu bir ovuc xırman üstə gələnin, qismət üstə çıxanın, bu bircə ovuc da mənim".

Bu gözü toxluğun nəticəsidir ki, M.Qocayev 1993-cü ilə qədər "jildom"da (sosial binada), ömrünün sonrakı illərini isə tələbə yataqxanasında yaşamışdır.

M.Qocayev yaradıcı gənclərə həmişə diqqət, qayğı göstərir, onları ruhlandırır, qəzetdə ədəbi-bədii yazılarına yer ayırırdı. Həmin gənclərdən biri də mən olmuşam. Qəzetin formatı kiçik olsa da o, böyük ürək, əqidə sahibi bir neçə məaqlə və hekayələrimin çap olunmasına şərait yaratmışdır.

M.Qocayevin respublikanın bir sıra mətbu orqanlarında gedən yazılarına nəzər saldıqda belə qənaətə gəldim və müşahidə etdim ki, yaratdığı qəhrəmanların cizgiləri, alicənablığı həm də özünü xarakterizə edir.

Nazir Kərimov haqqında yazır: "Yollar hamar olmur. Onun sərt yoxuşu da olur, enişi də. Yoxuşa çıxmaq adamdan dözüm, inam və qüvvə tələb edir. Enişdən isə gərək təmkinli olub müvazinətini saxlamağı bacarasan. Ömür zirvəsinə alnı açıq, üzü ağ çıxmaq üçün gərək bu sınaqlara dözəsən. Ucalanda coşub, aşağı düşəndə çaşmayasan....."

M.Qocayev ömür yolunda belə sınaqalardan qədərincə keçib. Vətənə, yurda, xalqına bəslədiyi məhəbbətin alovu onun iradəsini ən çətin anlarda da polad kimi bərkidib. Amma doğma yurdun düşmən tapdağı altında olmasına "qəlbi soğan kimi soyulub, üstünə duz basılmış yara kimi göynəyib."

O, torpaqlarımızı işğal edən mənfur düşmənə qarşı susmayıb, vulkan kimi püskürüb, bütün vücudu silkələnib, hayqırıb, dünyanı haqqa, ədalətə çağırıb.

Bu təcavüzü milli azadlıq hərəkatı kimi dünyaya sırıyan erməni və havadarlarına üz tutaraq deyir: "Görəsən, nə qədər məkrli

bir siyasətçi olmalısan ki, dünya ictimaiyyətini aldatmağa belə cəsarət göstərəsən və beynəlxalq miqyaslı siyasətçi kimi nə qədər sadəlövh olmalısan ki, bu boyda ağ yalana inanıb bir dövlətin digər dövlətə qarşı təcavüzünə etinasızlıq göstərib susasan, hətta onu müdafiə də edəsən?!" Bundan sərt mövqe və aydın münasibət ola bilməz.

M.Qocayev bəzən daxili auditoriyada da sərt, qətiyyətli mövqe nümayiş etdirmək məcburiyyətində qalır. Qəzetin əməkdaşı Salam Cavadlı (indi "Zəngilanın səsi" qəzetinin redaktorudur) xatirələrində göstərir ki, rayonda nüfuz sahiblərindən biri redaksiyaya gələrək haqqında yazılan tənqidə etiraz edir, qeyri-obyektiv olduğunu israr edir.

M.Qocayev təmkinlə cavab verir ki, əslində qalsa işinizdə bundan da çox əyintilər var. Lakin qarşı tərəfin yersiz inadkarlığına dözə bilməyib sərt reaksiya verir: - Mən sizi ziyalı bilirdim..... Daha siz mənim üçün burada yoxsunuz. Ürəyiniz istəyən qədər çığırın.

Tanıyanlar bilir ki, M.Qocayev heç kəsin qarşısında gözükölgəli deyildi, başı uca, alnı açıq, gözü tox, nəcib, sadə, yüksək intellektli şəxsiyyət idi.

Elə məqamla var idi ki, özünə hakim ola bilmir, gücü çatmır, əli yetmir, çarəsiz bir vəziyyətə düşür, kədər hissi onu boğurdu: "Mən Arazdan İrana keçib, bircə dəqiqə ayrıldığım doğma Zəngilanı sağ sahildən seyr edərkən dərk etdim ki, nə üçün Yaqubun (Zürufçü nəzərdə tutulur – A.Ə.) səsi bu qədər qüssəlidir. Xudaya! Görəsən, Vətən dərdindən ağır dərd varmı? Qəlbimdə baş qaldıran bu suala var səsimlə milyon dəfə demək istəyirəm: Yox! Yox! Yox!....."

Budur əsl vətənpərvərlik, yurd sevgisi, torpağa məftunluq. Amma nikbinliyini, ümidini itirmir, inanır ki, gün gələcək, əhali öz yurduna, isti ocağına qayıdacaq, qurub yaradacaq.

"Vaxt gələr xalq özündə qüvvə tapıb işğal olunan torpaqları azad edər, didərginlər geri dönər.....Görəsən, bu köç nə vaxt geri qayıdacaq?!" – deyən bu uzaqgörən, müdrik el ağsaqqalının arzusu çin oldu. Köç qayıtdı. Ali Baş Komandanın müzəffər ordu-

muzun, şəhidlərimizin, qazilərimizin, əsgərlərimiz və xalqımızın birliyi və gücü ilə düşmənim başı əzildi. Təəssüf ki, bir çoxları kimi Mürsəl müəllim də bu zəfər gününü, bu qələbəni görə bilmədi, nəsib olmadı.

Ruhunuz şad olsun, daim qəlblərdə yaşayacaq el ağsaqqalı, nəcib xeyirxah, hər bir kəsə örnək ola biləcək şəxsiyyət, kamil, müqəddəs, heykəlləşən insan "Əbədiyaşar Mürsəl müəllim".

***Alı Rəhimoğlu (Əliyev)***
***yazıçı, publisist***

# Müəllifdən

Müqəddəs Kitabımız «Qurani» Kərimdə ölüm barədə bir neçə ayə var. Yazımın əvvəlində onları xatırlamaqda məqsədim oxucunu, insanları bədbinləşdirmək deyil, gerçəyi bildirməkdi. Dünyada Allahdan başqa əbədi heç nə yoxdur. Allahın yaratdığı bütün canlılar ölümü dadacaqlar. Bəzən insan bu dünyada sanki əbədi qalacaqmış kimi davranar, yığar, yığar, bir gün heç xəbəri belə olmadan nəyi varsa qoyub gedər.

Belə olan halda görəsən niyə bizlər, bizə yetən qədəri ilə kifayətlənmir elə hey yığır, başqasının əlində nə varsa onu da alırıq. Elələrimiz var ki, malı, pulu yığmağa yer tapmır, hətta hesabın bilmir.

**- (***Ya Məhəmməd!)* **De ki: «Sizə müvəkkil olan ölüm mələyi canınızı alacaqdır. Sonra da** *(qiyamət günü)* Rəbbinizin hüzuruna qaytarılacaqsınız». (əs-Səcdə 11).

- (İblis) dedi: - **“Sənin izzətinə-qüdrətinə and olsun ki, onların (***Adəm övladının***) hamısını (***haqq yoldan)* **azdıracağam; Yalnız Sənin sadiq bəndələrindən başqa!”** Sad surəsi, 82-83-cü ayələr

**Yalnız Sənin sadiq bəndələrindən başqa!”** Hicr surəsi, 40-cı ayə:

**Doğrusu, Mənim (***mömin)* bəndələrim üzərində sənin heç bir hökmranlığın ola bilməz. Rəbbinin vəkil olması (*sənin şərindən və vəsvəsəndən onları qorumağı)* **kifayət edər! Şeytan insanları vəsvəsə ilə aldadır və yoldan çıxarır, lakin sadiq və xalis iman sahibləri şeytana uymaz**. İsra surəsi, 65-ci ayə

**Sənə uyan azğınlar istisna olmaqla, bəndələrim üzərində** *(onları yoldan çıxarıb günaha vadar etməyə)* sənin heç bir hökmün olmaz! Bu ayə açıq-aydın bir məsələ barədə xəbərdarlıq edir: insanları düz yoldan çıxaran şeytan deyil, azğın və çaşqın insanlar öz iradə və ixtiyarı ilə şeytanın dəvətini qəbul edir, onun yolu ilə getməyi özlərinə rəva bilirlər. Hicr surəsi, 42-ci ayə.

Ayələrdən göründüyü kimi şeytan qiyamətə kimi bizim düşmənimiz olaraq qalacaq və bizi düz yoldan sapdırmağa çalışacaq. Xöşbəxt o insandır ki, şeytana inanmaya, onun şirin dilinə inanıb yolundan azmaya. Allah Quranda insana Cənnət vəd edir. Əgər Adəm oğlu bu dünyada şeytana uymazsa, özünə aid olanla kifayətlənərsə, elə bu dünyada da, o cənnəti görər və yaşayar. Allah bu dünyada insanın yaşaması üçün hər şey yaradıb.

Dahi şairimiz Nizaminin ideal həyat barədə fikirləri çoxdur. Nizami bu ideyanı «Quran»dan götürüb. Nizaminin məntiqinə görə, ədalətsiz müharibə zülmdür. Həm ölkəni, həm də dünyanı zülm altında saxlamaq faydasızdır. Allah hökmdarları Yer üzünə məhz əmin-amanlıq yaratmaq, zülmü aradan qaldırmaq üçün gətirmişdir.

Böyük mütəfəkkir insanlığa üz verən iztirab və bədbəxtliklərin səbəbini bilavasitə insanın özündə, insanlıq hisslərinin yox olmasında görür. Yalnız «insanlıq nəqşini oxumaqla, bugünkü insanlığın nə demək olduğunu» dərk etmək olar. Nizaminin fikrincə, başqalarına əzab və iztirablar verən adamdan əsl insan, öz xalqına əziyyət verəndən müdrik və ədalətli hökmdar olmaz. Hökmdarlıq insana tabeliyində olanlara əziyyət vermək, zülm etmək üçün verilmir. Belə hökmdarlıq alçaqlıqdan, rəzillikdən başqa bir şey deyildir.

Nizaminin sosial ədalət konsepsiyasında insafdan və xeyirxahlıqdan dönməzlik haqq və ədalət yolunda atılan mühüm addım kimi qiymətləndirilir. Onun ideyasına görə, «ədalət yolundan dönməzliyi insanlara adil və ulu Tanrının özü öyrətmişdi». «Yoxsula, məzluma kömək olmaq, qaranlıq gecədə parlayan şimşək kimi çaxır».

**N.Gəncəvinin ideal və ədalətli cəmiyyət konsepsiyasında insan haqları ideyasının təcəssümü (sesqazeti.az)**

Mən də ağlım kəsəndən belə bir ədalətli cəmiiyyət arzusunda oldum. Həmişə insanlara bu cür yanaşdım, əksini görəndə isə sanki dərin bir quyuya düşdüm və aylarla oradan çıxa bilmədim, mənən əzildim.

Bizim Zəngilan dünyanın siyasi xəritəsində heç iynənin ucu boyda belə görünmür. Bu balaca diyarın bu dünyaya sığmayan saf, təmiz əqidəli, əxlaqlı, gözü tox insanları olub. Mən burada onlardan biri barədə danışacağam. Bu insan ömrü boyu Zəngilan da yaşadı. Mürsəl Qocayev rayonda nəşr olunan «**Kənd h**əyatı» qəzetinin baş redaktoru idi. O, 35 il bu mətbu orqana rəhbərlik etmişdir. Bilirsiniz ki, sovet zamanında qəzetin hökmü milisdən, prokurordan, məhkəmədən də qüvvətli idi. Bu sahənin başında duran kişi nə istəsəydi eləməzdi. Amma, Mürsəl Qocayev ömrü boyu ictimai binada yaşadı. O istəsəydi özünə bir çoxları kimi şəxsi ev tikə bilməzdimi? Qaçqınlıqdan sonra da Bakıda yataqxanada yaşadı və bu yalan dünyanı düzlüklə, saf əqidə ilə tərk etdi.

**H.Ə.Sobulu**

## Mürsəl Eyvaz oğlu Qocayev



Qocayev Mürsəl Eyvaz oğlu 21 mart 1926-cı ildə indiki Zəngilan rayonunun Sarallı Xəştab kəndində (bu kənd 1963-cü ilə kimi Qubadlı rayonunun inzibati ərazisinə daxil idi) anadan olmuşdur.

Atası Eyvaz kişi əsrin əvvəllərində bir müddət Bakı şəhərində fəhlə işləmişdir. Ancaq bu həyata uyğunlaşa bilmədiyindən rayona qayıtmışdır. Bir müddət sonra o Zülfü Əhmədovun bacısı Tubu Şahvələd qızı ilə evlənmişdir. Bu evlilkdən onlarım iki qızı (Telli və Suratel) və beş oğlu (Mürsəl, Əli, Vəli, Səməd və Vaqif) olub. Mürsəl müəllim onların ikinci övladı və ilk oğulları idi. Eyvaz kişi 1963- cü ildə vəfat etmiş və Sarallı Xəştab kənd qəbiristanlığında dəfn olunmuşdur.

İlk ibtidai təhsilini kənd məktəbində alan yeniyetmə Mürsəl sonra qonşu kənddəki orta məktəbin 6–cı sinifdə oxuyarkən bir qrup məktəbli ilə birlikdə əlaçıların rayon toplanışına aparılmışdır.

Faşist Almaniyasının SSRİ-yə qəflətən hücumu zamanı müharibə başladı o, (1941-ci ildə) bir neçə şagirdlə bərabər Bakı şəhərində peşə öyrənməyə göndərildi. Bakı şəhərindəki 10 saylı Texniki Peşə Məktəbini tornaçı (tokar) ixtisası üzrə bitirdikdən sonra o vaxtkı Kirov (indiki Binəqədi) rayonunda olan hərbi zavodda bir müddət işləmiş, sonra kəndə getmiş və bir il kolxoz təsərrüfatında çalışmışdır,

1943-cü ildə yenidən Bakıya gedən Mürsəl Binəqədi neft trestinin dəqiq ölçü alətləri sexində işləmiş, eyni zamanda axşam fəhlə-gənclər orta məktəbində təhsilini davam etdirərək orta təhsil alıb.

Artıq Mürsəl Qocayevin orta təhsil haqqında kamal attestatı var idi. Sonraki həhsili düşünmək zamanı çatmışdı. 1944-cü

ildə indiki N. Tusi adına (o vaxtkı V.İ.Lenin adına) Azərbaycan Dövlət Pedaqoji İnsitutuna daxil olub, 1948-ci ildə dil-ədəbiyyat fakultəsini müvəffəqiyyətlə bitirmişdir.

Ali məktəbi bitirdikdən sonda onu doğulduğu rayona müəllim göndərmişlər.

O, əvvəl altı il Zəngəzurda, əsası 1884-cü ildə qoyulan ilk məktəblərdən biri və diqqətəlayiq ənənəsi olan Qubadlı orta məktəbində əvvəlcə müəllim, sonralar isə tədris hissə üzrə direktor müavini işləmişdir. Bütün bunlar ona qarşıdakı fəaliyyət illəri üçün möhkəm zəmin yaratmışdır.

Bu barədə Mürsəl müəllim həmin məktəbin 125 illik yubileyində belə deyib:

- Bu barədə danışmaq mənə ona görə xoşdur ki, bu məktəb mənim həyatımda unudulmaz izlər buraxmışdır. 1948-ci ildə API-ni qurtaranda ilk təyinatım bu məktəbə olmuşdur. 3 il bu məktəbdə dil- ədəbiyyat müəllimi, 2 il yarım isə təlim-tərbiyə işləri üzrə direktor müavini işləmişəm. 1955-ci ildə rayon partiya komitəsinə şöbə müdiri vəzifəsinə irəli çəkilmiş, 1957-ci ildə rayon qəzetinə redaktor təyin olunmuşam. Sonra Cəbrayıl rayonlararası qəzetdə işləmiş, 1963-cü ildən Zəngilan rayonlararası qəzetə redaktor təyin olunmuşam.

Qubadlı Zəngilan rayonu tabeçilkiyində olanda ziyalıları, yazıçıları eyni zamanda Respublika rəhbərliyində olan kadrları nöqteyi nəzərdən bir qədər öndə idi. Yazıçılar Süleyman Rəhimov və Əli Vəliyevin adlarını qeyd etmək yetər.

Mürsəl müəllimin dediklərindən.

-Uşaqlığın maraq dünyasının həddi–hüdudunu təsəvvür etmək çətindir. Nələr arzulamır, nələr düşünmür... Ömür zirvələşəndə belə adam öz uşaqlıq, yeniyetməlik dünyasını həyəcansız xatırlaya bilmir. Məni bu gün kövrəldən belə xatirələrdən biri Süleyman Rəhimovla bağlıdır.

Onun adını ilk dəfə otuzuncu ilin ortalarında IV sinifdə oxuyarkən ilk müəllimlərimdən biri, həmkəndlisi Bəhlul Rəcəbovdan eşitmişdim. Deyirdi ki, rayonumuzda yazıçılıqla məşğul olan ilk adamdır. Hekayələr yazır. Onun «Şamo» adlı romanı da vardır.

Onu görmək arzusu da qəlbimdə məhz həmin vaxt baş qaldırmışdı. Ancaq bu arzuya çatmağın mənə nə zaman nəsib olacağını heç təsəvvürümə gətirə bilmirdim.

Otuzuncu illərin sonunda eşitdim ki, Əyin kəndində pioner düşərgəsi açılacaqdır. Buraya ancaq əlaçı uşaqlar göndərilir. O zaman bizim düşərgə haqqında təsəvvürümüz yox idi.

Dərs ilinin sonunda düşərgəyə getməli olan şagirdlər müəyyənləşdi. Bu şərəfə nəsib olan şagirdlərdən biri də mən idim.

Nəhayət, 1940-cı ilin iyul ayında məni düşərgəyə apardılar. 1941-ci ildə məni yenə də düşərgəyə göndərdilər. Bu dəfə Əyinə «köhnə sakin» kimi gəlmişdim. Ancaq müharibə düşəndən bir həftə sonra məni bir sıra həmyaşıdlarımla bərabər elə düşərgədən səfərbərliyə alıb Bakıya, texniki peşə məktəbinə göndərdilər.

1942-ci ilin iyul ayında məni FZO–ya (peşə məktəbinə) qəbul etdilər. Həmin məktəbi qurtarandan sonra isə Binəqədineft trestinin KİP (dəqiq ölçü cihazları) zavodunda xidmət çilingəri işləməyə başladım, həm də axşam fəhlə–gənclər orta məktəbində təhsilimi davam etdirdim.

1944-cü ilin ortaları idi. Sənət məktəbinin müdavimi kimi Binəqədi Neft Trestinin dəqiq ölçü alətləri sexində buruqlardakı ölçü cihazlarına xidmət çilingəri işləyir, həm də axşam orta məktəbində təhsilimi davam etdirirdim

Mürsəl Qocayev 1944-cü ilin oktyabr ayında Azərbaycan Dövlət Pedaqoji İnstitutunun dil-ədəbiyyat fakultəsinə daxil olmuş, 1948-ci ildə oranı bitirmişdir. 1948-49 tədris ilində Qubadlı qəsəbə orta məktəbində müəllimlik fəaliyyətinə başlamış, 1953-55-ci illərdə tədris hissə üzrə direktor müavini işləmişdir.

Bu illərdə bütün sahələrdə təhsilli və ixtisaslı gənclərə ehtiyac çox idi, təhsilli, savadlı kadrlarımız çatmırdı.

Sovet hökumətinin əsas silahlarından biri də təbliğat idi. Məhz bu səbəbdən də Mürsəl müəllimi bacarıqlı bir kadr kimi 1955-ci ilin yanvarında Qubadlı rayon partiya komitəsində ideoloji şöbə müdiri vəzifəsinə irəli çəkirlər. Sonra 1957-ci ilin oktyabrında isə rayonda nəşr olunan «Avanqard» qəzetinin redaktoru təyin edilmişdir.

1963-cü ildə Qubadlı rayonu Zəngilan rayonu ilə birləşdirilmiş Zəngilan, Qubadlı, Cəbrayıl rayonları üzrə istehsalat birliyi təşkil olunmuşdur. Bu zaman həmin birlik üzrə Azərbaycan MK və Azərbaycan SSR Nazirlər Sovetinin orqanı kimi həftədə 4 dəfə dərc olunan rayonlararası «Kolxozçu» qəzeti nəşr olunmağa başlamışdır. O, həmin qəzetin Qubadlı və Zənglian rayonlatrı üzrə xüsusi müxbiri təyin olunmuş və 1963-cü ilin əvvəlinə kimi işləmişdir.

Mürsəl Eyvaz oğlu Qocayev 1963-cü ildə Qubadlı, Zəngilan və Laçın rayonu üzrə rayonlararası «Kənd həyatı» qəzeti təsis olunarkən həmin qəzetin redaktoru təyin olunmuş və 1965-ci ildə həmin rayonlar ayrılıb özlərində qəzet buraxmağa başlayandan sonra o, «Kənd həyatı» rayon qəzetində redaktor fəaliyyətini davam etdirmişdir. 1986-cı ildə təqaüd yaşına çatsa da onu vəzifədən azad etməmişlər. Ancaq 1989-cu ilin iyul ayında redaktorluqdan könüllü surətdə təqaüdə çıxmış və jurnalistlik fəaliyyətini rayon və respublika qəzetlərində vaxtaşırı məqalələr yazmaqla davam etdirmişdir.

Redaktor olduğu müddətdə işlədiyi kollektivə bacarıqla başçılıq etmiş, onların öz ixtisas, bilik və bacarıqlarını yüksəltməyə hər vasitə ilə köməklik göstərmişdir. İşlədiyi müddətdə mətbəə üçün ixtisaslı işçilər yetişdirmiş, redaksiya işçilərinin jurnalist təhsili almalarına nail olmuşdur.

Vaxtilə qəzetdə fəhlə-kəndli müxbiri kimi iştirak etməyə həvəs göstərən bir sıra gənclərin universitetdə ixtisas təhsili almalarına redaksiyanın zəmanəti ilə istiqamət vermişdir. Əgər 1963-cü ildə redaksiyada 1 nəfər jurnalist var idisə, onların sayı tədricən artmağa başlamışdır. Beləliklə jurnalistlərin sayı artıq qonşu rayon redaksiyaları arasında birinci olaraq Zəngilanın «Kənd **h**əyatı» qəzeti redaksiyasında Azərbaycan jurnalistlər birliyinin ilk təşkilatını yaratmağa imkan verir. 1980-ci illərdə 6 nəfər qiyabi, 6 nəfər isə qəzetin zəmanəti ilə əyani jurnalist təhsili almışdır.

O zamanlar ali məktəblərə qəbul heç də asan deyildi. Ancaq qəzetlərin nəşr olunma dövriyyəsi artdığı və həmçinin genişləndirilməsi jurnalist kadrların yetişdirilməsi zərurəti yaratmışdır.

Redaktor kimi o, bu güzəştdən istifadə edərək bir qrup mətbuat həvəskarı olan gənclərin jurnalist təhsili almaları uçün lazım olan bütün köməkliyi göstərmişdir. Qiyabi təhsil alanların əvəzinə özü aylarla işləmək məcburiyyətində qalmışdır.

1964–cü ildə Naxçıvan MR–in 40 illiyi ilə əlaqədar Zəngilan–Qubadlı–Laçın rayonlararası «Kənd həyatı» qəzetinin redaktoru kimi nümayəndə heyəti ilə birlikdə yubiley şənliklərində iştirak etmişdir. Mürsəl müəllim orada Azərbaycanın bir çox tanınmış ziyalıları, elm adamlar ilə tanış olmuşdur.

Bu barədə Mürsəl müəllim yazırdı:

-«1964–cü ildə Naxçıvan Muxtar Respublikasının 40 illiyi ilə əlaqədar Zəngilan–Qubadlı–Laçın rayonlararası «Kənd həyatı» qəzetinin redaktoru kimi nümayəndə heyəti ilə birlikdə yubiley şənliklərində iştirak edərkən mehmanxanada onunla bir yerdə qalmış (söhbət Süleyman Rəhimovdan gedir), şəhər orta məktəblərinin birində keçirilən görüşdə, «Şərq qapısı» qəzetinin redaktoru yazıçı H.İbrahimovun evindəki qonaqlıqda iştirak etmişəm. Burada bir söhbəti indi də xatırlayıram. Əli Vəliyevlə zarafat edirdilər. Birdən üzünü mənə tutub dedi:

-Əgər Qubadlıya xəbər yayılsa ki, Əli Qara oğlu Süleymana ot yoldurub, bunu hoydu–hoyduya salmayın.

Onun nəyə işarə etdiyini başa düşə bilmədim. Təəccübləndiyimi görüb əlavə etdi:

– Dünən Əli ilə Sisyana getmişdik. Elə yerlərə apardı ki, ayağım yerdə durmurdu. Hər dəfə sürüşəndə əl atıb topaldan tuturdum. Ağır adamam, topal davam gətirməyib qopub əlimdə qalırdı. Allah bilir nə qədər topal yoldum. Çox eşitmişdim ki, bəzi adamlar bir–birinə deyərdi ki, sənə ot yolduraram. Əli də mənə beləcə ot yoldurdu.

Yubiley vaxtı naxçıvanlıların hər iki yazıçıya olan dərin ehtiramlarının şahidi olmuşam. Onlar bu ehtiramı vaxtilə Naxçıvanda (Ə. Vəliyev «Şərq qapısı» qəzetinin redaktoru, S.Rəhimov isə Şərurda, Şahbuzda RPK–nin katibi) işlərkən qazanmışlar».

Mürsəl müəllimin dediklərindən:

-«İki ilə yaxın bir müddətdə işlədiyim Cəbrayıl rayonlararsı qəzeti xatırlamağa məni sövq edən budur ki, çalışdığım əməkdaşlarla bərabər bu qəzet mənim də təcrübəmi artırmağa, dünyagörüşümü genişləndirməyə, zonamızı daha yaxşı tanımağa kömək etmiş oldu. Hətta bir növ mənə tramplin rolu da oynadı. Belə ki, 1963–cü ilin mayında Qubadlı və Zəngilanda ayrıca istehsalat idarəsi yaradıldı. Laçını da əhatə etməklə Zəngilanda «Kənd həyatı» adlı yeni rayonlararası qəzet təşkil olundu. Məni həmin qəzetə redaktor təyin etdilər. Cəbrayıl rayonlararası qəzetin təşkilində topladığım təcrübə mənə çox böyük kömək etdi».

Mürsəl Eyvaz oğlu Qocayev 1978-ci ildən 1990-cı illərə kimi Azərbaycan Jurnalistlər Birliyi «Kənd həyatı» redaksiyası yanında ilk jurnalist təşkilatının katibi olmuşdur. İşlədiyi müddətdə rayonun yaradıcı gəncləri ilə müntəzəm məşğul olmuş, redaksiya kollektivi vasitəsilə onlara hər tərəfli kömək göstərmişdir. Təşkil olunmuş ədəbi birlik vasitəsilə həmin gənclərə lazımi yaradıcılıq istiqaməti vermişdir. Onlardan 15 nəfərin kitabları nəşr olunmuş, bəziləri isə Azərbaycan Yazıçılar birliyinə üzv qəbul olunmuşdur.

İşlədiyi dövrdə Qubadlı, Zəngilan, Laçın, Cəbrayıl rayonlarında təkcə oxucuların deyil, təmasda olduğu bütün sakinlərin, xüsusən əmək adamlarının etibar və etimadını qazanmışdır.

Mətbuatda uzun illər səmərəli fəaliyyətinə görə dəfələrlə Fəxri Fərman və diplomlarla təltif olunmuş, «Həsən bəy Zərdabi», «Ustad» və «Ali jurnalist» mükafatına layiq görülmüşdür.

Mürsəl Eyvaz oğlu Qocayev rayon işğal olunduqdan sonra Bakıda məskunlaşıb və «İki sahil», «525-ci qəzet», «Təzə həyat», «Proqnoz», «Kredo», «Demokratiya», «Pres fakt», «Yeni Azərbaycan», «Ədalət», «Vətən səsi», «Həyat», «Zəngəzur», «Azərbaycan müəllimi», qəzetlərində müntəzəm olaraq ədəbi-bədii, publistik məqalələr ilə çıxış etmişdir. Mürsəl Eyvaz oğlu Qocayev 2010-cu il iyulun 13-də Bakı şəhərində vəfat etmişdir.

-İşlədiyi müddət ərzincə özünü hər cəhətdən göstərən bir ziyalı kimi onu 1955-ci ildə RPK-nin ideoloji şöbəsinin müdiri vəzifəsinə irəli çəkilmiş, 1957-ci ildə isə rayon qəzetinə redaktor təyin etmişlər. Bütün bunlar adi bioqrafik göstəricilər deyil, düz

yarım əsrlik əmək yoludur ki, bununda düz 40 ili daim gərgin narahat mətbuata həsr olunmuşdur. (Ş.Əliyevanın yazısından)

Mürsəl müllimin və tələbə yoldaşları barədə belə deyib.

Şamaxıdan Baba Xəlilov, Sultanpaşa Vəliyev, Naxçıvandan Əli Məmmədov, Hüseyn Bayramov, Qazaxdan Təyyar Musayev, Sədi Əfəndiyev, Bakıdan Qabil İmamverdiyev, Buzovnadan Əlibala Əliyev, Bakıdan Cəmil Ağayev bir–birimizlə daha yaxın ünsiyyətdə idik».

Mürsəl müəllim xalq yazıçısı Süleyman Rəhimov barədə:

«Mən onunla ilk dəfə 1946–cı ilin yayında Qubadlı siyasi maarif kabinəsinin kitabxanasında tanış oldum. Onda mən APİ–nin II kursunu bitirib məzuniyyətə gəlmişdim. Kabinənin müdiri olan dayım Zülfü Əhmədov bizi bir–birimizlə tanış etdi. Sən demə o vaxtilə Qəziyən körpüsündən keçən zaman dəfələrlə gördüyüm çayda çimən oğlanlardan biri idi.

1993-cü ilin oktyabrın 26–da Moskva radiosunda ermənilərin Zəngilana təslim haqqında ultimatumu oxundu. Beləliklə, həm yeni tikilən, həm də qədim Xudafərin körpüsü Qubadlı, Zəngilan və Cəbrayıl rayonlarından olan böyük qaçqınlar köçünün bir hissəsinin düşmən əsirliyindən xilas olması üçün öz rolunu oynamış oldu»

Yazıçı publisit Asif Bağırovun xatirələrindən:

-«Mürsəl müəllim ailəsi ilə Bakıya pənah gətirmişdi, yataqxana həyatı yaşayırdı.Yeri düşdükcə mətbuatda maraqlı yazıları ilə çıxış edirdi.

Biz hələ rayonda ikən Mürsəl müəllimin Bakıda çox saylı dost-tanışının olduğunu eşitmişdik. Süleyman Rəhimov, Əli Vəliyev, Cəlal Bərgüşad, Qabil, Gəray Fəzli, tələbə dostu akademik Sədi İmanov və başqaları. Onların bəziləri dünyaların dəyişsələr də, yaşayanlar daha çox idi. Ancaq Mürsəl müəllim uzun illər əməl etdiyi xasiyyətinə xilaf çıxmadı, heç kimdən kömək ummayaraq sakit, həm də ağrılı köçkün həyatı yaşamaqla yaradıcılığını davam etdirirdi. Bəlkə də buna sakit həyat tərzi demək olardı, lakin 1996- cı ilin may ayının 28- i bu sakitliyi alt-üst etdi. Məzahir həkimin böyük qızı, Mürsəl müəllimin ilk nəvəsi Ülviyyə

qəflətən rəhmətə getdi. Həmin günü Ülviyyə bizə gələcək, böyük qızım Aytəkinlə Göy Məscidə gedəcəkdilər. Bu çox ağır itki idi. Qocayevlər ailəsi ilə bərabər bizim ailə üçün də. Ülviyyə böyük qızım Aytəkinlə Zəngilan şəhər 1 saylı orta məktəbinin rus bölməsində eyni sinifdə oxumuşdular. Zəngilandakı mehribançılıqlarını Bakıda da davam etdirirdilər. Aytəkinin onlara, Ülviyyənin də bizə get-gəli var idi. Mənim Məzahirlə Ülviyyənin kiçik dayısı Zülfüqarla dostluğum, Ülviyyənin anası Sürəyya həkimin bizə qohumluğu, səmimiyyəti və mehribançılığı bu iki rəfiqəni daha da yaxınlaşdırmışdı. Bu sarsıntıdan özümüzə gələ bilmirdik. Aytəkin də çox sınıxmışdı, hərdən gedib Sürəyya xanımın yanında qalırdı, o da, az da olsa bundan təsəlli tapırdı. Bu təsəlli də beş il davam etdi, Ülviyyənin yoxluğuna tab gətirməyən Sürəya xanım 18 avqust 2002- ci ildə gözlərini əbədi olaraq yumdu. Mürsəl müəllimlə əlli beş ildən yuxarı ömür-gün sürmüş Xavər xanım nəvəsinin və sevimli gəlininin vaxtsız ölümlərinə dözməyərək, için –için əriyə-əriyə 2002- ci ilin yanvar ayının 2- də həyatla vidalaşdı.

Ailənin sağ qalan üzvləri Mürsəl müəllim, Məzahir, Tahir və Gülşən xanım və digər yaxın qohumlar özlərini nə qədər toxtaq aparsalar da, onların nələr çəkdiklərini söyləməyə yəqin ki, ehtiyac yoxdur.

Baş vermiş itkilərin mərkəzi Mürsəl müəllimin üzərinə düşürdü. O, 14 iyun 2010-cu ildə dünyasın dəyişdi».

Mürsəl Qocayevin Xavər Yusifzadə ilə evliliyindən iki oğlu və bir qızı olmuşdur. Mürsəl müəllim vəfat edən zaman onun 6 nəvəsi vardı. Məzahir ali təhsilli həkim,Tahir ali təhsilli mühəndis, Gülşən xanım isə müəllimədir. Xavər Rəşid qızı Yusifzadə isə rayonun işğalına kimi 1 saylı Zəngilan şəhər orta məktəbində ədəbiyyat fənindən dərs demişdir.

Mürsəl müəllim mənim nəzərində necə qalıb.

Mürsəl müəllimi yaxından tanıyanlar və eyni zamanda onunla uzun illər işləyənlərin xatirələri yanında mənim bu yazım sönük və maraqsız görünə bilər. Onun haqqında yazılan xatirələr düşünürəm ki, daha maraqlı və oxunqalı olacaq. Bu səbbədən də mən

yazımı çox uzatmaq fikrində deyiləm. Sizləri Mürsəl müəllimin yaradıcılığı, onun haqqındakı xatirələr və onunla bağlı şəkillərlə baş-başa buraxıram.

**P.S. Zəngilan və Qubadlı rayonlarının birləşməsi və ayrılması barədə qısa məlumat.**

1929-cu ildə Azərbaycanda qəzalar ləğv olundu və Respublikada rayonlaşmaya keçildi. Qirmizı Kürdüstan dairəsi ləğv olunanda onun ərazisində olan 5 dairə əvəzinə 4 dairə -Zəngəlan, Kubadlı, Laçın və Kilvəcər dairələrinin saxlanılmasına qərar verildi.

Sonralar bu ərazidə 08 avqust 1930-cu ildə Zəngilan və Qubadlı dairələrindən ibarət yeni bir inzibati ərazi vahidi olan Zəngilan rayonu təşkil olundu. 1933-cü ildə isə Zəngilan rayonu iki müstəqil rayon olan Qubadlı və Zəngilana bölündü.

Azərbaycan MİK Zəngilan rayonu ərazisində yeni rayonun Qubadlının yaradılması məsələsini Zaqafqaziya SFSR MİK-si qarşısında qaldıraraq xüsusi məktub gördərir və onun təsdiq olunmasını xahiş edirdi. Səbəb kimi göstərilir ki, Pirçivan (Zəngilan rayonunun mərkəzi-Ə.S.) dəmiryolu qovşağında yerləşir. Rayon mərkəzini başqa yerə köçürtmək də məqsədə uyğun deyildir. Pirçivan mərkəz kimi saxlanılır. Lakin rayon mərkəzinin Qubadlının ucqar kəndlərindən uzaq olması əsas səbəb kimi göstərilir.

Azərbaycan SSR Zəngilan rayonunu iki müstəqil rayona bölünməsi barədə ZSFSR MİK RH-nin 24 aprel 1933-cü il tarixli qərarı. (Protokol N-81)

1.Azərbaycan SSR Zəngilan rayonu iki müstəqil rayona- Zəngilan və Qubadlı rayonlarına bölünməsi barədə 20 aprel 1933-cü il Qərarı ilə razılaşmaq.

2. Qubadlı rayonunu mərkəzi Qubadlı kəndi, Zəngilan rayonunun mərkəzi isə Pirçivan kəndi təsdiq olunsun və Zəngilan adlandırılsın.

3. Zəngilan rayonu bu kənd sovetliklərindn yaradılsın.

Ağalı, Bartaz, Həmzəli, Cahangirbəyli, Canbar, Zəngilan, Ördəkli, Pirçivan, Rəbənd, Sobu, Keçikli, Məmmədbəyli, Muğanlı, Qıraq-Müşlan, Şayıflı, Xanlıq və Mincivandan.

4. Qubadlı rayonu isə Aladin, Başarat, Qəzyan, Dondarlı, İskəndərbəyli, Qubadlı, Qara-ağac, Qaraqışlı, Məmmədli, Mollu, Molla-Bürhan, Muradxanlı, Novlu, Teymur – Müskənli, Xələc, Xocahan, Xozik, Fərcan, Çərəli kəndlərindən.

SSRİ MİK RH katibi. Yenukidze.s 31.

Zaqafqaziya MİK RH-nin 26 aprel 1933-cü il tarixli 65 saylı protokolu.

Sədr. Maxaradze F. katib. Todriya S.

Zaqafqaziya MİK üzvləri.

Bünyadzadə, Vaçek, Doqodov, Kasyan, Şeverdov və.s.

1.Azərbaycan MİK RH-nin Zəngilanı iki yerə bölünməsi barədəki Qərarı bəyənilsin.

2.SSRİ MİK RH-dən qərarın təsdiqi xahiş olunsun.s.104. sədr. katib.

## Azərbaycan SSR AS RH-nin Fərmanı
### Qubadlı rayonunun yaradılmaı barədə

3. Mərkəzi şəhər tipli qəsəbə Qubadlı olmaqla Qubadlı rayonu yaradılsın.

Zəngilan rayonundan Hal, Dəmirçilər, Qaracallı, Məmmədli, Molla-Bürhan, Muradxanlı, Novlu, Teymur –Müskənli, Xanlıq, Xocahan, Çardaxlı, Yuxarı-Mollu, və Qubadlı qəsəbə soveti Qubadlıya verilsin.

Sədr M. İskəndərov, katib Z. Şükürova.1. Azərbaycan SSR AS RH-nin 30.06.1963-cü il tarixli 17 saylı protokolu**. Əli Sobulu. Rusiya işğalları və Zəngilan. Səh 198-191.**

Zəngilan ilə Qubadlı ərazisi 1930-1933-cü illərdə vahid bir rayon halında idilər. 1933-cü ildə Qubadlı müstəqil bir rayon kimi təşkil olunanda kəndlər bölüşdürüldü. O vaxt ki ilə indiki bölgü fərqli olduğundan biz hər iki rayona aid olan kəndləri təqdim edirik. 1963-ci ildə bu rayonlar yenidən birləşdirildi və üç ay sonra yenidən ayrıldılar. 1963-cü ildə isə bəzi sovetliklər Zəngilandan alınıb Qubadlıya, Qubadlıdan isə bəzi sovetliklər alınıb Zəngi-

lana verildi. Bu tarixdən etibarən olan bölgü hal-hazırda olan inzibati ərazi bölgüsünə uyğundur. Əli Sobulu. Rusiya işğaları və Zəngilan. Səh 233

**Mürsəl Qocayevin ailəsi barədə** qısa məlumat

**-həyat yoldaşı** Yusifzadə Xavər Rəşid qızı ali təhsilli ədəbiyat müəllimi. Onların iki oğlu bir qızı var

**-oğlu Qocayev Məzahir Mürsəl oğlu**

Qocayev Məzahir Mürsəl oğlu 1950-ci ildə Qubadlı qəsəbəsində anadan olub. Ali təhsilli həkimdir.

**-yoldaşı** Məmmədova Sürəyya İsa qızı. 1949-cu ildə anadan olub. Ali təhsilli həkimdir. 18 avqust 2002-ci ildə dünyasını dəyişib. Onların üç qızı var.

-qızları Ülviyyə (19 yaşında, 28 may 1996-cı ildə dünyasını dəyişib), İntizar və Nərgiz

**-oğlu Qocayev Tahir Mürsəl oğlu**

Qocayev Tahir Mürsəl oğlu 1953 ci ildə Qubadlı qəsəbəsində anadan olub. Ali təhsili mühəndis idi. İşğaldan sonra Bakı şəhərində dünyasını dəyişib. Həyat yoldaşı Quliyeva Tamara Müslüm qızı. Onların Şəhla adlıqızı, Ceyhun adlı oğlu va.

**-qızı Qocayeva Gülşən Mürsəl qızı**

Qocayeva Gülşən Mürsəl qızı 1955- ci ildə Qubadlı qəsəbəsində anadan olub. Ali təhsilli müəllimədir.

**-yoldaşı Azadov Eldar Hüseyxan oğlu,** iqtisad elmləri namizədidir. Onların Mehman adlı oğlu, Mətanət adlı qızı var.

**Mürsəl Qocayevin 35 il redaktoru olduğu Kənd həyatı qəzeti**


БҮТҮН ӨЛКӘЛӘРИН ПРОЛЕТАРЛАРЫ БИРЛӘШИН!

КӘНД ҺӘЈАТЫ

АЗӘРБАЈҸАН КОММУНИСТ ПАРТИЈАСЫ ЗӘНКИЛАН РАЈОН КОМИТӘСИ ВӘ ЗӘНКИЛАН РАЈОН ХАЛГ ДЕПУТАТЛАРЫ СОВЕТИНИН ОРГАНЫ

«КЕНД ХАЯТЫ» ОРГАН ЗАНГЕЛАНСКОГО РАЙОННОГО КОМИТЕТА КП АЗЕРБАЙДЖАНА И РАЙОННОГО СОВЕТА НАРОДНЫХ ДЕПУТАТОВ

№49 (5639)

ҸҮМӘ АХШАМЫ

27 декабр 1990-чы ил.

# II FƏSİL

## Mürsəl Qocayevin bacı və qardaşları barədə qısa məlumat

### Qocayev Əli Eyvaz oğlu



Qocayev Əli Eyvaz oğlu 1927-ci ildə rayonun Saralı Xəştab kəndində anadan olub. Əvvəlcə özü 1954-cü ildə Pirçivan kəndinə gəlmiş, sonralar isə ailəsini də gətirmişdir. Azərbaycan Politexnik Texnikumunu bitirən Əli dayı uzun müddət Suvarma Sistemləri idarəsində mənim atamla bərabər işləyib. Sonralar isə 13 saylı tikinti idarəsində tikinti mühəndisi kimi çalışıb. Işini sevən, bacarıqlı biri olub. Onlar beş qardaş, iki bacı olublar. Qocayevlər kimi tanınan ailənin böyük oğlu Mürsəl Qocayevi rayonumuzda eləcə də respublikada tanımayan yoxdu. Qardaşlardan Mürsəl, Səməd və Vaqif müəllim, Vəli isə sürücü idi. Bacıları Telli xanım isə bir el ağbirçəyi idi.

Əli dayı öz hazırcavablığı ilə seçilirdi. Işğal ərəfəsində 13 saylı tikinti təmir idarəısində işləyirdi. Əli dayı rayonun kəndlərində çox sayda mağaza tikmişdir.

Qocayev Əli Eyvaz oğlu rayonun işğalıdan sonra 2010–cu ildə Bakı şəhərində vəfat etmişdir.

## Kərimova Bənövşə Cəmil qızı



Yoldaşı Kərimova Bənövşə Cəmil qızı 1930- cu ildə Sarallı Xəştab kəndində anadan olub. Onun atası, əmiləri dövrünün təhsilli adamları olublar. Sovet hakimiyyəti gələndə atasına dindən əl çəkib məktəbdə dərs deməklə kifayətlənmək təklif olunsa da o bunu qəbul etməyib. Nəticədə o həbs olunmuş və sürgündə vəfat etmşdir. Əmisi Molla Kərim Əfəndi İraqda Nəcəf şəhərində dini təhsil alıb. Bənövşə müəlliməgil 5 qardaş, iki bacı olublar. İsmayıl adlı qardaş müharibədən qayıtmayıb. Digər qardaşları Kərim və Yusif isə rayonumuzun tanınan adamları olublar. Bacısı Güllər xanım isə Bakıda müəllimə işləyirdi. O, Bakıda mənə dərs deyib.

Ali təhsilli biologiya müəllimi olan Bənövşə xanım şəhər1 saylı orta məktəbdə dərs deyirdi.

Kərimova Bənövşə Cəmil qızı 2002-ci ilin martında Bakı şəhərində vəfat etmişdir. Onlar 1953-cü ildə ailə qurmuşlar. Bir qızları, üç oğlanları var.

**-qızları Qocayeva Zöhrə Əli** qızı 17 may 1954- cü ildə Saralı Xəştab kəndində anadan olub. 1960-1970-ci illərdə şəhər orta məktəbində oxuyub. Sonra 1976-cı ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu bitirmişdir. İşğal ərəfəsində evli idi Sumqayıt şəhərində yaşayırdı. Yoldaşı Muradov Fazil əslən Qubadlı rayonundandır. Onların Zəfər adlı oğlu (mühəndisdir), Gülarə (həkimdir) adlı qızları və eyni zamanda Səid, Nəriman, Murad, Aytac adlı nəvələri də var. .

**-oğlu Qocayev Azad Əli** oğlu 12 dekabr 1956- cı ildə Saralı Xəştab kəndində anadan olub. 1961-1972-ci illərdə şəhər orta məktəbində oxuyub. Sonra 1977-ci ildə Azərbaycan Dövlət Po-

litexnik İnstitutunun bitirmiş, təyinatla Başqırdıstan Respublikasına göndərilmişdir. Hal- hazırda Ufa şəhərində yaşayır. Həyat yoldaşı tatar qızı Gülmirdir. Onların Cəmil, Səidə adlı iki övladı və Timur adlı nəvəsi var.

**-oğlu Qocayev Azər Əli** oğlu 27 mart 1958- ci ildə Saralı Xəştab kəndində doğulub. 1963-1974-cü illərdə şəhər orta məktəbində oxuyub. Sonra Dnepropetrovsk şəhərindəki Politexnik İnstitutunun Metallurgiya İnstitutunu bitirib. İşğal zamanı rayon Konserv zavodunun direktoru idi. Həyat yoldaşı Cəfərova Aidə Alı qızı ali təhsilli həkimdir. Onların Gülnar və Aybəniz adlı iki qızı və Səbinə adlı bir nəvəsi var..

**-oğlu Qocayev Ayaz Əli** oğlu 18 fevral 1967-ci ildə Zəngilan şəhərində doğulub. 1973-1984-cü illərdə şəhər orta məktəbində oxuyub. İşğal ərəfəsində evli idi və rayon konserv zavodunda işləyirdi. Həyat yoldaşı Məmmədova Güllər Xankişi qızı Zəngilanlıdır. Onların Rövşən adlı bir oğlu, Zeynəb adlı bir qızı və eyni zamanda Əli, Fatimə adlı isə iki nəvəsi var. Ayaz Qocayev hal-hazırda Bakı metropolitenində işləyir.

## -bacısı Qocayeva Telli Eyvaz qızı

Qocayeva Telli Eyvaz qızı 1922-ci ildə rayonun Saralı Xəştab kəndində anadan olub. Həyat yoldaşı Qocayev Allahverdi Abbas oğludu. Onların Telman adlı bir oğlu, Güllü adlı bir qızı var. Allahverdi Qocayev işğaldan əvvəl Zəngilan şəhərində, Telli Qocayeva isə rayonun işğalından sonra 2015-ci ildə Bakı şəhərində vəfat etmişdir.

-**oğlu Qocayev Telman Allahverdi oğl**u 1941- ci ildə anadan olub. Uzun illər rayonda rəhbər işçilərin sürücüsü işləmişdir.

-yoldaşı İsmayılova Adilə Həsən qızıdı. Onların Natiq, Namiq və Nadir adlı üç oğlu var

-**qızı Qocayeva Güllü Allahverdi qızı** 1954-cü ildə Ermənistan SSR -nin Qafan şəhərində anadan olub. Yoldaşı Həsənov Hidayət Mirzəmməd oğludur. Hidayət uzun illər Zəngilan rayon XDS İK-də məsul vəzifədə işləyib. Son illərdə isə kənd Zəngilan

ərazisi üzrə İcra nümayəndəsidi. Onların bir oğlu var.

-oğlu Həsənov Elvin Hidayət oğlu

**Qocayev Vəli Eyvaz oğlu**

Qocayev Vəli Eyvaz oğlu 1934-cü ildə Qubadlı *(indi o kənd Zəngilanındır)* rayonun Saralı Xəştab kəndində anadan olub. Sürücülük kursunu bitirən Vəli Qocayev bir müddət Zəngilan rayon Maliyyə şöbəsində işləmişdir. Sonralar isə düz rayonun işğalına kimi doğulduğu kəndin daxil olduğu kolxozda sürücü kimi işinə davam etmişdir. Onların Mahir adlı oğlu var.

-oğlu Qocayev Mahir Vəli oğlu. Mahirin Rəkidə və Smavi adlı iki qızı var.

**Qocayeva Suratel Eyvaz qızı**

Qocayeva Suratel Eyvaz qızı 1935-ci ildə Qubadlı rayonunun (*indi o kənd Zəngilanınd*ır*)* Saralı Xəştab kəndində anadan olub. Qubadlı rayonunun Gödəkli kəndində yaşayır. Onun Cəmilə adlı qızı, Fikrət və Arif adlı iki oğlu var.

-qızı Cəmilə- onun da Hüseyn adlı oğlu, Lamiyyə adlı qızı var.

-oğlu Fikrət. Onun Şahin, adlı oğlu, Lalə adlı qızı var

-oğlu Arif. Onun isə Elməddin adlı bir oğlu var.

**Qocayev Səməd Eyvaz oğlu**

Qocayev Səməd Eyvaz oğlu 1939-cu ildə Qubadlı rayonunun *(indi o kənd Zəngilanındır)* Saralı Xəştab kəndində anadan olub. İlk təhsilini kənd məktəbində almışdır. Sonra isə pedaqoju kursu bitirmişdir. Sonralar rayon mərkəzinə köçən Səməd Qocayev Yarışova Nigar Allahverdi qızı ilə ailə həyatı qurub. O, rayonun işğalına kimi 1 saylı şəhər orta məktəbində müəllim işləmişdir. Qocayev Səməd Eyvaz oğlu rayonun işğalından sonra Bakı şəhərində məskunlaşmışdır.

-yoldaşı Yarışova Nigar Allahverən qızıdır.

Onların Aydın (dünyasını dəyişib), Nurəddin adlı oğlu, Nüşabə və Mədinə adlı qızları var.

-oğlu Qocayev Nurəddin Səməd oğlu. Onun Nicat, İbrahim və Rəsul adlı üç oğlu var.

-qızı Nüşabənin Sevinc adlı bir qızı, Mədinənin isə Əli adlı bir oğlu var.

## Qocayev Vaqif Eyvaz oğlu

Qocayev Vaqif Eyvaz oğlu 1941-ci ildə Qubadlı rayonunun (*indi o kənd Zəngilanındır*) Saralı Xəştab kəndində anadan olub. Zəngilan qəsəbəsində açılmış pedaqoji kursu, sonralar isə qiyabi yolla Azərbaycan Dövlət Pedaqoji İnstitutunu bitirən Qocayev Vaqif Eyvaz oğlu rayonun işğalına kimi öz kəndlərində müəllimlik etmişdir.

-Həyat yoldaşı Həsənova Almas Talıb qızıdır. Onların Eyvaz adlı oğlu, Məhbubə və Zübeydə adlı iki qızı var.

-Eyvaz Vaqif oğlu. Onun Vaqif adlı oğlu, Mahinur adlı qızı var.

-Məhbubə Vaqif qızı. Onun Cəbrayıl və Mikayıl adlı iki oğlu var.

-Zübeydə Vaqif qızı. Onun Asiman adlı qızı, Qulu və Sübhan adlı iki oğlu var.

# II FƏSİL. XATİRƏLƏR

## Ədədiyaşar Mürsəl Qocayev

Yorulmaz mətbuat fədaisi Qubadlı və Zəngilan rayonlarında jurnalistikanın inkişafinda ölçüyəgəlməz xidmətləri olmuş, sadə və təmkinli bir insan Mürsəl Qocayev barədə xatirə yazmağı uzun illər qəlbimdə gəzdirmişəm. Bu arzunun gerçəkləşməsini bir sıra ölkələri gəzmiş, əsasən tarixi və mədəniyyət mərkəzlərini ziyarət etmiş, qiymətli materiallar toplamış, bəzilərini qələmə almış, **«Zəngilan Əlilləri», «Zəngəzurun Zəngilanlı Ziyalıları», «Rusiya İşğalları və Zəngilan», «Eşitdiklərim, Gördüklərim, Düşündüklərim» və «Mənim yaşadığım həyat»** kitablarının, həmçinin yüzlərlə elmi publisistik və tarixi yazıların müəllifi Hacı Əli Sobulu (Cümşüdlü Əli Seyfulla oğlu) mənə bildirəndə dərhal razılıq verdim. Az keçməmiş fikir məni götürdü, olduqca, cətin və məsuliyyətli, həm də şərəfli bir işin öhdəsindən layiqincə gələ biləcəyəmmi?

Lakin, bir neçə günlük götür-qoydan sonra Mürsəl müəllimi tanıdığım qırx ildən artıq bir dövrü xəyalımda canlandıraraq Ya Allah! deyib işə başladım.

….Zəngilan rayonunun mərkəzi Pirçivan kənd orta məktəbinin ibtidai siniflərində oxuyurdum. Yaxın qonşumuz və qohumumuz Böyük Vətən müharibəsi əlilı Həmzə Səfərov hərdən gecələr bizə gələrdi. O, təzəcə çap olunmuş iki səhifəlik «Stalinçi» qəzetinin bir nüsxəsini atama verərək:

-Baba, indicə çapdan çıxarmışıq, tanış olun, deyərdi.

Onunla bərabər Fərəməz İsmayılov (keçəl Fərəməz), Malatkeşinli Həsən Əliyev (qazax Həsən) də mürəttib işləyirdilər. Qəzetin redaktoru Böyük Vətən müharibəsi iştirakçısı və əlili, Şöhrət **ordenli** Vəli Mustafa oğlu Mustafayev idi. İ.V.Stalinin ölümündən üç il sonra qəzetin adı dəyişdirilərək «Zəngilan **kommunisti**» oldu. Vəli Mustafayev yenə redaktor vəzifəsində qaldı. Sonralar o bir sıra rəhbər vəzifələrdə çalışdı, olduqca təmiz insan

idi, mayası halallıqla yoğrulmuşdu. Ən yaxşı xüsusiyyətlərindən biri isə sözü şax üzə deməsi idi. Zəngilan haqqında ilk təsəvvürlərim həmin qəzetlərlə bağlı idi.

Qəzetdə müntəzəm olaraq əsas xəbərlərlə yanaşı Nəriman Əliyevin satirik şerləri, çəkdiyi karikaturalar, Kamil Qurbanovun, Həsən Nağıyevin (əsasən idman xəbərləri), Əvəz Rzayevin (o zamanlar Ə.Rzayev məhkəmə katibi idi), İbiş İbişovun kiçik həcmli yazıları gedərdi.

Keçən əsrin 60- cı illərinin əvvəllərində SSRİ-də struktur dəyişiklikləri ilə əlaqədar rayon qəzetləri birləşdirilərək bir neçə rayonu əhatə etməklə müttəfiq respublikaların Mərkəzi komitələrinin və Nazirlər sovetlərinin zonalar arası orqanına çevrildi. Cəbrayıl rayon istehsalat idarəsində Zəngilan-Qubadlı və Cəbrayıl rayonlarını əhatə edən «Kolxozçu» qəzeti nəşr olunmağa başladı. Həmin dövrdə mərkəzi Zəngilan qəsəbəsi olmaqla Qubadlı rayonu Zəngilana birləşdirildi. Biz hərdən bir «Kolxozçu» qəzetini əldə edə bilirdik. Mürsəl müəllimi təxminən 1961-ci ildə çiynində fotoaparat Heydərli Soltanın evinin yanından ağzı yuxarı piyada çıxanda görmüşdüm. O zaman Mürsəl müəllim «Kolxozçu» qəzetində Zəngilan və Qubadlı rayonları üzrə muxbir işləyirdi. Onun dayısı Zülfü Əhmədov və özündən bir yaş kiçik qardaşı Əli Qocayev isə keçən əsrin 50-ci illərinin birinci yarısında Pirçivanda yaşayırdılar.

Uzun müddət Qubadlı və Zəngilanda partiya və sovet orqanlarında rəhbər vəzifələrdə çalışmış Zülfü Əhmədov haqqında bir neçə kəlimə demək istəyirəm. Fikrimcə Mürsəl müəllimin mükəmməl bir şəxsiyyət kimi formalaşmasında Zülfü dayının da müəyyən xidmətləri olmuşdur. Z.Əhmədov olduqca təəssübkeş və xeyirxah bir adam idi. Azərbaycanda çox sayda dost və tanışı vardı. İnstitutda oxuduğum vaxtlar İlyas Bağırov adlı bir müəllim bizə Orta əsrlər tarixindən mühazirə deyirdi.

Əvvəllər Mərkəzi Komitədə şöbə müdiri işləmişdi. Çox tələbkar və ciddi, dolu bədənli, qırmızı yanaq bir adam idi. Heç vaxt üzü gülməzdi.Yuxarı kurs tələbələrindən eşitmişdik ki, tapşırığa qulaq asmaz, rüşvət götürməzin biridir. Hamı ondan çəkinərdi. Biz qışda imtahan verməli idik. Açığı mən yaxşı oxusam da, narahat

idim. Yay semestri idi. Qapı döyüldü Zülfü dayi idi. İlyas müəllim onu görən kimi yüyürərək qucaqlayıb bağrına basdı. İki-üç dəqiqə foyedə söhbət edəndən sonra içəri qayıdıb Zülfü dayı haqqında:

-Bu kişi əslən Qubadlıdandır, indi Zəngilanda işləyir, iyirmi beş ildən çoxdur ki, dostuq, qardaşıq. Adı və familiyası Zülfü Əhmədov olsa da, Şor Çörəyov deyərdim. İlyas müəllim bu adın yaranma tarixini danışdı.

Mən artıq qış semestrinə arxayın gəlmişdim. Bəd ayaqda Şor Çörəyevin qohumu olduğumu deyəcəkdim. Bilet çəkdim təzəcə danışmağa başlamışdım ki İlyas müəllim qiymət kitabçama yaxşı yazaraq:

-Ayə biz əmioğlu imişik ki, dedi və onun sifətində təbəssüm göründü.

Zülfü dayının xeyirxahlığından daha bir misal:

-Zəngilan şəhərində 6 qızı və bir oğlu olan bir kişinin Bakı şəhərində yaşayan yeganə oğlunu dolaşdırmışdılar. Bir nəfər onlardan oğlunu qurtarmaq adı ilə 8 min manat pul almış və onu xərcləmişdi. Zuğulbaya sanatoriyaya putyovka alan Zülfü dayı bu işi təxirə salıb kişinin yeganə oğlunu türmədən buraxdırmışdı. Bu hadisəni mənə türmədən buraxılan adamın atası danışmışdı. Mürsəl müəllim belə bir kişinin bacısı oğludu və şəcərənin ən yaxşı xüsusiyyətlərini qorumaqla yanaşı həm də davam etdirirdi. Mürsəl müəllimin Zəngilana birdəfəlik bağlılığı 1963-cü ilin may ayından başladı. Azərbaycan KP MK və Nazirlər Sovetinin rayonlararası orqanı «Kənd həyatı» qəzeti Zəngilan rayon İstehsalat idarəsinin nəzdində çıxmaqla, Laçın, Qubadlı və Zəngilan rayonlarını əhatə etməyə başladı. Əvvəllər Qubadlı rayonunda müəllim, dərs hissə müdiri, «Avanqard» qəzetinin redaktoru, Qubadlı rayon partiya komitəsinin təbliğat və təşviqat şöbəsinin müdiri, nəhayət «Kolxozçü» qəzetində Zəngilan və Qubadlı rayonları üzrə müxbir işləmiş, idarəetmə və mətbuat sahəsində kifayət qədər təcrübə toplamış Mürsəl Qocayev indi daha məsuliyyətli əhatə dairəsi geniş olan bir qəzetə, «Kənd həyatı»na redaktor təyin olunmuşdu.

Onun ailə tərkibi ali məktəbin dil-ədəbiyyat fakültəsində oxuyarkən sevib seçdiyi və 1948-ci ildə evləndiyi tələbə yoldaşı

Xavər xanımdan, uşaqları iki oğlu, Məzahir, Tahir və qızları Gülşəndən ibarət idi, hər üçü məktəbdə oxuyurdu. Xavər xanım əslən Şuşalıydı. Atası Rəşid Yusifzadə dövrünün maarifpərvər ziyalılarından olmaqla 1950-ci ildən əvvəl nəşr edilmiş «Rusca-azərbaycanca» lüğətin həmmüəlliflərindən biri idi. Xavər xanım əvvəldən axıradək Zəngilan şəhərindəki 1 saylı orta məktəbdə ixtisası üzrə dərs dedi, kübarlığı, xanım-xatınlığı sayəsində müəllim və şagirdr kollektivinin dərin rəğbətini qazandı. Bu məktəbdə 1954-cü ildən başlayaraq əvvəl ibtidai sinif müəlliməsi, sonralar biologiya müəllimi işləyən Mürsəl müəllimin qardaşı Əlinin yoldaşı Bənövşə xanım, Mürsəl müəllimin qardaşı Səməd müəllim də eyni hörmətlə rayonun işğalınadək gənc nəslin təlim-tərbiyəsi ilə məşğul oldular. İstər savad, istərsə də davranış barədə onlardan nümunə götürməli çox şeylər var.

«Kənd həyatı» qəzeti üçün böyük bir bina ayrıldı. Uzun müddət zəngilanlılara və rayona gələn qonaqlara iaşə xidməti göstərmiş K.Marks xiyabanı ilə İ.Sayılov küçəsinin kəsişdiyi məşhur Lenin bağı ilə üz-üzə olan böyük bir yeməkxana redaksiyaya çevrildi.

Xatirimdə qalan odur ki, «Kənd həyatı» qəzeti həftədə üç dəfə çıxmaqla dörd səhifədən ibarət idi. Əvvəllər bir sıra məsul vəzifələrdə o cümlədən Qubadlıdakı «Avanqard» qəzetində redaktor müavini işləımiş ixtisasca jurnalist Nəriman Bəxtiyarov «Kənd həyatı»na redaktor müavini, Zəngilan rayon Komsomol komitəsində şöbə müdiri işləmiş Ərşad Əzimzadə (ixtisasca jurnalis idi**),** «Stalinçi» «Zəngilan kommunisti» qəzetlərində mütamadi yazıları dərc olunan İbiş İbişov, rayon Komsomol Komitəsində bölmə müdiri, məhkəmədə katib vəzifələrində işləmiş Əvəz Rzayev, redaksiyada müxtəlif vəzifələri tutdular. Əvvəllər qəzet üçün foto şəkilləri Mürsəl müəllim özü çəkərdi. Redaksiyaya xidməti maşın və bir sıra yeni ştatlar verilmişdi. Mürsəl müəllim foto müxbirliyə orta təhsilli Şahmar Bayramovu götürdü. Şahmar qəddi qamətli, gülərüz, yaxşı futbolçu, gözəl səsi olan bir gənc idi. Əsgərxan Azadov da burada bir müddət işlədi. İxtisasca jurnalist Ənvər Məmmədyarovun da rayonda ilk iş yeri «Kənd həyatı» qəzeti oldu.

Müxtəlif illərdə qəzetdə işə götürülən, xüsusi istedadları olan gənclər çoxluq təşkil edirdilər. Salam Cavadlı, Zakif Əliyev, Şükufə Əliyeva, Roza Dünyamalıyeva, Əli Quliyev, Əli Məmmədyarov, Sabir Kərimov, Adif Ağayev, Mailə Bayramova da belələrindən idilər. Ali təhsilli dil-ədəbiyyat müəllimləri Allahverdi Həsənov və Şükür Hüseynov da bir müddət «Kənd həyatı» nda əməkdaşlıq etmişdilər. Zəngilanın barmaqla sayılan memarları Yusif Məmmədov və Dilşad Həsənova da uzun müddət olmasa da «Kənd həyatı» nın əmək haqqı cədvəlinə qol çəkənlər sırasında idilər. Əvəz Rzayev, Şahmar Bayramov, Şükufə Əliyeva, Adif Ağayev qəzetdə işləyə-işləyə qiyabi yolla ADU-nun jurnalistika fakültəsinin qiyabi şöbəsinə qəbul olmuş, oranı müvəffəqiyyətlə bitirmişdilər. S.Cavadlı qiyabi yolla Naxçıvan Dövlət Pedaqoji İnstitutunu, eyni zamanda ikiillik jurnalistika məktəbini, həmçinin Zakif Əliyev, Mailə Bayramova da iki illik jurnalistika İnstitutunu bitirmişdi. Rayon qəzetinin ilk redaktoru, Bakı fəhləsi Əhməd Bədəlzadə də tez-tez Mürsəl müəllimin yanına gələrdi.

«Kənd həyatı» qəzetinin nəzdində yerli radio verilişləri redaksiyası yaranmışdı. İlk vaxtlar Aydın Cəfərov, Nüsrət Müstafayev sonralar işğal günündək Həsənalı Bayramov burada təşkilatçı muxbir və diktor vəzifəsində işlədilər. Mürsəl müəllimin təşkilatçılığı və qayğıkeşliyi sayəsində «Kənd həyatı» bir növ gələcək üçün jurnalistika kadrları hazırlayan bir məktəbə çevrilmişdi.

Bu dövrlərdə qəzetin kadr sahəsində də itkiləri olmuşdu. Nəriman Bəxtiyarov qəflətən dünyasın dəyişmişdi. Onun yerinə işləyən Şükür Şükürov da 5 il sonra haqq dünyasına qovuşmuşdu. Hər ikisi ürək xəstəliyindən qəflətən, həm də nəsihətsiz, vəsiyyətisiz, özü də işləyə-işləyə. Hər ikisi zəngilanlıların dərin hörmətini qazanmış şəxslər idilər. Bu ağır itkilər hamıdan çox Mürsəl müəllimə təsir etmişdi, uzun müddət bir kollektivdə çalışıb, xoş və ağrılı günlər keçirmiş, duz çörək kəsdiyin adamları itirmək olduqca ağır idi. Hər ikisi qəzetin vuran əlləri, nüfuzlu xadimləri idi. «Kənd həyatı» ilk nömrəsindən oxucuların rəğbətini qazanmışdı, müxtəlif zövqlü insanlar bu qəzeti sevə -sevə oxuyurdular. Qəzetdə bir düzlük, halallıq vardı. Redaksiyanın əməkdaşlarından heç kəs qərəzli materiallar yazmağa cürət etməzdi. Əslin-

də əməkdaşlar arasında beləları yox idi. Digər tərəfdən Mürsəl müəllim əqidəsinə uyğun olaraq belə yazıları dərc etməzdi, özü təmiz idi, kollektivinə də bu müsbət xüsusiyyətləri aşılaya bilmişdi. O zamanlar qəzetdə rəsmi xəbərlərlə yanaşı onun axırıncı səhifəsində «İstirahət guşəsi» adlı rubrikada əməkdaşlarla yanaşı bəzi oxucuların da maraqlı hekayələri, şeirləri dərc olunardı

O vaxtlar oxuduğumuz istehsalat təlimi verən Zəngilan qəsəbə 11 illik orta məktəbinə əvvəllər uzun müddət partiya və sovet orqanlarında çalışmış Ziyad Təhməzov rəhbərlik edirdi. Məktəbin profilinə uyğun olaraq beş hektarlıq pambıq sahəsi vardı, yuxarı sinif şagirdləri çiyid səpinində, becərmədə, nəhayət yığımda fəal iştirak edirdilər. Hər bir şagirdin sinif üzrə öz adına sahəsi vardı. Şagird istehsalat briqadasına Rəşid Məmmədov başçılıq edirdi. Rayon Komsomol Komitəsinin katibləri Hürü Mehrəliyeva və Ərşad Əzimzadə dəfələrlə həmin sahədə olmuşdular. Məktəbin güclü bədii özfəaliyyət kollektivi tez-tez kiçik klubda konsertlər verirdi. Bir neçə şagirdi yenicə Zəngilan rayon yeddillik uşaq musiqi məktəbində tar müəllimi kimi fəaliyyətə başlamış Məcnun Kərimovun (sonralar Məcnun Kərimov sənətşünaslıq dotoru, professor və xalq artisti fəxri adlarına layq görüldü) yaratdığı xalq çalğı alətləri ansamblının üzvləri oldular. Məleykə Azadova, Şükufə Əliyeva, Xudaverdi Sadıqov öz yatımlı səsləri, Daşdəmir Kazımov (tar), Rəşid Heydərli (tar), Məzahir Qocayev (tar), Elman Niftəliyev (tar), İzzət Bağırov (kamança), Asif Bağırov (akkordion), Xürrəm Həsənov (nağara) musiqi alətlərində mahir ifalarına görə həmişə alqışlarla qarşılanırdılar. Zəngilan rayon Komsomol Komitəsi tərəfindən ictimai işlərdə fəal iştirakına görə Fəxri Fərmanla təltif olunanlar arasında mən də var idim. Məktəbin önündə keçirilən təntənəli yığıncaqda onu bizə komsomol komitəsinin şöbə müdiri Ərşad Əzimzadə təqdim etdi.

«Kənd həyatı» qəzeti bərədə durub ov gözləyən ovçuya bənzəyirdi. Rayon üçün əhəmiyyətli olan kiçik bir hadisə də onun hədəfindən yayınmazdı. Bizim verdiyimiz konsert və tamaşalar qəzetdə dərhal öz əksini tapardı. Belə yazıları adətən foto muxbir Şahmar Bayramov qələmə alardı. Bu səbəbdən kiçik klubda tamaşaçılar arasında Şahmar Bayramovu görəndə keyfimiz 101- i vurardı.

Bizimlə musiqi məktəbindəki ansamblda iştirak edən Məzahir Qocayevlə də o vaxtdan tanış idik. «Kənd həyatı» qəzeti bizi tanıtdırır, məşhurlaşdırırdı. Doğrusu, mən o dövrü minətdarlıq hissi ilə xatırlayıram. Elə başa düşürəm ki, qəzetin əsas yükü Mürsəl Qocayevin, Nəriman Bəxtiyarovun və komsomol katibliyindən gəlmiş Ərşad Əzimzadənin üzərinə düşürdü. Bu sözümlə digər əməkdaşların üzərinə kölgə salmaq hissindən uzağam. Həqiqətən,qəzet oxucuların sevimli bir orqanı idi.

Nəriman Bəxtiyarovun felyetonları böyük rezonansa səbəb olurdu. Onun felyotonlarından biri barədə geniş çöhbət açmaq istəyirəm. «Prokurorun kələyi**,** Zülfüqarın ələyi»**.** Zülfüqar Pirçivan dəmir yolu Vağzalındakı Qarışıq mallar mağazasının müdiri və satıcısı idi. Digər adı çəkilən isə Zəngilan rayon prokuroru Ataxan Mürsəlov idi. Birincisi, dövlət ittihamçısı haqqında tənqidi yazı yazmaq həm cəsarət, həm də yüksək peşəkarlıq tələb edirdi. İkincisi, həmin felyetonu qəzetdə dərc etmək isə redaktordan daha böyük hünər və risk tələb edirdi. Gələcəkdə qarşılaşacaqları təhlükə və təzyiqlərə məhəl qoymayan Mürsəl Qocayev tənqidi yazını dərc etdirdi. Bu yazıdan sonra qəzetlə bərabər hər iki jurnalistin adı göylərə qaldırıldı. Artıq hər bir yüksək vəzifəli məmur öz işində ehtiyatlı olmağa başladı. Bir sıra idarə-müəssisə rəhbərləri, kolxoz sədrləri, mağaza müdirləri anladılar ki, prokurordan çəkinmirlərsə, onları tənqid eləmək bir o qədər də çətin deyil. O zamanlar qəzetin hökmü indikindən qat-qat üstün idi. Haqqqında tənqidi yazı dərs olunan şəxsləri yoxlamalar, bəzən partiya sıralaırndan xaric etmək, hətta həbs olunmaq təhlükəsi gözləyirdi. Lakin, Mürsəl müəllim bu yolla getməz, belə səpkili yazılara imkan daxilində yaşıl işıq yandırmazdı. Redaksiya əməkdaşlarına həmişə qərəzdən uzaq olmağı, yazdıqları materiallarda həqiqəti əks etdirməyi, gözlə görüb, qulaqla eşidib, ölçüb-biçib qələmə almağı tövsiə edərdi. Özü sadə idi, əməkdaşlara sadə davranmış, insanlarla səmimi münasibət yaratmağı, özünü başqalarından üstün tutmamağı tapşırar: **-Belə hərəkət etsəniz hörmətiniz daha çox olacaq. Sağ ikən özünüzə abidə ucaltmış olacaqsınız**- deyərdı.

Qəzetin nəzdində yerli radio verilişləri redaksiyası yaradıldıqdan sonra onun gücü xeyli artdı. Elə xəbərlər olurdu ki, qəzetin

növbəti nömrəsi çap edilməmişdən əvvəl isti-isti radioda səslənirdi. Radioda canlı müsahibəyə üstünlük verilirdi. Rayon prokuroru Adil Ağayevdən müsahibə götürülürdü, sonda o:- Diqqətinizə görə sağ olun ifadəsini işlətdi. Belə bir təşəkkürü mən ilk dəfə ondan öyrəndim. Sonralar yerli radio verilişləri redaksiyasının texniki imkanları daha da atrdı, ora maqnitofon da verildi. Artıq radio müxbir istənilən yerdə canlı müsahibə hazırlaya bilərdi. Aydın Cəfərov və Həsənalı Bayramovun dəvəti ilə mən və Xürrəm Həsənov (nağara) ayda iki dəfə yerli radio verilişlərində Azərbaycan oyun havalarından ibarət kiçik konsertlər verərdik. Şahsuvar əmi və atam bu konsertə fərəhlə qulaq asardılar. Bu şəraiti yaradan Mürsəl müəllim idi.

Zəngilan rayon Mədəniyyət şöbəsində avtoklub müdiri işləyirdim. Avtoklubun sürücüsü isə Seyid Həsən ağanın oğlu Hacıağa idi. Bəzi yerlərdə məni tanımayanlar kimliyimi soruşanda Hacıağa gülə-gülə:

-Bu mənim təzə pomoşnikimdir, deyərdi. Əlbəttə,mən bu zarafatdan həzz alardım. Bir gün mədəni yaylaq çadırının müdiri uşaqlıq dostim Arif Şıxəliyev ilə Oktyabr kolxozuna, fermaya getmişdik. Hacı ağa bizi Malatkeşin kəndinə aparsa da :

-Mənim işim –gücüm var, sizin kimi boş-bekar adam deyiləm, deyib aradan çıxdı, akkordionla nağara da yaddan çıxıb maşında qalmışdı.

Özümüzü ələ alıb fermaya girdik. Ali təhsilli zootexnik Salman Qəhrəmanovun bizə münasibəti və işi xoşumuza gəldi, müəyyən qeydlər götürüb geri qayıtdıq. Yolda mən Arifə bu qeydlər əsasında «Kənd həyatı» qəzetinə məqalə yazacağımı deyəndə, rəhmətlik Arif də:

«Asif, sən Allah, bizi cəncələ salma, Camal Sultanov yapışacaq yaxamızdan ki, mən sizi ora konsert verməyə göndərmişdim, yoxsa muxbirliyə?» deyə etirazını bildirdi. Mən Arifdən xəbərsiz onun imzasını da qoymaqla «Maldarların yanında» adlı yazımı «Kənd həyatı»nda dərc elətdirdim. Camal Sutanov bütün işçiləri kabinetinə yığıb özü məqaləni oxudu və Ariflə mənə:- **«Dədə, çox sağ olun»,** deyərək təşəkkür etdi.

Camal müəllimin kabinetindən çıxanda Hacıağa Ariflə məni kənara çəkərək, «Ə lotular, o günü mən sizin qarmon-qavalınızı maşında götürüb getməsəydim, adınız heç vaxt Mürsəl müəllimin qəzetində çəkilməyəcəkdi» dedi. Hacıağanın sözündə həqiqət vardı, əvvəllər bizim adımız qəzetdə məktəbli kimi getmişdi, lakin yazı müəllifi kimi bu bizim idi.

Beləliklə, bu yazı 1967- ci ildə qəzetlə, Mürsəl müəllimlə mənim aramda ilk ünsiyyət yaratdı. Bizim Mürsəl müəllimlə yaxınlığımız 1968- ci ildən başladı. Hər il may ayının 5-i «Mətbuat günü» ndə o məni həmin tədbirə çağırar və əlavə edərdi ki, qarmonunu da yaddan çıxartma.

Tədbir Dağüstü pavilyonda keçiriləndə qarmona görə sürücü Xəlili bizə göndərərdi. Rayon partiya Komitəsindən mütləq rəhbər işçilərdən biri tədbirdə iştirak edərdi. Yemək-içmək süfrəsi arxasında rəsmi açılış olardı. Məclisin belə formatda keçirilməsi rəsmiyyətçiliyi aradan götürər, əsil bayram ab-havası yaradardı. Redaksiya kollektivi:

-Mürəttibdən şöbə müdirinədək eyni hüquqda olar, vəzifələr kənara qoyular, səmimiyyət və mehribançılıq hökm sürərdi. Şahmar Bayramovun çox ustalıqla ifa etdiyi muğamlar, Adif Ağayevin «Bəstə nigarı», Salam Cavadlının Polad Bülbüloğlunun bir neçə şux bəstəsini oxuması məclisə daha da təravət gətirərdi.

Mən hər dəfə belə tədbirlərdə iştirak edəndə, Mürsəl müəllimdə, başqa rəhbər işçilərdə görmədiyim bir sadəliyin, yüksək alicənablığın, tabeçiliyindəki işçilərin qədrini bilməyin, onların hər bir şıltaqlığına dözüb, nazları ilə oynamağının şahidi olurdum. Tədbirlər müxtəlif yerlərdə, Mürsəl müəllimin kabinetində (köhmə yeməkxanada), Dağüstü pavilyonlarda (həm köhnə, həm də təzə), Mürsəl müəllimin yeni kabinetində keçirilərdi. Yadda qalan, unudulmaz xatirələrdən bir neçəsini oxuculara çatdırıram.

Dağüstü parkda köhnə kababxanada yemək-içmək vaxtı korrektor Bayram Quliyev masa arxasında ayaq üstə duraraq özünün rusca yazdığı «qəzəli» oxuyub, həm də, tərcümə edirdi. Nəriman Bəxtiyarov da onu cuşa gətirmək məqsədi ilə:

-«Şair mən Füzulidə, nə də Əliağa Vahiddə belə gözəl qəzəllərə rast gəlməmişəm» deyirdi.

Bayram da aranı kəsməyi yaddan çıxarmışdı, keyfi babat, üstəlik də Nəriman müəllimin tərifi ona qol-qanad vermişdi. Mürsəl müəllim ona diqqətlə qulaq asır, xətrinə dəymirdi və dəyməzdi də.....

Əsas səbəb Bayramın yetimçiliklə böyüməsi, yaşının əlliyə yaxınlaşmasına baxmayaraq ailə həyatı qurmaması idi. Qəzəllər bir ümumi dəftərdə idi, çətin qurtarardı. Çıxış yolunu Nəriman müəllim tapdı. O, Bayrama:

-Şair süfrədə hər şey var, üstəlik sizin ruhu oxşayan qəzəlləriniz adama iştah gətirir, hayıf ki, qatıq yoxdur, bəlkə Xəlillə gedib sizdən bir az qatıq gətirəsiniz.? Bu sözü eşidən Bayram :

-Xəlil getdik, tez ol, dedi.

Başqa bir ildə Dağüstü parkda yeni inşa edilmiş Pavilyonda «**Mətbuat günü**» həmişəkindən fərqli olaraq günortadan keçirilməyə başladı və axşama qədər davam etməklə iki hissədən ibarət oldu. Kollektiv Mürsəl müəllimin təklifini nəzərə alıb, bir-iki saat parkda gəzməyə, xatirə şəkli çəkdirməyə razılıq verdi. Süfrədən duranda mürəttib Fərəməz İsmayılov ancaq özü içdiyi şirin çaxırın butulkasının ağzına salfetka tıxayaraq parisin şalvarının cibinə qoymuşdu, şəkil çəkdirərkən butulkanın ağzı açılmış, çaxırın hamısı onun ağ rəngli parisun şalvarına hopmuşdu. Xatirə şəkillərini Zakif Əliyev çəkirdi. Onun uzun müddət peşəkarlıqla çəkdiyi şəkillər Zəngilanın görünən və heç zaman xatirələrdən silinməyən mənzərəsi və qiymətli tarixidir. Şəkilərdən birini də Mürsəl müəllim özü çəkəndə mürəttib Həmzə Səfərov Mürsəl müəllimdən arxa tərəfdə əyilərək guya ki, şəkili özü çəkir formasını aldı. Bunu hiss edən Mürsəl müəllim arxaya dönmədən:

-Həmzə, imkan ver mən çəkim, sonra sən nə çəkərsən, özün bilərsən-dedi. Fasilədən sonra yenidən pavilyonun ikinci mərtəbəsində süfrə arxasına keçdik. Mənim qarmonda ifa etdiyim oyun havasını hamıdan əvvəl əllərini qaldıraraq Həmzə oynamağa başladı, elə bil uçmaq istəyirdi. Az keçməmiş müvazinətini saxlaya bilməyib pavilyonun dəmir qapısının çərçivəsi üstünə yıxıldı, başı bir neçə yerdən yaralandı, sifətini qan bürüdü. Məclisdə bir şaşqınılıq yarandı. Mürsəl müəllim özü də ayağa qalxaraq Həmzənin qoluna girdi, ona kömək edib Xəlilin maşınında xəstəxanaya yola

saldı. Bax, Mürsəl müəllim belə bir rəhbər idi. Yeri gələndə özünü görməməzliyə, eşitməzliyə vuran lazımı anlarda işçiyə kömək edən, ayağa qaldıran insan idi. Belə bir şəxsiyyətin yanında işləyənlər xöşbəxt adamlar idilər. Mən də o xöşbəxtlər sırasında olmaq istəyirdim. Bir gün redaksiyaya gedib ona öz fikrimi bildirdim. O zaman redaksiya köhnə yeməkxananın binasında yerləşirdi. O, mənə diqqətlə qulaq asandan sonra telefonla məsul katib Şahmar Bayramovu çağırdı, məsələni ona bildirib mənə iki podşivka qəzet verib onları evdə oxumağı və Zəngilan şəhər Mədəniyyət evinin konsertlərindən biri barədə resenziya yazmağı tapşırdı.

O zaman Mürsəl müəllimin işini yaxşı bilən bir redaktor olması ilə yanaşı mənə qarşı müsbət yanaşmasını və xeyirxahlığını gördüm. O məni çətinə sürmədi, bələd olduğum və neçə illər çalışdığım bir sahədən yazmağı məsləhət gördü. Qəzetləri həvəslə nəzədən kerçirib məqaləni hazırladım və «Kənd həyatı»nda dərc olundu. Az keçməmiş yaxın qonşumuz rəhmətlik Məmmədalı İmaməliyevin rəhmətlik Nəriman Bəxtiyarova xahişi nəticəsində rəhmətlik Adif Ağayev redaksiyada ədəbi işçi vəzifəsini tutdu. İstər Məmmədalı dayının, istər Nəriman müəllimin, istərsə də Adif Ağayevin mənim də oranın əməkdaşı olmaq arzumdan xəbərləri yox idi. Rəhmətlik Adif Ağayevlə münasibətim həmişə normal oldu, hətta yeri düşəndə onunla zarafat da edirdim. O, həmişə məni ağsaqqal kimi sayardı. Hacı Əli Sobulunun «Zəngəzurun Zəngilanlı Ziyalıları» adlı kitabında (səh 147) Adif Ağayevin Nəriman Bəxtiyarov haqqında çox səmimi bir yazısı var. Dediyim bəzi faktlar həmin xatirədə dəqiqliklə öz əksini tapıb.

Adifin Nəriman müəllim haqqında yazdığı məni xeyli düşündürdü və özüm-özümə:-Görəsən, rəhmətlik Mürsəl müəllim əziyyətini çəkdiyi, yetişdirdiyi, gələcəklərinə yaşıl işıq yandırdığı adamların bəzisi bunu yadda saxlayıbmı? sualını verdim. Adiflə bağlı bir zarafatımı oxucularla bölüşürəm. Bir dəfə «Mətbuat günü» Mürsəl müəllimin kabinetində keçirilirdi. Raykomun təşkilat şöbəsinin müdiri Böyük Vətən Müharibəsi iştirakçısı və alili Rzaxan Rzayev rayon Partiya Komitəsi adından təbrik məktubunu oxudu. Yemək-içmək başladı. Məclisin şirin yerində Mürsəl müəllim mənə:

-Asif bala, bizim bu Adif Ağayevi qarmonda müşaiyət elə, yaxşı səsi var, bir məharətini göstərsin, deyəndə mən Mürsəl müəllimə «köhnə rəqibim» haqqında:

- Mürsəl müəllim, bəlkə Adifi axıra saxlayaq? Qorxuram ki, Adif yazdığı kimi də oxuya, məclis yarımçıq dağıla, cavabını verdim. Mənim bu zarafatım məclisdə uzun sürən alqışa və gülüşə səbəb oldu. Bu atmaca Adifə pis təsir etmişdi. Mürsəl müəllim nəyə eyham vurduğumu bildi və Adifə, bala qəzet işçisi belə olar, deyərək məni göstərdi. Özünü bir təhər ələ alan Adif oxudu və elə yanıqlı oxudu ki, mən də dediyimə peşiman oldum.

Mürsəl müəllim əməkdaşları kabinetdə yox, kimdən, nədən yazacaqsınızsa qeydləri orada qələmə alın, əlavə və düzəlişləri isə iş yerinizdə edin- deyərdi, özü də bu qaydaları gözləyərdi.

Mürsəl müəllim «Kənd həyatı»nda, həm də yerli radio verilişləri redaksiyasında Azərbaycanın görkəmli yazıçıları və şairləri barədə həmişə söhbət açır və bəzən də radio tamaşaların da səsləndirilməsinə şərait yaradırdı. Azərbaycan şairəsi Heyran xanım (1790-1848) haqqında həmyerlimiz Şəhriyar Quliyevin ssenarisi əsasında hazırlanmış musiqili radio tamaşa da belələrindən idi. Tamaşanın səsləndirilməsində müəllif özü ilə yanaşı memar Yusif Məmmədov, Cabbar İmamverdiyev, Zəngilan şəhər uşaq musiqi məktəbinin direktoru Məcnun Kərimov və başqaları iştirak edirdilər.

Muğam parçalarını tarda Məcnun müəllimin müşaiyətilə öz yanıqlı və şirin səsi ilə Cabbar oxuyurdu. Zəngilanlıların xahişi ilə radio tamaşa təkrarən səsləndirildi.

Mürsəl müəllim mütərəqqi adət-ənənələrin qorunması və yenilərinin yaradılması tərəfdarıydı. 1968- ci ilin mart ayında Mincivan qəsəbə dəmiryolu məktəbinin müəllimi Şəndə Seyidova Zəngilan rayon Komsomol Komitəsinin I katibi Gülarə Ələkbərovanın yanına gələrək məktəbin əmək təlimi müəllimi İdris Nağıyevin Dəmiryolu xəstəxanasında tibb bacısı işləyən, miliyyətcə ukraynalı bir xanımla ailə qurmaq və şənliyin məktəbin özündə keçirilməsi arzusunda olduğunu, İdrisin yetimçiliklə böyüdüyünü, xanımın isə Mincivanda heç kimi olmadığını bildirdi. Gülarə müəllimə bu məsələyə çox həssaslıq və qayğı ilə yanaşır. (Gülarə müəllimə mənim tanıdğım komsomol katiblərindən ən ləyaqətlisi

idi. Sonralar komsomolda işləyənlərin çoxunda Gülarə müəllimədə olan insani keyfiyyətləri görə bilmədim. Bu fikrimi onların üzünə demişəm-Asif Bağırov).

Gülarə xanım Mürsəl müəllimlə əlaqə saxlayır. Onlarla birlikdə həmin toyda mən də bir musiqiçi kimi təmənnasız iştirak edirdim. Gülarə müəllimə bütün işçiləriylə, Mürsəl müəllim isə foto muxbir Zakif Əliyevlə tədbirin axırınadək iştirak etdilər. Həm RKK, həm də ki «Kənd həyatı» redaksiyası, həm də məktəbin müəllimləri yeni ailə quranlara mətbəx avadanlığından tutmuş digər hədiyyələr təqdim etdilər. Çox gözəl bir adət-ənənənin bünövrəsi qoyuldu. Tədbir haqqında Mürsəl müəllim «Kənd həyatı» nda geniş bir yazı verdi. Bu yazını Zakif Əliyev çox dəyərli foto şəkilərlə tamamladı. Çox təəssüf ki, belə müasir adət ənənələr davam etdirilmədi.

Qeyd etdiyim kimi Mürsəl müəllim yaradıcı gənclərə həmişə şərait yaradır, onların yazdıqlarını qəzetdə dərc edirdi. Qəzetdə işləməyən Vaqif Qüdrət və Alı Əliyev belələrindən idi. Vaqif mədəniyyət işçisi, Alı isə fotoqraf idi. Hər ikisi qiyabi yolla ali təhsil aldılar. Vaqif müəllim yüzlərlə fəlsəfi şeirləri ilə yadda qaldı. Alı Əliyev isə məktəb direktoru kimi uzun illər səmərəli fəaliyyət göstərdi. Xeyli sayda maraqlı yazıları ilə mətbuatda çıxış edən Alı müəllimin ona yaxın kitabı işıq üzü görüb. Onun kitablarını oxuyanda mən özümü Zəngilanda hiss edirəm. O, eyni zamanda «Azərbaycan dilinin Zəngilan şivələri» adlı tədqiqat əsərinin müəlifidir. Bu gün də yazır, yaradır. Mürsəl müəllimi hörmətlə yad edir. Onun haqqını heç vaxt verə bilmərik, deyir.

O da, rayonda kimin kim olduğunu yaxşı bilirdi.

Zəngilanda və Qubadlıda böyük nüfuzu olan, ən çətin işlərin aradan qaldırılmasının öhdəsindən bacarıqla gələn, səxavəti və hünəri ilə seçilən böyük qardaşım Samı (sənədlərdə Şamil yazılırdı) haqqında Mürsəl müəllimin sadə bir cümlədə ifadə etdiyi:

-Şamı Zəngilanın açar- qıfılıdı fikri bizim üçün olduqca qiymətli idi. Heç kimdən qorxmayan, çəkinməyən Şamının da Mürsəl müəllimin şəxsiyyətinə çox böyük ehtiramı vardı.

Dağüstü pavilyonda keçirilən Mətbuat gününün birində Azərbaycanda hamının tanıdığı iki məşşur şəxsiyyət də iştirak edirdi.

Bunlardan biri əslən Qubadlıdan olan tarixi romanlar müəllifi yazıçı Cəlal Bərgüşad, digəri isə «Kənd həyatı» nın keçmiş məsul katibi yazıçı jurnalist Ərşad Əzimzadə idi.

Cəlal Bərgüşadın hələ gənc yaşlarından el qəhrəmanı Qaçaq Nəbi haqqında yazdığı kiçik həcmli kitabı oxumuşdum. Kitab Qaçaq Nəbini şəxsən görmüş yaşlı adamların xatirələrindən ibarət idi. Təxminən keçən əsrin əllinci illərinin axırlarında çap edilmişdi. Orada söyləyəni Zəngilan rayonunun Nüvədi kəndindən 123 yaşlı Rüstəm kişi (*onun dedikləri kursivlə verilmişdi*-Ə.S.) gözümə sataşanda baxdım ki, bu bizim qohum Rüstəm kişidir. Pirçivanda yaşayırdı. Bazarda həmişə tut qurusu, kişmiş, ərik qurusu satardı. Özünün də, yoldaşı Tutu nənənin də, qızları Çiçək və Nigar bacının da bizə get-gəlləri vardı. Cəlal Bərgüşad sonralar, «Sıyrılmış qılınc» və «Boz atın belində» tarixi romanlarını qələmə aldı. Ərşad Əzimzadəni kiçik yaşlarımdan tanıyırdım. Məndən böyük qardaşım Şəhriyarla dostluq edirdilər. Hərdən məni evlərinə aparardı, evləri montyor Əhməd Nağıyevin evləri ilə üz-üzə idi. Anasının gözləri görmürdü, tutulmuşdu, çox kədərli bir tarixi vardı. Ərşadın böyük qardaşı Əmir Böyük Vətən Müharibəsi zamanı göstərdiyi şücaətə görə «Şöhrət Ordeni» nin hər üç dərəcəsi ilə təltif olunmuşdu. Hansı namərdlərin imzası və ya saxta ittihamlarla dolu məktublar əsasında nahaqdan onu bu addan məhrum etdilər. Bu hadisəni evimizdə böyük qardaşım Şamı danışmışdı. Ana oğlunun bu halına dözməyib belə bir vəziyyətə düşmüşdü.

Əvvəlcə Cəlal Bərgüşad danışdı. O başda Mürsəl müəllim olmaqla qəzet işçilərini təbrik etdi, çıxışının sonunda:

-Mən pasportstolda işləyirdim, məni qələm sahibi kimi formalaşdıran Mürsəl müəllim oldu, dedi. Ərşad Əzimzadənin də çıxışı çox maraqla dinlənildi. O, da Mürsəl müəllimə yüksək qiymət verdi. Xatırlatdı ki, ilk büdrək addımlarımı Mürsəl müəllimin yanında atmışam, ondan təkcə necə yazmağı yox, insanlarla necə münasibət yaratmağı və həyatda necə yaşamağı da öyrənmişəm. İndi mən «Bakinski Raboçi» qəzetində zona müxbiriyəm. Bu çörəyi mənə Mürsəl müəllim verib.

Uşaq vaxtımdan Ərşad Əzimzadəni tanıdığımdan, onun rayonun futbol komandasının qapıçsı olması, komsomolun katibi işlərkən davranışı, «Kənd həyatı» ndakı xidməti, bir-birindən maraqlı yazıları yadıma düşdü və aşağıdakı məlumatı yazmaq qərara gəldim.

Ə.Əzimzadə ensiklopedik biliyə malik, qazandığı nailiyyətlərə əmisiz-dayızsız, öz çalışqanlığı və dəmir iradəsi sayəsində imza atan bir şəxsdir. «Möcüzəsiz möcüzə» kitabı çoxlarına şəfa gətirib və Azərbaycanda hər bir ailənin stolüstü kitabına çevrilib.

Müxtəlif illərdə redaksiyada əməkdaşlıq etmiş Əsgərxan Azadov, Ənvər Məmmədyarov, polis və təhlükəsizlik orqanlarında uzun müddət Azərbaycanın bir sıra rayonlarında qüsursuz çalışmış, Zəngilanın təmiz adını həmişə qorumuşlar. Salam Cavadlı, Şükufə Əliyeva, Azad Qaradərəli, Lətif Babayev indi də öz yaradıcılıq fəaliyyətlərini davam etdirirlər. Sabir Ədil oğlu Kərimov bir müddət «Kənd **h**əyatı» nda əməkdaşlıq etdikdən sonra Bakı şəhərinə köçmüş nəqliyyat polisində işləmiş, hazırda mayor rütbəsində təqaüddədir. «Kənd **h**əyatı» nda bir neçə ay çalışımş Əli Sədətqulu oğlu Quliyev barədə bir neçə söz demək istəyirəm. O mənim 50 ildən artıq dostluq etdiyim bir şəxsdir. Orta məktəb illərində 36 saylı Mincivan dəmiryolu orta məktəbinin bədii özfəalyyət kollektivinin ən fəal üzvlərindən idi. O dövrü xatırlayanda Əli müəllimin yaxşı tar çalmağı ilə yanaşı, İslam Səfərlinin, Göz həkimi pyesindəki məşhur «Gəl Gülücan» mahnısını necə məharətlə ifa etməsi və tamaşaçılar tərəfindən sürəklə qarşılanması indi də gözümün qabağındadır. Əli müəllim pioner baş dəstə rəhbərliyindən, dərs hissə müdiri, «Kənd həyatı» qəzetinin əməkdaşı, Zəngilan rayon Komsomol Komitəsinin əvvəlcə II, az sonra I katibi, RİK-nin sədr müavini, Mincivan Qovşaq Partiya Komitəsinin katibi, RİK-nin sədri, Zəngilan rayon Partiya Komitəsinin I katibi, Zəngilan rayon İcra Hakimiyətinin başçısı kimi ən mühüm vəzifəyə yüksəldi. Lakin, sadəliyini və səmimiyyətini saxlaya bildi. O, məni Kino birlıiyinin direktoru vəzifəsindən öz yanına apardı, işindəki məsuliyyət nəticəsində onun dövründə Zəngilan heç bir torpaq itkisi vermədi.

Mən Mürsəl müəllimin yanında az-çox işləmiş, sonralar bir sıra müvəffəqiyyətlər əldə etmiş insanların bəziləri haqqında söhbət açanda onların uğurlarını Mürsəl müəllimin adına çıxmaq fikrində deyiləm və bu hissdən çox aralıyam. Lakin Mürsəl müəllimin özünün nümunəsi və öyrətdikləri onların yuxarı mərtəbələrə necə çıxmağını müəyyən dərəcədə asanlaşdırmışdı. Bunu yadda saxlayanlar da var idi, unudanlar da....

Mürsəl müəllim dəbdəbədən uzaq adam idi.

Övladlarına toy edəndə musiqiçi kimi həmişə məni dəvət edərdi. Onun qohum əqrabaları da övladlarının xeyir işlərində həmişə məni görmək istəyirdilər. İşin belə alınmasında mətbuat günlərində təmənnasız xidmətimlə yanaşı Mürsəl müəllimin böyük oğlu Məzahir həkimlə dostluğumda əsas rol oynayardı. Toylara çox adam çağırmasa da dəvətsiz gələnlər dəvətlilərdən artıq olardı. Mürsəl müəllim övladlarının məclislərini ya böyük bacısı Tellinin, ya da özündən bir yaş kiçik qardaşı Əlinin həyətində keçirərdi. Toybaşı (sərpayı) da Mürsəl müəllimin qohumu usta Famil Alışov olardı, bu işi çox əla bilir və yerinə yetirərdi. Toylarda Qubadlı rayonundan da xeyli qonaq olardı. Bir sözlə, həmin toylar dədə baba qaydasına uyğun keçirilər, Qubadlıdan və Sarallı Xəştabdan gələn adamlar toyun axırınadək mağarda əyləşər, deyib-gülər, rəqs edər və musiqiçiləri daha çox sevindirərdilər. Bu toylarda maraqlı və yadda qalan çoxlu hadisələr olardı. Onlardan biri barədə Zəngilan lətifələri adlı kitabımda söhbət açmışam. Başqa bir maraqlı əhvalatı da oxuculara çatdırmaq istəyirəm. Mürsəl müəllimin böyük oğlu Məzahirin toyu idi. Məzahirə görə toya gələnlər də çoxluq təşkil edirdi, onun Qubadlı və Zəngilanda sınanmış dostları az deyildi. Mürsəl müəllimin ruhu qarşısında baş əyərək bildirirəm ki, bu dostları Məzahir özü qazanmışdı.

Gecə vaxtı toy yekunlaşmaq üzrə idi. Əslən Gilətağ kəndindən olan, Şayıflıda yaşayan, işləyən dolu bədənli, pəhləvan cüssəli Surxay müəllim bizə yaxınlaşaraq mənə:

-Asif müəllim, bir «Cəngi» çalın, dedi.

Biz cəngini çalanda o fiziki və bədəni hazırlıq keçirmiş kimi toyxanada ora- bura var gəl elədi və oynaya- oynaya Mürsəl müəllimi meydana çağırdı. Mürsəl müəllim də elə belə adam deyildi,

dostunun niyyətini başa düşmüşdü. Bilirdi ki, şəffah qəlbə malik olan Surxay müəllim onu küşk tutmağa, güləşməyə çağırır, bu səbəbdən özünü görməməzliyə vururdu. İş o yerə çatmışdı ki, Surxay müəllim Mürsəl müəllimin əyləşdiyi stolun lap bir addımlığında ona tərəf əyilərək sanki, «ala dana göy dana, hünərin var çıx meydana», deyirdi. Ani surətdə Mürsəl müəllim ona işarə edərək yaxınlıqdakı Bəylər Həsənovu göstərdi. Surxay müəllim elə bil yuxudan ayıldı, bunun nə ilə nəticələnəcəyini yəqin edib Familə yaxınlaşdı və 3 nanat verərək:

-«Cəngini» «Heyvagülü» nə çevirtdi. Bax belə idi Mürsəl müəllim.

Mürsəl müəllim yeniliyə, tərəqqiyə həmişə üstünlük verərdi. O, təkcə yeni jurnalistlər nəslinin artırılması ilə kifayətlənmir, redaksiyanın (xüsusilə mətbəənin) texniki təminatına, habelə orda da tələbata uyğun kadrların yetişdirilməsinə də böyük diqqət yetirirdi. Artıq Fərəməz İsmayılov, Həsən Əliyev, Həmzə Səfərov ahıllıq ömürlərini yaşayırdıllar.

Redaksiyanın binasının darısqallığı, qəzetin yığılmasında kustar əl işlərindən istifadə, müasir texniki avadanlıqların olmaması xeyli çətinliklər yaradırdı.

Bununla əlaqədar Mürsəl müəlliminn rayon rəhbərliyinə müraciəti müsbət həllini tapdı. Zəngilan rayon partiya komitəsinin (inzibati binasının) sol tərəfində «Kənd həyatı» qəzeti üçün ikimərtəbəli bina tikildi. Eyni zamanda redaksiyaya iki ədəd linotip alındı. (Linotip –Kitab, jurnal və qəzet mətnlərini yığmaq üçün qurğuşundan sətirtökən yığı maşını.). Həmin maşında hazırlanmış sətir, şəkilli monolit tökmələr işin keyfiyyətini və sürətini yüksəltmək, mətbəə işçilərinin ağır əl əməyinə son qoydu. Mürsəl müəllimin redaktorluğu dövründə bir sıra gənclər burada işlə təmin edilməklə, həm də ixtisas təhsili aldılar. Xanoğlan İbadov, Rəsul Səfərov, Natəvan Alıyeva, Elmira Quliyeva, Məhbubə Əhmədova, Diliş Abbasova, Nailə İsmayılova, Məhəmməd (soyadını unutmuşam, əslən Vejnəli kəndindən idi, amma, Mincivanda yaşayırdı) və s. uzun illər qəzetin vaxtında və gözoxşayan şəkildə çap edilməsi üçün əllərindən gələni əsirgəmirdilər. Mətbəə işçilə-

rinin briqadiri Xanoğlan İbadovun işgüzarlığı da qəzetin nəşrində əsas rol oynayırdı.

Mürsəl müəllimin digər xidmətlərindən biri də onun keçən əsrin yetmişinci illərinin axırlarında bölgədə birinci olaraq Azərbaycan Jurnalistlər İttifaqının «Kənd həyatı» redaksiyası yanında ilk təşkilatını yaratması və təqaüdə çıxanadək onun katibi olması idi. Bu rayonda jurnalistikanın inkişafına, həmin ixtisasa marağı olan yeni kadrların üzə çıxmasına, habelə yaradıcılıq qabiliyətli gənclərin bir mərkəzdə birləşməsi və inkişafı üçün mühüm bir mərhələ idi.

Yazının əvvəlində qeyd etdiyim kimi Mürsəl müəllim danışığında, hərəkətlərində ölçülü-biçili, həmçinin də təmkinli bir adamdı. Bəzən nadan adamlarla üzləşəndə yenə bu xasiyyətini qoruyub saxlaya bilirdi.

Vaxtı ilə Mürsəl müəllimin işə götürdüyü, bu gün də sanballı yazıları ilə diqqət çəkən Salam Cavadlı «Zəngilanın səsi» qəzetinin aprel 2001- ci il tarixli N-4, 5904 sayında Mürsəl müəllim barədə «Bir ömrün axarına söz olmaz» adlı məqaləsində yazır:

-Rayonda nüfuz sahiblərindən olan rəhbər işçilərin biri qəzetimizdə dərc edilən tənqidi yazıdan bərk hiddətlənmişdi. Redaksiyaya gəlib məqalənin qeyri obyektiv olduğunu sübuta yetirməyə çalışdı. Mürsəl müəllim sakit tərzdə dedi ki, dərindən yanaşılsa işinizdə bundan da ciddi əyintilər var. Redaktorumuzun ram olmadığını görən rəhbər işçi Mürsəl müəllimin ünvanına bir-birinin ardınca əsassız ittihamlar söyləməyə başladı.

Onun hər narazılığından sonra Mürsəl müəllim təmkinlə deyirdi:

-Xahiş edirəm əsəbiləşməyin, səhhətinizə ziyandır. ....Axı biz ziyalıyıq, bu tərzdə danışmaq bizə yaramaz.

Hiss edirdim ki, Mürsəl müəllimin təmkinini qonaq az qala etinasızlıq kimi dəyərləndirir və daha da əsəbiləşərək ölçü həddini itirir, təhqirə keçirdi.

Lakin Mürsəl müəllim yenə də :

-Xahiş edirəm.....Axı biz ziyalıyıq, əyləşin, ziyalı kimi danışaq-deyə onu sakitləşdirməyə çalışdı.

Bu dialoq bir neçə dəfə təkrarlandıqdan sonra axır ki, Mürsəl müəllim də qəti görkəm aldı və sərt tərzdə dedi:

-Mən sizi ziyalı bilirdim, səhvimə görə üzr istəyirəm. Daha siz mənim üçün burada yoxsunuz. Ürəyiniz istəyən qədər çığırın.

Sonra Mürsəl müəllim qələmi əlinə alaraq hansı məqaləni isə redaktə etməyə başladı. Və yalnız rəhbər işçi kabineti tərk etdikdə eynəyini çıxaırb stolun üstünə tulladı. Deyəsən hirslənmişdi.

«Kənd Həyatı» qəzetində 25 ildən yuxarı çalışan, sadəliyi, səmimiyəti, eyni zamanda ustalıqla qələmə aldığı müxtəlif səpkili, duzlu yazıları ilə tanınan, köçkünlük həyatından sonra Azərbaycan Dövlət Televiziya və Radio şirkətində əməkdaşlıq edən Şükufə Əliyevanın öz ustadı Mürsəl müəllim haqındakı «Qəzet səhifələrinə bükülmüş ömür» adlı geniş həcmli məqaləsindən bir iki kəlmə söz açmaq istəyirəm.

«İki sahil» qəzetinin 15 oktyabr 1997-ci il tarixli sayında Şükûfə xanım Mürsəl müəllimin keçdiyi yolu, onun ali məktəbdən əvvəlki Bakı həyatını, tələbəlik illərini, Qubadlı, Cəbrayıl və Zəngilandakı fəaliyyətini ustalıqla qələm almışdır.

Şükufə xanım qəzetin əvvəllər rastlaşdığı çətinliklərdən, ixtisaslı kadrların çatışmadığından, mətbəədə ağır əl işlərindən, elektrik enerjisinin tez-tez kəsilməsindən, üstəlik əməkdaşların əksəriyyətinin qiyabiçi olmasından və bütün bu ağırlıqların Mürsəl müəllimin üzərinə tökülməsindən söz açır.

Yadıma bir hadisə düşür, mən də qiyabiçi idim. Qış sessiyasına gedirdim. Kupedə Şahmar Bayramov və Şükufə Əliyea ilə yol yoldaşı oldum. Çay içdik, çörək kəsdik. O zaman Əvəz Rzayev və Salam Cavadov da qiyabiçi idilər. İzahata ehtiyac yoxdur....

Şükufə xanımın məqaləsində oxuyuruq:

-Bəziləri böhranlı vaxtlarda ailəlikcə rayonu tərk etdiyi halda o, rayon mühasirəyə düşəndə belə camaatdan ayrılmayıb Arazdan İran ərazisinə keçməli oldu. Burada mən onu bu faciəvi mənzərəni öz foto kamerasının lentinə köçürtmək üçün qaçqın düşərgəsini bir-bir gəzən gördüm. Bu şəkillərin bəziləri respublika mətbuatında dərc edilmişdi.

Şükufə xanımın Mürsəl müəllim haqqındakı «Qəzet səhifələrinə bükülmüş ömür» adlı məqaləsini oxuduqdan sonra belə qənaətə gəldim:-

Bu məqalə Mürsəl müəllim haqqında deyilənlərin ən yaxşısı olmaqla, həqiqətə bükülmüş yaxşı bir xəzinədir.

Mürsəl müəllim erkən, gənc yaşlarından ağsaqqallıq zirvəsini fəth etmiş şəxsiyyətlərdən idi. O, dünya malına ötəri, təmiz adın isə əbədi yaşayacağını çox gözəl bilirdi. Gözü, könlü tox olmaqla, nüfuzunu qoruyub saxlamışdı. Zəngilanı tanıyanlar son otuz ildə onun nə qədər böyüdüyünü, abadlaşdığını, bir sıra sosial obyektlərlə yanaşı ictimai və şəxsi evlərin tikildiyini, əhalinin sosial rifahının əvvəlkindən qat-qat yüksəldiyini bilməmiş olmazlar. Dəyişməyən bir şey vardı: Mürsəl müəllimin xasiyyəti və bu «jildom»dan (söz ruscadı mənası yaşayış evi deməkdir) ikinci bir «jildom»a köçməsi. Zəngilan rayon pioner və məktəblilər evində direktor işləyərkən bir gün səhər-səhər Mürsəl müəllim qoltuğunda papka içəri girdi, salam verdi. Hiss etdim ki, onun bu qəfil gəlişindən işçilər əl-ayağa düşdülər. O, özü də bunu duyaraq:

-Narahat olmayın, Asif müəllimlə bir az işimiz var, dedi.

Kabinetə girdik, heç oturmadı da:

-«Asif, bala, mətbəədə linotip ştatı boşdur, baldızın da ixtisaslıdır, ona çatdır sabahdan işə gəlsin» deyərək getdi.

Günortadan sonra onun kabinetinə getdim, məqsədimi anladı və «sən Məzahirin yaxın dostusan, Nailə (baldızımı deyirdi) bir aydan çox burada pulsuz işləyib, Ələsgərin (qayınatamı deyirdi) bir çətən külfəti var, işləyəni də böyük qızıdır ki, onu da sən gətirmisən, təklifinə görə çox sağ ol. Amma bil ki, mən elə işlərə qulluq etməmişəm, etmərəm də».

Sözü çevirməyin mənası yox idi. Suyu süzülə-süzülə redaksiyadan Zəngilan rayon SES-ə (Sanitar Epidomoloji Stansiya) Məzahirin yanına getdim. Başıma gələnləri ona açım.

Məzahir həkim də yarı zarafat, yarı ciddi gülə -gülə:

-«Qardaş o elə olduğuna görə bu jildomdan o jildoma, o jildomdan da bu jildoma köçür»də dedi. Məzahirin bu fikri ilə mən də razılaşdım. Mürsəl müəllim 1989-cu ilin ortalarında öz ərizəsi ilə redaktorluqdan təqaüdə çıxdı, lakin yenə də onun imzası qəzet səhifələrinin yaraşığı oldu.

Zəngilan rayon partiya komitəsi dörd mindən çox qəzet nömrəsinin işıq üzü görməsinin əsas memarını təntənə ilə, mükafat-

larla yola saldı.

...Bir neçə il keçdi. Ağıla gəlməz və arzu olunmaz günlər başladı. Doğma yurddan didərginlik, ucu-bucağı görünməyən, axırı bilinməyən, analoqu olmayan bir hadisə, torpağa bağlı, onun qədrini bilənlər üçün həzm edilməsi mümkün olmayan bir dərd idi. Hamımız o sarsıntını keçirmişik. Mürsəl müəllim bu ağrını ikiqat keçirtdi. Digər işğal olunmuş ərazilərlə birlikdə anadan olduğu Qubadlı və otuz yeddi yaşından yaşadığı, altmış yeddi yaşından məcburən tərk etdiyi Zəngilan dərdi.....

Arazın İran tərəfində on minlərlə zəngilanlının arasında hamının hörmət etdiyi və yolunu gətirdiyi Mürsəl müəllim də vardı.

Həsrət və kədərlə İrandan Arazın o tayına ermənilərin (hay-Ə.S.) ardı-arası kəsilməyən qrad, top mərmilərinin Mincivanı, Baharlını necə oda-alova bürüməsinə baxırdıq. Belə dəhşətli mənzərələri isə ancaq kinolarda görmüşdük. Vaxtı ilə 70 ildən çox Zəngilandan Arazın o tayına qorxa-qorxa, ehtiyatla baxmışdıq. O zamanlar nə o, nə də bu tayda belə alov görməmişdik. Kimin hara gedəcəyi məlum deyildi. Bu ağır zərbədən hamı şok halında idi. Şükufə xanımın haqlı olaraq yazdığı Mürsəl müəllim öz foto kamerasını işə salmışdı. İran tərəfdən də çoxlu çəkilişlər vardı, lakin onlar bizə paylanan pendir-çörəyi və uşaqlar üçün əvvəllər istifadə olunmuş pal-paltarı lentə köçürürdülər. Bu bizi sındırmağa bərabər bir hal olsa da, uşaqlarımıza görə başqa çarəmiz yox idi.

Mürsəl müəllim ailəsi ilə Bakıya pənah gətirmişdi, yataqxana həyatı yaşayırdı. Yeri düşdükcə mətbuatda maraqlı yazıları ilə çıxış edirdi.

Biz hələ rayonda ikən Mürsəl müəllimin Bakıda çox saylı dost-tanışının olduğunu eşitmişdik. Süleyman Rəhimov, Əli Vəliyev, Cəlal Bərgüşad, Qabil, Gəray Fəzli, tələbə dostu akademik Sədi İmanov və başqaları. Onların bəziləri dünyaların dəyişsələr də, yaşayanlar daha çox idi. Ancaq Mürsəl müəllim uzun illər əməl etdiyi xasiyyətinə xilaf çıxmadı, heç kimdən kömək ummayaraq sakit, həm də ağrılı köçkün həyatı yaşamaqla yaradıcılığını davam etdirirdi. Bəlkə də buna sakit həyat tərzi demək olardı, lakin 1996-cı ilin may ayının 28- i bu sakitliyi alt-üst etdi. Məzahir həkimin

böyük qızı, Mürsəl müəllimin ilk nəvəsi Ülviyyə qəflətən rəhmətə getdi. Həmin günü Ülviyyə bizə gələcək, böyük qızım Aytəkinlə Göy Məscidə gedəcəkdilər. Bu çox ağır itki idi. Qocayevlər ailəsi ilə bərabər bizim ailə üçün də. Ülviyyə böyük qızım Aytəkinlə Zəngilan şəhər 1 saylı orta məktəbinin rus bölməsində eyni sinifdə oxumuşdular. Zəngilandakı mehribançılıqlarını Bakıda da davam etdirirdilər. Aytəkinin onlara, Ülviyyənin də bizə get-gəli var idi. Mənim Məzahirlə Ülviyyənin kiçik dayısı Zülfüqarla dostluğum, Ülviyyənin anası Sürəyya həkimin bizə qohumluğu, səmimiyyəti və mehribançılığı bu iki rəfiqəni daha da yaxınlaşdırmışdı. Bu sarsıntıdan özümüzə gələ bilmirdik. Aytəkin də çox sınıxmışdı, hərdən gedib Sürəyya xanımın yanında qalırdı, o da, az da olsa bundan təsəlli tapırdı. Bu təsəlli də beş il davam etdi, Ülviyyənin yoxluğuna tab gətirməyən Sürəya xanım18 avqust 2002- ci ildə gözlərini əbədi olaraq yumdu. Mürsəl müəllimlə əlli beş ildən yuxarı ömür-gün sürmüş Xavər xanım nəvəsinin və sevimli gəlininin vaxtsız ölümlərinə dözməyərək, için –için əriyə-əriyə 2002- ci ilin yanvar ayının 2- də həyatla vidalaşdı.

Ailənin sağ qalan üzvləri Mürsəl müəllim, Məzahir, Tahir və Gülşən xanım və digər yaxın qohumlar özlərini nə qədər toxtağ aparsalar da, onların nələr çəkdiklərini söyləməyə yəqin ki, ehtiyac yoxdur.

Baş vermiş itkilərin mərkəzi Mürsəl müəllimin üzərinə düşürdü. O, 14 iyun 2010-cu ildə dünyasın dəyişdi. Məzahirin səhhətində problemlər yarandı, Tahir onu öz evlərinə apardı, yaxşı qardaş olduğunu sübuta yetirdi, Məzahirin özü demişkən «kəfəni yırtdı» lakin bu sevinc də çox qlısa oldu. 2014- cü ilin may ayının 16- da orta boylu, qarayanız, suyu şirin, gülərüz, incə yumor sahibi Tahir də əbədiyyətə qovuşdu. Mürsəl müəllimin özündən kiçik qardaşları Əlini, Vaqifi və bacısı Tellini və digər qohumları da bura əlavə etsək Məzahir həkimin vəziyyətini anlamaq bir o qədər də çətin olmaz. Təəssüf ki, bu arzu edilməz hadisdələr hamımızın qapısını dəfələrlə döyüb, nə etmək olar? Böyük yaradanın məsləhəti belədir.

Mürsəl müəllim haqqında yazdıqlarımı bitirmək üzrə idim, Məzahir həkimlə məsləhət üçün may ayının 24-də onlara getdim.

Məzahirin kiçik əmisi rəhmətlik Vaqif müəllimin oğlu Eyvaz müəllim də ora gəldi. Özü ilə Mürsəl müəllimin həyatı, fəaliyyəti, yaradıcılığı barədə çox sanballı materialalr gətirmişdi. Onun gətirdiyi 184 səhifəlik «Dünya səndən kimlər keçdi», «Ömürdən qalan izlər», «Erməni siqləti» adlı sistemli yazılar bizim işimizi 60-70 faiz asanlaşdırdı. Bu külliyyat Mürsəl müəllimin özünün qələmə aldığı və onun haqqında yazılanların tam məcmusu idi. Şükufə xanımın «Qəzet səhifəsinə bükülmüş ömür» məqaləsini də oradan oxudum. Burasını deyim ki, Eyvaz müəllimin babası Talıb müəllim, atası rəhmətlik Vaqif müəllim və anası Almaz xanımla aramızda böyük xətir-hörmət vardı. Hələ rayonda ikən onların işlədikləri məktəbin inspektoru idim və təqaüdə çıxanadək həmin məktəb səlahiyyət dairəmizdə idi. Eyvaz müəllimi ilk dəfə 2011-ci ilin dekabr ayının 29-da Salam Cavadlının «Son gümanım Zəngilan» kitabının təqdimatında və Zəngilan saytının açılışında görmüşəm. İlk tanışlıqdan onun çox ciddi, az danışıb, çox iş görən bir gənc olduğunu anlamışdım. Sonradan zənnimdə yanılmadığımı gördüm. Eyvaz Vaqif oğlu 1984- cü ildə Zəngilan rayonunun Sarallı Xəştab kəndində ziyalı ailəsində anadan olub. 2005-ci ildə Bakı Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsini bitirib. Gənclər təşkilatında, media orqanlarında təsisçi və rəhbər vəzifələrdə çalışıb. 2009-cu ildən fəaliyyət göstərən Azərbaycanın ilk regional xəbər portalı olan «Sumqayıt xəbər com.»un təsisçisi və baş redaktorudur. Son 10 ildə təlimçi, jurnalist və yazar kimi fəaliyyət göstərən E.Qocayevin yazdığı «Karyera bələdçisi» kitabı Azərbaycanda ən çox oxunan kitablar sırasındadır. Eyvaz müəllim Sumqayıt şəhərinin sosial-mədəni həyatında xüsusi fəallığı ilə fərqlənib, bir sıra «Fəxri Fərman» və pul mükafatlarına layiq görülüb. 2010-cu ildə «İlin gənc jurnalisti» adını alıb. 2016-cı ildən Sumqayıt şəhər İcra Hakimiyyətinin ictimai-siyası və humanitar şöbəsində baş məsləhətçi vəzifəsində çalışır. Qocayevlər şəcərəsində belə insanın yetişməsi məni sevindirdi.

«Qızıl Zəngilanın əşrəfi» kitabında Mürsəl müəllimə yer ayırdığına, onun xeyirxah əməllərini yada saldığına, təltiflərini ad-ba ad yazdığına görə Tarverdi Abbasova dərin minnətdarlığımı bildirirəm. Çünki Mürsəl müəllim sənin, mənim yox, hamımızındır.

Mürsəl müəllimə «Əməkdar jurnalist» adı verilmədi. O, özü heç vaxt dilinə gətirib bu fəxri adı istəmədi. Ancaq neçə-neçə rayon rəhbəri ilə işləmiş, belə bir təmiz adamın, «yaddan çıxması» yolverilməzdir.

Mürsəl müəllim **«Səhnəmizin Cahandar ağası**» məqaləsində yazır.:

**-**Bu obrazi səhnədə oynamaq hər adama nəsib olmaz. Təsadüfi deyil ki, Ələddin deyir ki, əgər Ələsgər Ələkbərov onda sağ olsaydı, bu rolu mənə verməzdilər, mən də heç ona çəkilməyə razı olmazdım. (Xalq artisti Ələddin Abbasovun bu etirafında da ağayanalıq var-Asif Bağırov).

Yaxud Mürsəl müəllimin «İki cəbhənin qəhrəmanı» adlı məqaləsi Bürünlü kənd sakini, Böyük Vətən Müharibəsində döyüşlərdə dörd Orden, 12 medal, bir sıra təşəkkürlər almış, dinc quruculuq illərində 50 ildən yuxarı müəllimlik etmiş, direktor olmuş, ağsaqqal ziyalı Həsən Məmmədovdan, onun səmərəli fəaliyyətindən bəhs edir. Maraqlı faktlarla zəngin yazıdır.

Mən Həsən müəllimlə bir məktədə işləmiş və həmin məktəbin inspektoru olmuşam. Həmişə də fikirləşmişəm belə əqidəli şəxsiyyətə nə üçün «Əməkdar müəllim» adı verməyiblər? Görəsən fəxri adlarla təltif olunanların heç olmazsa biri fikirləşibmi ki, bu ada onlardan əvvəl Mürsəl müəllim, Həsən müəllim layiqdirlər.

Bu təltiflər barədə məni bir fikir götürür. Ağabala Abdullayevi, el sənətkarını Azərbaycan xalqı çox sevirdi, muğamlarımızın mahir ifaçısı idi. «Zabul segahı» onun qədər məharətlə oxuyan olmayıb. O da, nə «əməkdar» nə də ki, «Xalq» artisti adı almadı. Amma ürəklərdə daim yaşayır. Mürsəl müəllim qəlbimizdə yaşadığı kimi. Mürsəl müəllim barədə plan üzrə payıma düşən yazını Salam Cavadlının «Qayanın tənha daşı» kitabından «Baş salnaməçi» şeri ilə bitirmək istəyirəm. Şerin əvvəlində «uzun illər rayon qəzetində redaktoram, həm də həyat, təcrübə məktəbim olmüş Mürsəl Qocayev»ə sözləri yazılmışdır.

Doğma övladını da,
İşi qədər sevməyib.
Qəzetə nə atıblar,
Zərbəsi ona dəyib.

Baxma asta tərpənib,
Çox vaxt usta tərpənib.
Səbr adlı dərya qədər,
Aləminə güvənib.

Başqa dayaq olmayıb,
Qələminə güvənib.
Onun seçdiyi yolla,
Çox məqsədə çatmışıq.

Yumruq kimi birləşib,
Salnamə yaratmışıq.
Ölçü-biçi hissini,
Hər işdə baş bilib o.

Qəzeti saymayana,
Qəfil kəsər göstərib.
Öz yerini, həddini,
Sərt, müxtəsər göstərib.

Qanqal əkib becərən,
Çox «bostana daş» atıb.
O, qəzeti yaşadıb,
Qəzet onu yaşadıb.

**Asif Bağırov,**
**yazıçı –publisist.**
**may-iyun 2020 –ci il, Bakı**

## Qəzet səhifələrinə bükülmüş ömür

Onun imzasına 1957-ci ildən 1961-ci ilə kimi Qubadlıda çıxan «Avanqard» qəzetində redaktor, 1961-ci ildən 1963-cü ilin mayına kimi Azərbaycan KP MK və Azərbaycan Nazirlər Sovetinin Cəbrayıl rayonlararası «Kolxozçu» və Laçın rayonlararası «Kənd həyatı» qəzetində xüsusi müxbir, 1963-cü ilin may ayından isə Azərbaycan KP MK və Azərbaycan Nazirlər Sovetinin Zəngilan rayonlararası qəzetdə, sonra isə rayon qəzetinə çevrilmiş «Kənd həyatı» qəzetində redaktor kimi 1989-cu ilin iyununa qədər rast gəlmək olar.

1989-cu ildə təqaüdə çıxdıqdan sonra da müstəqil jurnalist kimi fəaliyyətini səylə davam etdirmişdir. Mürsəl Qocayevin imzası nəinki çalışdığı, həm də respublikanın bir sıra qəzetlərinin səhifələrində, Azərbaycan teleradiosunun ekran və efirində gedən bir sıra materiallardan da diqqətli oxuculara tanışdır.

Uzun muddət mətbuatda səmərəli fəaliyyət göstərməsi onun bu sahəyə bilavasitə istehsalatdan gəlməsi möhkəm əmək vərdişi və geniş ictimai görüşə malik olması ilə əlaqədardır. M. Qocayev 1941-ci ildə Bakı şəhərində 10 nömrəli TPM-ni tokar ixtisası üzrə bitirib Binəqədi rayonundakı hərbi zavodda işləmiş, sonra kəndə getmiş və bir il təsərrüfatda çalışmış, 1943-cü ildə yenidən Bakıya qayıdıb Binəqədi neft trestinin dəqiq ölçü alətləri sexində işləmiş, həm də orta təhsilini axşam fəhlə-gənclər orta məktəbində davam etdirmişdir. 1944-cü ildə indiki N.Tusi adına APU-ya daxil olub 1948-ci ildə onun dil-ədəbiyyat fakultəsini müvəffəqiyyətlə bitirmişdir.

O, altı il Zəngəzurda əsası 1884-cü ildə qoyulan ilk məktəblərdən biri və diqqətəlayiq ənənəsi olan Qubadlı orta məktəbində əvvəlcə müəllim, sonralar isə tədris hissə üzrə direktor müavini işləmişdir. Bütün bunlar ona qarşıdakı fəaliyyət illəri üçün möükəm zəmin yaratmışdır.

İşlədiyi müddət ərzincə özünü hər cəhətdən göstərən bir ziyalı kimi onu 1955-ci ildə RPK-nin idieloji şöbəsinin müdiri vəzifə-

sinə irəli çəkmiş, 1957-ci ildə isə rayon qəzetinə redaktor təyin etmişlər. Bütün bunlar adi bioqrafik göstəricilər deyil, düz yarım əsrlik əmək yoludur ki, bunun da düz 40 ili daim gərgin narahat mətbuata həsr olunmuşdur.

Birisindən soruşurlar:

- Qardaşın necə adamdır?

Cavab verib deyir:

- Yoldaş olmamışam.

Doğrudan da çox böyük hikmətdir. Yoldaş olmayınca qardaş da qardaşı yaxşı tanıya bilməz. Əmək prosesi, birgə işləmək də belədir. Onda adam-adamı daha hərtərəfli, nisbətən dolğun tanıya bilir.

Mən Mürsəl müəllimi 1967-ci ildən, hələ orta məktəbdə oxuyarkən tanıyıram. Rayon qəzetləri rayonlararası qəzetə çevirilmişdi. «Kənd həyatı» qəzeti redaksiyası Laçından köçürülüb Zəngilanda nəşrə başlamış, Zəngilan Qubadlı və Laçın rayonlarını əhatə edirdi. Qəzet əvvəlki rayon qəzetindən fərqli olaraq yeni formatda 4 səhifə şəklində çıxırdı. Qəzet ilk nömrələrindən oxucuların diqqətini cəlb edirdi. Məktəbdə müəllimlərimizdən, evdə valideynlərimizdən, ünsiyyətdə olduğumuz adamlardan onun səhifələrində gedən materiallar haqqında çox rəylər eşidirdik. Özüm də o qəzetin oxucusuna çevrilmişdim. Mətbuata ilk marağım məhz onda oyanmışdı. Ancaq bu arzuma çata biləcəyim mənə xəyal kimi gəlirdi. Ancaq hələ orta məktəbdə oxuyarkən həmin qəzetdə ilk dəfə öz imzamı gördükdə keçirdiyim sevinc, təəssüratı indi də şirin bir xatirə kimi yaddaşımda yaşamaqdadır. O zaman kiçik bir xəbərim dərc olunmuşdu.

Orta məktəbi qurtaranda redaksiyada boş yer olduğunu bilib redaktor müavini N. Bəxtiyarov vasitəsi ilə Mürsəl müəllimə müraciət etdim. O, məni ədəbi işçi kimi müvəqqəti işə qəbul etdi. Çox gərgin vaxtlar idi. Mətbəənin texniki bazası çox zəif idi. İxtisaslı mürəttiblər çatışmırdı. Tez-tez mətbəə avadanlıqlarında baş verən qüsurlar, elektrik enerjisindəki fasilələr, üç rayonun bir-birindən çox aralı olması, rabitə və nəqliyyat əlaqəsinin zəifliyi, işləri normal aparılmasına imkan vermirdi. Redaksiyada redaktor,

müavini və bir şöbə müdirindən başqa heç kəsin qəzetçilik təcrübəsi yox idi. Sonradan redaksiyaya götürülmüş mən və məndən əlavə 3 nəfər isə nəinki təcrübəmiz, hətta sadəcə səriştəmiz belə yox idi. Bütün bu çətinliklərə baxmayaraq Mürsəl müəllimin təkidi ilə redaksiyaya yeni qəbul olunanlar, mən də universitetin qiyabi jurnalistika fakultəsinə təhsil almağa getdik. Xoşbəxtlikdən hamımız qəbul oluduq.

Necə deyərlər, işin içinə girəndən sonra bildim ki, redaksiyada qarşıya çıxan bu çətinlikləri həll etmək üçün Mürsəl müəllim nə qədər gərgin işləməli olurmuş. Qiyabiçilər təhsillərini davam etdirmək üçün qış, yay sessiyalarına gedəndə bu gərginlik iki-üç qat artdı. Bununla belə, o. qəzetdə gedən materialların üzərində çox ciddi işləyər, müəlliflərlə, habelə əməkdaşlarla geniş iş aparır və lazımi tövsiyələr verərdi.

Onun ən başlıca tövsiyəsi, tələb və təkidi bu idi ki, əməkdaş yazıda heç bir qərəzə yol verməməli və təmənna güdməməlidir. O, materialları redaktə edərkən yazıda obyektivliyi əsas götürərdi. Məhz bunun nəticəsi idi ki, neçə illər ərzində bir dəfə də olsun redaksiya xoşagəlməz bir fakt qarşısında qalmamışdı.

Redaksiya üçün kadr hazırlamaq, mətbəənin texniki vəziyyətini yaxşılaşdırmaq üçün əlindən gələni əsirgəmirdi. İlk dəfə bizim mətbəədə linotiplər onun təşəbbüsü ilə quruldu.

Bizim zonada jurnalist birliyinin ilk təşkilatı bizim redaksiyanın yanında yarandı. Onun 1965-ci ildə ilk üzvü özü idi. Sonralar onların sayı 10 nəfərə çatdı.

Bir sıra gənclər redaksiyanın zəmanəti ilə jurnalist təhsili almış, M. Qocayevin zəmanəti ilə AJB-nin üzvü olmuşlar.

Mətbuat fondunun müdiri, Milli Məclisin üzvü İmamverdi Ismayılov, «Musavat» jurnalının redaktoru Nəsiman Yaqubov, «Azərbaycan» qəzetinin xüsusi müxbiri Ərşad Əzimzadə, Zəngilan İH hümanitar şöbəsinin müdir müavini Şahmar Bayramov, «Azadlıq» qəzetinin əməkdaşı Azər Əhmədov, «Ziyalı» qəzetinin redaktoru «Qızıl qələm» mükafatı sahibi Əvəz Rzayev, rayon qəzetinin əməkdaşlarından Salam Cavadov, Adif Ağayev, Lətif Şüküroğlü, Şəfiqə Məmmədova və bu məqalənin müəllifi buna misal ola bilər.

O, 1978-ci ildən Zəngilan rayonu işğal edilənə qədər AJB rayon qəzeti yanında ilk təşkilatın katibi olmuşdur.

Mürsəl müəllim yüksək mənəviyyatı, sağlam məişəti, kollektivdə səbr və təmkini ilə bizə həmişə şəxsi nümunə olmuşdur.

İşlədiyi müddət ərzində 4 mindən artıq qəzet imzalamış, müxtəlif qəzet janrında yüzlərlə məktub yazmışdır.

Erməni təcavüzkarlığı ilə əlaqədar olaraq M.Qocayev camaat arasında geniş iş aparmış, rayonda qarşıdurma hallarının olmaması üçün öz ziyalılıq nüfuzundan bacarıqla istifadə etmişdir.

Bəziləri böhranlı vaxtlarda ailəliklə rayonu tərk etdiyi halda, o, rayon mühasirəyə düşənədək camaatdan ayrılmayıb Arazdan İran sərhədinə keçməli oldu. Burada da mən onu bu faciəli mənzərəni öz foto-kamerasının lentinə köçürmək üçün qaçqın düşərgələrini bir-bir gəzən gördüm. Bu şəkillərin bəziləri respublika mətbuatında dərc olunmuşdur.

Ağır qaçqınlıq şəraiti, neçə illərdən bəri keçirdiyi sarsıntı, üstəlik qocalıq onu müstəqil jurnalist fəaliyyətindən ayıra bilməmişdir. 1993-cü ilin noyabrında Bakıda məskunlaşdıqdan sonra respublikanın bir sıra qəzetlərində ardıcıl çıxış etməkdədir.

Onun «Didərgin qayğıları, didərginə qayğılar» rubrikası altında rayonun işğal olunması ilə əlaqədar olaraq verdiyi bir sıra məqalələrdə jurnalistin ürək yanğısı, torpaq həsrəti öz ifadəsini çox aydın tapmışdır. «Erməni siqləti» məqaləsində isə ermənilərin uzun illərdən bəri apardığı hiyləgər siyasətinin bəzi məqamlarından oxuculara söhbət açılır.

1941-45-ci il müharibəsində Azərbaycan oğullarının göstərdiyi hünər gənclərimizin vətənpərvərlik tərbiyəsi üçün çox ibrətamizdir. Bu cəhətdən həmkarımın «Sərhəd», «İki sahil» qəzetində 416-cı diviziyanın 1386-cı polkunun zabitlərindən kapitanlar İsmayıl Sayılov, Məhəmməd Heydərov, mayor Mirağa Əliyev haqqında verdiyi oçerklər xüsusi ilə səciyyəvidir. Jurnalistin şəhidlər haqqında yazılarını həyəcansız oxumaq olmur.

Mürsəl müəllimin «Dünya səndən kimlər keçdi» rubrikası altında jurnalistlik fəaliyyəti dövründə görüşdüyü bir sıra elm və sənət adamları haqqında mətbuatda xatirələri çap olunmuşdur.

Onun «Şəhriyar» qəzetində «Nurlu simalar» sərlövhəsi altında öz ali məktəb müəllimləri: akademiklər Ə.Seyidov, M.Mehdizadə, professorlar Ə.Dəmirçizadə, Əli Sultanlı, dilçi alimlərdən İ.Əfəndiyev, Z.Tağızadə, Mirzə Cavad Bağırov və başqaları haqqındakı xatirələri dərin ehtiram və məhəbbət hissi ilə yazılmışdır.

«İki sahil» qəzeti səhifələrində həmin rubrika altında S.Vurğun, Süleyman Rəhimov, Əli Vəliyev, Atif Zeynallı, Cəmşid Əmirov, akademik Abbas Abbaszadə, anadan olmasının 70 illiyi ilə əlaqədar tələbəlik yoldaşları xalq şairi Qabil, Əməkdar elm xadimi Sədi İmanov, yazıçı Hüseyn İbrahimov haqqında verilmiş xatirələri çox maraqla oxunur. Bundan əlavə onun Elbrus Şahmarın kitabları, Əli Vəliyev haqqında, general Arif Heydərov haqqında yeni çap olunmuş xatirə kitabları barədə qəzetlərdə dərc olunan rəylər də çox səmimiyyətlə yazılmışdır.

M.Qocayev bir vaxtlar rayon qəzetində «Zəngəzur ellərinin söz boxçasından» rubrikası altında maraqlı folklor nümunələrinə xüsusi səhifələr həsr edərdi. O, indi də bu nümunələri toplamaqla məşğuldur. Onun bəzi nümunələrini «İki sahil» qəzetində çox həvəslə oxumuşam.

Əvvəllər yazdıqları, 40 illik fəaliyyəti bir yana, təkcə üçillik qaçqınlıq dövründə müstəqil jurnalist kimi yazdığı publisistik məqalələr jurnalistlər üçün müəyyən edilən mükafatlardan hər hansı birinə desən layiqdir. Çox təəssüf ki, onun anadan olmasının 60 illiyi ilə əlaqədar olaraq 1986-cı ildə uzun müddət mətbuatda xidmətinə görə AJB-nin fəxri fərmanından başqa heç bir təltifi yoxdur.

İndi o, anadan olmasının 70 illiyini başa vurub ixtiyar çağına çatmış və didərginlik iztirabları çəkməkdədir. Ancaq yenə də öz peşəsini müstəqil surətdə davam etdirməkdədir.

Onunla görüşümüz zamanı dedi:

- Bu il Zəngilanda ilk qəzetinin nəşr olunmasının 65 ili tamam olur. Çox arzu edərdim ki, «Zəngilanın səsi» nin nəşri bərpa olunsun. Bu, respublikanın hər tərəfində məskunlaşmış rayon əhalisinin torpaqlarımızın azad olunması uğrunda mübarizədə səylərini birləşdirməyə böyük təsir göstərərdi.

Hətta bunun üçün özünün necə kömək edə biləcəyini də bildirdi. Bu, quru söz deyil, onun ürəyinin arzu və istəyidir.

Budur, bax, Mürsəl müəllim daim rayonun qayğıları ilə yaşayan və onun qaçqınlıq ağrılarının dərdini çəkən belə bir jurnalist həmkarımızdır. Onun haqqında söz açmağa məni səy edən də məhz ondakı bu xüsusiyyətidir.

**Şükufə Əliyeva.**
Azərbaycan Dövlət televiziya-Radio Şirkətinin əməkdaşı

## Kənd həyatı təmizliyi

Gənc nəsli deyə bilmərəm, amma orta və yaşlı nəsil kəndin saflığını, təmizliyini, təbiiliyini həmişə dilə gətirmiş, orada yaşamağa üstünlük vermişlər. Doğrudan da, kənd həyatı şəhərə baxanda öz təbiiliyi, təmiz havası və gözəlliyi ilə şəhərdən irəlidə idi. Məhz Mürsəl müəllimin sayəsində bizim «Kənd **h**əyatı» da öz saflığını, təbiiliyini, təmizliyini həmişə qoruyub saxladı.

Onunla bir yerdə işləmək çoxlarının arzusu idi, amma ...

Mən onunla bir yerdə çiyin-çiyinə işləməsəm də demək olar ki, hər zaman ona yaxın idim. Ona mən yaxınlaşmırdım, o məni təbiiliyi, saflığı, düzlüyü ilə özünə çəkirdi.

Orta məktəbi bitirdikdən sonra ali məktəbə daxil ola bilmədim. Rayonda fəhlə işləyirdim. Ali məktəbə daxil ola bilmədiyimdən küçəyə çıxmağa, dost-tanışla qarşılaşmağa, onların nə oldu sualına cavab verməyə (bu mənim o zamankı düşüncəm idi) utanırdım. Bir gün nahardan işə qayıdanda elə oldu ki, Lenin bağının yanından keçməli oldum. Bu zaman Mürsəl müəllimin qarşıdan bizim kəndli Ələkbər müəllimlə gəldiyini gördüm. Aradan çıxmağa çalışsam da olmadı, Ələkbər müəllim məni yaxaladı və Mürsəl müəllimə:

-Bu mənim kirvəmdi. Yaxşı əl qabiliyyəti var, dedi

Mürsəl müəllim də :

-Onu yaxşı tanıyıram, amma əl qabiliyyəti olduğunu bilmirdim.

Mürsəl müəllim mənə dedi ki, vaxtın olanda bir yanıma, redaksiyaya gəl.

Onu da deyim ki, Mürsəl müəllimin özündən bir yaş kiçik qardaşı mənim adaşım Əli dayı ilə qapı bir qonşu idik.

Bir gün eləmə tənbəllik Zəngilan şəhərinin isti havasından qaçıb getdim «kənd həyatı»na.. Mürsəl müəllimin kabinetinin qapısı həmişə açıq olardı. Özümü göstərdim. Məni görən kimi ayağa qalxıb məni içəri dəvət elədi və eyni zamanda əl verib görüşdü.

Bəzi suallar verdi mən də (o vaxt 18 yaşım var idi) o zamankı ağlıma görə cavab verdim. Məndən nə çəkdiyimi soruşdu. Mən də nə bilim, dedim, nə olsa karikatura, portret çəkirəm, şüar yazıram, dedim.

O, mənə bir şəkil verdi. Əvvəl onun nə olduğunu anlamadım. Sonra özü izah elədi ki, bu qalxandı. Qanun keşiyində rubrikasından yazı olanda bu şəkli verəcəkdilər. Bu,deyəsən, Ədliyyə nazirliyinin loqosu idi.

Mürsəl müəllim dedi ki, bunun yenisini çək gətir baxım. Bir də bir çaynvord çək, dedi.

Mən evə gəlib həm qalxanı, həm də ki, çaynvordu çəkib səhər günorta vaxtı yeməyimi tez yeyib onun yanına getdim. Soruşdu ki, çəkdinmi? nə tez. Çəkdiklərimi ona verəndə hiss elədim ki, bunu gözləmirdi. Çaynvordu götürdu, amma qalxana haqlı irad tutdu. Mən qalxana nə isə əlavə eləmişdim. Sonrakı illərdə də xeyli krosvordlar, çaynvordlar, kriptoqamlar, şair və yazıçıların yubileyləri ilə bağlı onların şəkilləri və sözlərindən ibarət kriptoqamlar da çəkdim. Eyni zamanda, qəzetdə gedən xarici xəbərlər, beynəlxalq mövzuda söhbət, həkim söhbəti başlıqları da mənim işim idi. Bir işim də var idi. Düzdü bunu, kimsə bilə bilməzdi. Onu Mürsəl müəllim, mən, bir də ki, Allah bilirdi. O «Kənd **h**əyatı»nın başlığı idi. Bildiyiniz kimi təbəqələr bir az işlənəndə yeyilirdi. Mən həmin başlığın eynisini çəkdim. Necə deyərlər kadr arxasında qalan işlərimdən idi.

Qeyd etdiyim kimi Mürsəl müəllimin kiçik qardaşı bizimlə qonşu idi. 1963-cü ildə atam xəstələnmişdi və Bakı şəhərində xəstəxanada idi. O, vaxt kiçik qardaşım haradasa 2 yaşı var

idi. Atam onun heç olmasa şəklini görmək istədiyini yazmışdı. Amma, o hələ heç ayaq üstə dura bilmirdi.

Əvvəl yazdığım kimi Mürsəl müəllimin kiçik qardaşı Əli dayı ilə qonşu idik. Mürsəl müəllim onlara ara-sıra gəlirdi. Elə oldu ki, həmin günlərdə Mürsəl müəllim ora gələndə anam ona məsələni danışdı. Çoxlarınız bilir ki, Mürsəl müəllimin ikinci silahı (onun birinci silahı qələmi, ikincisi isə foto aparatı idi) həmişə çiynində asılı olardı. O, dedi ki, uşağı gətirin. Qardaşımı Əli dayıgilin həyətində bir stulun üstünə qoydular. Yıxıldı dayana bilmədi. İstəyirdi ki, onu tək çəksin. Nə isə uşağı tutdular və Mürsəl müəllimin komanda verdiyi anda anam çəkildi və Mürsəl müəllim o anı tutdu və çəkdi. O şəkil bu gün də öz heyfiyyətini itirməyib. Sanki bu gün çəkilib.

Əziz oxucu, məsələ şəkil çəkməklə bitmir. Mənim atam fəhlə, anam isə süpürgəçi idi, yəni vəzifə sahibləri deyildilər. Amma, Mürsəl müəllim isə bir rayon qəzetinin redaktoru idi.

Sonralar mən hərbi xidmətə getdim, qayıdanda da Bakıda qalıb oxudum. Bu arada Mürsəl müəllimlə bir əlaqəm olmadı.

Rayonumuzun işğalından sonra Bakıda məskunlaşdıq. Hərəmiz bir yerə səpələndik. Mürsəl müəllim təqaüddə idi, amma, yenə qələmi əlindəydi.

Bakıda məskunlaşdığımız dövrdə itən yurdlarımızın həsrəti hamımız kimi məni kövrəltdi. İndi hər daşın, hər çınqılın həsrətini çəkirdik. Dostdan, tanışdan rayona aid foto şəkilləri soraqlayıb toplayırdım. Bakıda olanda öyrəndim ki, rayonumuzdan, xeyli sayda elm adamları, elmlər namizədləri, elmlər doktorları, professorlar var. Mürsəl müəllim rayonda olanda yeni ad alan, müdafiə eləyən hər bir zəngilanlı barədə qəzetdə yazı verərdi. O adamların, yəni elm adamlarıınn bir qismini mən onun yazıları vasitəsi ilə tanıyırdım. Başladım bunları axtarmağa. Məqsədim bunlardan bir kitab yazmaq idi. Bakıda olanda həmişə məni itən ellərimizin, yurdlarımızın dərdi düşündürürdü. Deyir itən yerin qədri yeni yurdda bilinər.

Mən başladım onları arayıb axtarmağa. Xeyli adamlarla tanış oldum. Onlar barədə materiallar hazırladım və kitabı çapa ver-

məzdən əvvəl bir gün bir tanışımla getdim Mürsəl müəllimdən məsləhət almağa. Yazılara baxdı və dedi ki, bunları haradan tapmısan. Mən Zəngilanda bu qədər alim olduğunu bilmirdim.

Bundan əvvəl mən Məzahir həkimə dedim ki, Mürsəl müəllimin bir şəklini və tərcümeyi halını mənə alıb gətirərsənmi?. O da sağ olsun bunları operativ surətdə hazırlayıb gətirdi. Məqsədim onun haqqında da, kitabda məlumat vermək idi, çünki qarşıdan Mürsəl müəllimin anadan olmasının 75 illik yubileyi gəlirdi.

Mürsəl müəllimə dedim ki, istəyirəm bu kitaba bir ön söz yazasınız. O, bunu inkar elədi və səbəbini də belə izah etdi. Dedi ki, yazardım, amma orada mənim haqqımda da məlumat verildiyindən bu yaxşı çıxmaz. Mən onu anladım və həqiqətən də düz deyirdi. Amma Mürsəl müəllim kitab çap olunandan sonra «Zəngilanın səsi» qəzetində qəzetin yubileylərindən birində (yadımda deyil deyəsən, qəzetin nəşrə başlamasının 65 illik yubileyi idi) geniş bir məqalə ilə çıxış etmişdi. Orada o qəzetin əməkdaşlarından, həvəskar yazarlardan söhbət açırdı. Orada bu kitab barədə belə bir kiçik həcmli məlumat verimişdi ki, Əli Sobulunun qaçqınılq dövründə nəşr etdirdiyi «Zəngəzurun Zəngilanlı Ziyalıları» kitabını Zəngilanın kiçik ensiklopediyası adlandırmaq olar. Bu mənim üçün ən böyük mükafat idi.

Bundan bir neçə ay əvvəl mən topladığım materallardan gördüm ki, Sültan Vəliyevin və Ziyad Təhməzovun may ayında 75 illiyidi. Bununla əlaqədar həmin yazıları şəkillə birlikdə «Qanun keşiyində» qəzetində çap elədim. Məqsədim may ayında bunu zəngilanlılara çatdırmaq idi, çünki kitabın nəşri hələ uzana bilərdi. Mən həkimin (Sultan Vəliyevin) yubileyi barədə İcra Hakimiyyətinə də məlumat verdim. Mənim bu yazımdan sonra rayon rəhbərliyi həkimin yubileyini keçirmək qərarına gəldi.

Bir gün gördüm ki, həkimin yubileyinə İcra hakimiyyətinin məsul işçilərindən biri bəzi yoldaşları dəvət edir. Soruşdum ki, mən də gələ bilərəmmi? O da bir başa dedi ki, yerin pulunu versən, gələ bilərsən. Mən də nə dedilər çıxarıb verdim.

Həkimin yubiley tədbiri Xətai metro stansiyasının yaxınlığındakı bir restoranda keçirililəcəkdi. Həmin gün bir qrup yol-

daşlarla ora yollandıq. Restoranın qarşısında xeyli adam var idi. Yaxınlaşanda gördüm ki, Mürsəl müəllim qapının ağzında stulda oturub. Yanında da bir boş stul da var idi. Nədənsə orada kimsə oturmayıb, hamı ayaq üstə «bəyi» gözləyirdi. Yaxınlaşıb əvvəl Mürsəl müəllimlə görüşdüm. O əlimi buraxmadan belə dedi::

-Gəl yanımda otur, indi həkim gələcək.

Mən etiraz etmədim və onun yanında bir- iki dəqiqə oturub sonra ayağa qalxdım.

Mürsəl müəllimlə bağlı daha bir məsələni deməliyəm. Deməsəm olmaz.

1984-cü ildə Bakıdan rayona qayıtmalı oldum. Rayona gəlib hərbi və pasport qeydiyyatına düşdüm və iş üçün o zaman hər şeyi həll edən rayon Partiya Komitəsinə üz tutdum. Əvvəl ərizə ilə müraciət etdim. Katibin qəbuluna girmək isə müşkül məsələ idi. Nə isə, bir neçə dəfə şəxsən birincinin qəbulunda olsam da, yanındakılara tapşırıq versə də, mənə kimsə iş vermədi. Açığını deyəcəyəm şirinliyi də əlimdə idi.

Aylar keçir, xəbər yox. Qeyd etdiyim kimi atam fəhlə, anam isə xidmətçi idi. Artıq 30 yaşım, ailəm və uşağım var. Üç nəfər bir ailədi. Sovet zamanında üç nəfər bir yerdə olanda bir təşkilat yaradırdılar.

Döymədiyim qapı qalmadı. Aylar keçirdi. Düz səkkiz ay işsiz qaldım. Üzr istəyirəm adam evdə ailəsinin üzünə baxa bilmir. Bilirsiniz də, gizləməyin nə mənası, qadın bir şey istəyir ala bilmirsən, uşağa bəzi şeylər lazım olur, pul yoxdu. Nə etməli? Tək yeməklə məsələ həll olmur ki.

Məni bir tikinti idarəsinə yolladılar. Getdim. Baş mühəndislə görüşdüm. Məni tanıyırdı əslən bizim kənddən idi, o İsfəndiyar Məmmədov idi. Dedi, qohum axı, burada sizə nə iş vermək olar. Bir müdir var, bir də ki, kadrlar şöbəsi. Orada da işləyən var. Fəhlə işləyəcəksən? Dediyində haqlı idi. Dedim bunları mən də bilirəm. Amma, gəlməsəydim deyəcəkdilər ki, iş verdik getmədin.

Bir gün eşitdim ki, Mürsəl müəllim rayon Partiya Komitəsinə gedib və orada mənƏ niyə iş vermirlər deyə, məsələ qaldırıb. Eşitdiyimə görə təxminən belə bir ifadə işlədib:

-Bu adama (Əli Cümşüdlyə) niyə iş vermirsiniz? Atası ən ağır işlərdə işləyir, özü ailəlidi, südəmər uşağı var. Gələcəkdə tarix sizi bağışlamaz.

Əziz oxucu. Bizim hamımızın yaxın-uzaq qohumları var. Lap elə əmi-dayı olsun. Bəzən onlara belə bir məsələ barədə xahiş edəndə tanışları belə olsa, sənin sözünü yuxarı təşkilatlarda demirlər. Bu kişi isə mənim xəbərim olmadan, mən ona heç nə demədən mənim üçün gedir iş tələb edir. O heç öz oğlu Məzahir həkim üçün belə yuxarılara ağız açmayıb.

Bunu unutmaq olmaz. İstədim ki, hamımız Mürsəl müəllimi yaxşı tamıyaq.

Bu Mürsəl müəllimdə olan müsbət keyfiyyətlərin mində birindən biri idi.

**Hacı Əli Sobulu**

## Qəzet Səhifələrinə Səpələnmiş Ömür

***Məsaim Abdullayev,*** «***Xalq qəzeti***»

Bu ilin yazında Azərbaycan mətbuatının 125 illiyinə həsr olunmus silsilə yubiley tədbirləri oldu. Hər dəfə xeyli alim, jurnalist, tədqiqatçı, hətta siyasətçi toplaşır, milii mətbuatın məziyyətlərindən danışır, bugünkü qəzet və jurnalların, elektron KİV-lərin problemlərini çözələyirdilər. Bəzən söhbət əyalət qəzetlərinin problemlərindən də düşürdü.

Belə tədbirlərdə gözlərim ömrümün 40 ilindən çoxunu Zəngilanda qəzet işinə həsr etmiş, uzun müddət bu rayonda çıxan «Kənd həyatı qəzetinin redaktoru olmuş 75 yaşlı Mürsal Qocayevi çox arayırdı. Ürəyimdən çox şey keçdi... Dedim, bəlkə onu dəvət etməyiblər, ya xəstədir, gələ bilmir. Hər halda Mürsəl müəllimin yəqin ki, sinəsində deməyə sözü çox idi və M.Qocayev həm də heç vaxt söz xətrinə söz demir. Hər dəfə ağıllı söz deyir, düşündürən söz deyir.

Bir neçə gün bundan qabaq Bakının Nərimanov metrosu yaxınlığında adi, solğun bir binaya sığınan Zəngilan rayon icra

hakimiyyətində jurnalist Salam Cavadovla görüşdüm. Əlbəttə, birinci Mürsəl Qocayevdən hal-əhval tutdum.

“Səhhəti pis deyil, — dedi. Bu yaxınlarda qəzetin bir nömrəsini onun 75 illik yubileyinə həsr etdik.»

Bizim söhbətimizə qoşulan Zəngilan rayon icra hakimiyyəti aparatının şöbə müdiri Maya Həsənova isə dedi ki, rayon rəhbərliyi Mürsəl müəllimin yubileyini bir qədər əvvəl keçirmək istəyirdi, o, buna qəti razılıq verməyib. Söyləyib ki, Allah qoysa, mənim yubileyimi Zəngilanın yuxarı başındakı o hündür parkda keçirərik.

Əlbəttə, yubileyi necə və harada keçirmək yubilyarın öz imtiyazıdır. Amma mən fikirləşdim ki, Mürsəl Qocayev üçün heç olmasa bir çay süfrəsi düzəltmək olardı. Çünki o, Zəngilanın çox böyük ziyalı dəstəsinin yetişməsində xeyli zəhməti olan bir insandır.

Qəzetin həmin yubiley nömrəsini mənə də verdilər. Mən oradakı təbrikləri, ürək sözlərini hələ oxumazdan əvvəl bugün erməni əsarətində qalan Zəngilana xəyalən səyahət etdim. O yerləri çox vaxt Mürsəl müəllim ilə birlikdə gəzdiyim üçün sanki yenidən qocaman redaktor mənə bələdçilik edirdi.

Zəngilana gələn hər bir jurnalist mütləq Mürsəl Qocayevə baş çəkərdi.  Əvvəla, o rayonu çox yaxşı tanıyırdı, hər şey haqqında geniş məlumatı vardı, ən başlıcası bu yerlərin təbiəti, maraqlı, xeyirxah insanları haqqında, respublika mətbuatı üçün yazı hazırlanmasına həvəslə kömək edərdi.

Redaksiyanın köhnə bir Villisi vardı. Rayon qəzetinin əməkdaşlarını, Bakıdan gələn qonaqları gəzdirən maşın Zəngilanın dağ kəndlərinin daş- kəsəkli yollarında o qədər sınıb-qalmışdı ki... Amma kəndlərə, camaatla görüşməyə getməkdən nə Mürsəl müəllim, nə də çox vaxt onun yanında əyləşən fotojunıalist Zakif usanardı...

Rayon qəzeti dövrün, zamanın nəbzi ilə yaşayırdı. Təcrübəli redaktor kollektivdə çox işgüzar mühit yaratmışdı. Müxbirlər yazı-pozudan doymurdular.

Qəzetdə tənqidi yazılar da çox olurdu. Çox kəskin, yerinə düşməyən cümlələri Mürsəl müəllim müəllifin razılığı ilə bir az

yumşaldardı. O, gənc müxbirlərə bir ata kimi nəsihət verərdi:

— Biz heç kimi təhqir edə bilmərik, bir az bu yazının istiotunu azaldaq. Onsuz da söz sahibi öz payını alacaq.

Elə belə də olurdu. Ölçülü- biçili tənqidi söz daha çox təsirli olurdu. Tənqid olunanlar da qəzetdən çox vaxt gileyli qalmırdılar. Bilirdilər ki, Mürsəl Qocayevin redaktor olduğu qəzetdə qərəzçilik, sifarişli yazılar ola bilməz. Çünki Mürsəl müəllim dünyanın ən tamahsız, təmiz adamlarından biri idi.

70-ci illərdə Zəngilanda böyük sosial-iqtisadi quruculuq işləri gedirdi. Uzun müddət geridə qalmış bu dağ rayonu sanki bir inkişaf marafonuna qoşulmuşdu. Rayon mərkəzində, ucqar kəndlərdə çoxlu məktəb, xəstəxana binaları tikilir. yaşayış evləri ucaldılır, yollar salınırdı. Zəngilanı tanımaq olmurdu. Rayon mərkəzi gündən-günə gözəlləşirdi.

Mürsəl Qocayev bütün bunları görüb çox sevinirdi. O, həmin illərdə rayon qəzetlərində redaktor işləyən əksər həmkarlarından fərqli olaraq özü də qələmi yerə qovmurdu, çoxlu maraqlı oçerk və reportajlar yazırdı. M. Qocayevin o vaxt Zəngilan rayon partiya komitəsinin birinci katibi işləyən Muradxan Cabbarov ilə çox vaxşı dostluq münasibətləri vardı. Amma qəzet redaktoru bütün məsələlərdə öz prinsipial mövqeyində qalırdı. Rayon rəhbəri də bundan incimirdi, əksinə, jurnalistlərin haqlı iradlarını müdafiə edirdi.

Zəngilan ən ucqar rayon idi. Bakıdan jurnalistlər bura az gələrdilər. Amma rayonda, xüsusilə o vaxt “Kənd həytı redaksiyasında hər bir jurnalistin gəlişinə çox sevinirdilər. Mürsəl müəllim Bakıdan gələn jurnalisti buradakı ziyalı ab-hava- sından sorğu-sual edirdi. Yaşlı müxbirlərin adətən Zəngilanda dostu-tanışı çox olurdu. Amma gənc, təcrübəsiz müxbirləri M. Qocayev öz himayəsinə götürərdi. Onların hər birinin qayğısına qalardı. Xüsusilə, Muradxan müəllim rayonda olmayanda, Bakıdan gələn qonağa hamıdan çox Mürsəl müəllim həyan durardı. Mən dəfələrlə onun sadə, bəzəksiz-düzəksiz, amma çox səliqəli mənzilində Mürsəl müəllimin həyat yoldaşı Xavər xanımın bişirdiyi dadlı plovlara qonaq olmuşam.

Mürsəl müəllimin qonağa göstərdiyi yeganə "var-dövləti" onun qəzet müxbiri, sonra isə uzun müddət redaktor işlədiyi dövrdə respublikanın tanınmış şair və yazıçıları, ziyalılar ilə birgə çəkdirdiyi foto şəkillər idi. O, böyük həvəslə Süleyman Rəhimov, Əli Vəliyev, Hüseyn Arif və başqaları ilə çəkilən şəkilləri göstərir, bu əvəzsiz insanlarla bağlı xatirələrini həvəslə danışırdı.

Mürsəl müəllimin Vətənli -xoşbəxt günlərində bir şakəri də vardı. O bütün qonaqlarını redaksiyanın həmin o, köhnə Villisində mütləq Zəngilandakı Çinar meşəsinə aparardı.

Çox geniş bir sahəni əhatə edən, unikal bitki örtüyü, rəngarəng faunası ilə öyünən bu meşə dövlət qoruğu elan olunmuşdu. Mürsəl müəllim azman, köklü-köməcli iri çinarların başında oynaşan buludları seyr etməkdən yorulmurdu. Sonra o bu meşədəki əksər bulaqlardan bir ovuc su içirdi...

Zəngilan işgal olunandan bır neçə ay sonra, 1993-cü ilin soyuq bir payız günü mən "Azərbaycan" nəşriyyatında Mürsəl Qocayevlə rastlaşdım. Əlbəttə, zahirən hiss etdirməyə çalışmasa da, onun gözlərində böyük, kədərli bir niskil vardı. Birdən mənə elə gəldi ki, Mürsəl Qocayev Zəngilanın Çinar meşəsində gördüyüm o azman çinarlardan biridir. İndi bu qocaman ağacın, yenidən başqa torpağa, iqlimə, suya uyğunlaşması, əlbəttə, çətindir. Amma dözmək lazımdır.

Mürsəl müəllim də dözür. Təəssüf ki, son vaxtlar biz onunla çox az zəngləşirik. Bəlkə mən onu yenidən həyəcanlandırmağa cürət etmirəm. Bəlkə də güzəran qayğıları bizi üstələyir. Bütün hallarda başa düşürəm ki, mən həm Mürsəl Qocayevə, həm də onunla bir yerdə 50 il ömür sürən Xavər xanıma çox borcluyam... Çox istəyirəm ki, Mürsəl müəllim yenidən doğma Zəngilana qayıtsın.

## YARADICILIĞI

# DÜNYA SƏNDƏN KİMLƏR KEÇDİ
### Nurlu simalar

***Liman kimi Qalıb dəniz arxasında tələbəlik illərimiz.***
***Duman kimi Can atsaq da o illərə,***
***Çatmaz daha əllərimiz. Çatmaz... Ancaq***
***Qəlbimizi, ruhumuzu alıb bizim,***
***O illərdə neçə–neçə xatirəmiz qalıb bizim...***

Hər dəfə Azərbaycan Pedaqoji Universitetinin binasının yanından keçəndə istər–istəməz Tofiq Mahmudun bu misraları yadıma düşür və yarım əsr əvvəl bir çox həmyaşıdlarımla bərabər onun divarları arasında keçən dörd illik tələbəlik illərinin rəngarəng xatirələri qəlbimi kövrəldir. Həmin xatirələr ən çox əziz müəllimlərimizlə bağlıdır...

Hər dəfə onun yanından keçəndə filologiya elmləri doktoru, professor, dünya ədəbiyyatını tədris edən müəllimimiz Əli Sultanlının təbəssümlü çöhrəsi, təmkinli yerişi, mühazirə oxuyarkən nurlu siması gözümün qarşısında canlanır, oxuduğu mühazirələr isə sanki qulağımda səslənir.

Onun qədim yunan və orta əsr Azərbaycan ədəbiyyatı korifeyləri haqqında oxuduğu mühazirələri elə heyranlıqla dinlərdik ki, dərs saatının necə başa çatdığını nəinki hiss etməzdik, hətta buna təəssüflənərdik.

Əli Sultanlının alimlik və pedaqoji fəaliyyətinə, mənəvi keyfiyyətlərinə ömrünün bu zirvələşən məqamından nəzər salanda onun necə nurlu şəxsiyət olduğunu daha dərindən dərk edir və tələbəsi olduğum üçün qürur hissi keçirirəm.

Adətən, tələbə öz müəllimindən nümunə götürməyə çalışır. Biz də səy edərdik ki, kaş onun kimi müəllim ola biləydik. Əli müəllim öz ixtisasını mükəmməl bilməklə yanaşı, həm də onu yüksək səviyyədə tədris edirdi. Biz Homer, Esxil, Evripid, Şeks-

pir, Servantes, Rable, Bualo, Molyer, Bokkaçio dünya ədəbiyyatının bir çox başqa görkəmli simalarının yaradıcılığı haqqında ilk bilikləri məhz ondan almışıq. O zaman belə sənətkarların dilimizə tək–tək əsərləri tərcümə olunurdu. Onları da tapmaq çətin idi. Belə ki, əlifba təzə dəyişildiyi üçün o zaman yeni kitab yox idi. Köhnə əlifbanı da bilmirdik. Rus dilində də orta səviyyədə belə danışıb oxumağı bacarmırdıq. Buna görə də Əli müəllimin mühazirələri bizim üçün yeganə mənbə idi.

Sonralar bir sıra əsərlər tərcümə olunanda biz onları da maraqla oxuyurduq. Bu marağı isə bizdə məhz Əli müəllim oyatmışdı. Bu kitabları oxuyandan sonra bir daha dərk edirdik ki, o necə dolğun mühazirələr oxuyurmuş. Onları indi də unutmamışıq.

Cəfər Xəndan bizə XIX və XX əsr Azərbaycan ədəbiyyatından mühazirələr oxuyurdu. M.Axundov, C. Cabbarlı, C. Məmmədquluzadə, Sabir, S. Əzim, Ə. Haqverdiyev, N.B. Vəzirov, A. Səhhət və başqalarının yaradıcılığı, onların ədəbiyyatımızın tarixi ənənələrini davam və inkişaf etdirməkdə rolları haqqında oxuduqları mühazirələr bizi son dərəcə razı salardı.

C.Xəndan müharibə dövründə İranda olmuşdu. Bəzi İran Azərbaycan yazıçı və şairləri, xüsusən Mirzə Əli Şəbüstəri haqqında ilk məlumatı bizə o verdi. Sonralar onun Şəbüstəri haqqında bir sıra məqalələri dərc olundu. Halbuki o vaxtlar həmin yazıçılar haqqında söz–söhbət açmaq o qədər də asan deyildi.

Pedaqoji İnstitutda təhsil almış yaşlı nəsillərin nümayəndələri Əhməd Seyidovu ehtiramla xatırlayırlar. Pedaqoji elmlər doktoru, professor, əməkdar elm xadimi, Azərbaycanın böyük maarifçisi Ə. Seyidov həm də işgüzar bir təşkilatçı idi. APİ–nin rektoru kimi respublikamızda pedaqoji kadrların hazırlanmasında onun böyük xidmətləri olmuşdur. O bizə pedaqogika tarixindən dərs deyərdi. Tələbələrə qarşı çox qayğıkeş və həssas bir pedaqoq idi. Tez–tez yataqxanaları, auditoriyaları gəzər, tələbələrin təhsili və məişəti, müəllimlərin isə mühazirələrinin keyfiyyəti ilə maraqlanardı. Bir gün gözlənilmədən Əhməd müəllim auditoriyaya daxil oldu. Təsadüfə bax ki, həmin gün Qabilin L. Tolstoyun «Hacı Murad» povesti haqqında referatının müzakirəsi keçirilirdi. Biz elə güman

etdik ki, o bura qəsdən gəlib. Buna görə çox narahatçılıq keçirdik. Qabilin isə referatını oxumağa başı elə qarışmışdı ki, onun auditoriyaya gəlməsindən xəbəri də olmadı. Əhməd müəllim elə ayaq üstə bir–iki dəqiqə onu dinlədi və sonra keçib əyləşdi. Referatı axıradək dinlədi. Razılıq hissini onun çöhrəsindən sezmək olurdu. Atalar yaxşı deyib ki, mal bir yerə, güman min yerə. Biz nə düşünürdük, nəyə şahid olduq.

Qabil referatı çox səviyyəli yazmışdı. Əhməd müəllimin də diqqətini cəlb edən məhz əsərin dolğun təhlili olmuşdu. O, institutda belə bir istedadlı tələbənin olmasını sanki kəşf etmişdi. Buna görə Qabilin referatından çox məmnun olduğunu bildirib ona uğurlar arzulayıb getdi. 1950–ci ildə Qabilin «Səhər açılır» adlı kitabı çapdan çıxanda çox sevindik. Bu, gələcək xalq şairinin həqiqi yaradıcılıq səhərinin açılmasının rəmzi idi.

Fakultəmizin dilçi müəllimləri elmlər doktoru, professor M. Şirəliyev, Ə.Dəmirçizadə, filologiya elmləri namizədləri Z.Tağızadə, İ.Əfəndiyev, fars dili müəllimi M.Cavad, rus ədəbiyyatı müəllimi akademik Məmməd Cəfər, psixologiya müəllimi fəlsəfə elmlər doktoru, əməkdar elm xadimi Zəkizadə Əhməd Kərədi, pedaqogika müəllimi Mərdan Muradxanov, Zümrüd xanım Daşzadə, klassik Azərbaycan ədəbiyyatı müəllimi İ.Babayev elə böyük şəxsiyyətlər idi ki, nə elmi səviyyələrinə, pedaqoji ustalıqlarına, nə də mənəvi xüsusiyyətlərinə görə onları bir–birindən ayırmaq mümkün deyildi.

Təhsil aldığımız 1944–48–ci illərdə iqtisadi vəziyyət indikindən qat–qat ağır olduğundan nəinki tələbələr, hətta müəllimlər də böyük ehtiyac içərisində idi. Ancaq onlar bunu tələbələrə hiss etdirmir, həm də çox vicdanla, ilhamla mühazirələr oxuyar, bizi yüksək səviyyəli müəllimlər kimi yetişdirmək üçün səylərini əsirgəmirdilər. Bu da bizim onlara məhəbbətimizi artırardı. Həmin günlərdən yarım əsrə qədər vaxt keçmişdir. Onların hamısı öz dünyalarını dəyişmişdir. Dərs dedikləri tələbələrə isə respublikamızın hər guşəsində rast gəlmək olar. Ən kiçik yaşda olanımız 70-i haqlayıb. Ancaq gənclik illərimizin qayğıları, arzuları ilə bağlı olan bu nurlu simaların bizə aşıladıqları hisslər ömür yolu-

muzun həmişə bələdçisi olmuşdur. Bu gün isə sanki onların ruhu bizi izləyir, bizi inamlı, qətiyyətli, tədbirli, kədərli məqamlarda isə səbrli, təmkinli, dözümlü olmağa çağırır.

## NƏ ÖMRƏ ACIYIR, NƏ YAŞA DÜNYA...

Hələ orta məktəbdə Səmədin şerini böyük məhəbbətlə oxuyar və onu əzbərləməkdə yarışardıq. Yenicə tamaşaya qoyulmuş «Vaqif» pyesini isə az qala əzbərdən bilirdik. O vaxt uşaqlara məxsus bir maraq və həsrətlə öz–özümə düşünərdim ki, görəsən, Səməd Vurğunu görə biləcəyəmmi? Uzaq bir dağ kəndində o zaman bunu heç xəyalıma da gətirə bilməzdim.

1941–ci ildə Bakıya texniki–peşə məktəbinə göndərildim. Nəhayət, arzuma çatacağıma sevinirdim. Ancaq bu xoş təsadüf nə vaxt düşəcək, bilmirdim. O vaxt «Vaqif» pyesi çox böyük müvəffəqiyyətlə nümayiş etdirilirdi. Müharibə getməsinə baxmayaraq, tamaşa zamanı teatrın salonunda boş yer olmazdı. Sonra «Fərhad və Şirin», «Xanlar» dramları tamaşaya qoyuldu. Hər dəfə S. Vurğunu görmək ümidi ilə gedərdim. Amma onu görmək şərəfinə APİ–nin 2 kursunda oxuyanda nail oldum.

Eşitmişdik ki, S. Vurğun «İnsan» adlı bir pyes yazır. Nəhayət, 1945–ci ildə noyabrın 7–də əsərin ilk tamaşası haqqında afişalar vuruldu. Bilirdik ki, adətən, ilk tamaşalarda müəllifin özü də iştirak edir. Sevinirdik ki, ilk tamaşada S. Vurğunu görə biləcəyik. Çox təəssüf ki, ilk tamaşaya getmək mümkün olmadı.

Bir neçə gündən sonra dedilər ki, həmin pyesin disputu keçiriləcəkdir. Məruzəçinin bizim müəllimimiz Məmmədcəfər Cəfərovun olması da lap yerinə düşmüşdü. Çünki onun köməyi ilə biz «İnsan» pyesinin müzakirəsində iştirak etmək imkanı qazandıq.

...Yoldaşlarım kimi mən də gözümü Səməddən çəkmirdim. Şairin ən kiçik hərəkətini belə gözdən qaçırmamağa çalışırdım. Əsərlərini xatırladıqca öz–özümə düşünürdüm ki, doğrudanmı, bunlar başqalarından heç nə ilə fərqlənməyən, hətta onlardan da sadə görünən bu adamın qələmindən çıxmışdır?!

Rəsmi açılışdan sonra söz Məmmədcəfər Cəfərova verildi. O, öz məruzəsini mükalimə formasında qurmuşdu. Rayondan Bakıya gələn bir nəfər şəhərin ictimai–ədəbi mühiti ilə tanış olur. Həmçinin «İnsan» tamaşasına baxır. O qayıdarkən öz müsafir yoldaşı ilə fikir mübadiləsi edir və «İnsan» haqqında mülahizələrini söyləyir. Tənqidçi bu ədəbi priyomla da özünün əsər haqqında fikrini ümumiləşdirir.

***Söylə, nələr deyir bizə istiqbal,***
***Qalib gələcəkmi cahanda kamal?***

Bu sual əsərin baş qəhrəmanı filosof Şahbazı düşündürür və ona cavab tapmağa çalışır. Tənqidçi də öz ümumiləşdirmələrində göstərirdi ki, bu fəlsəfə XVIII əsr fransız maarifpərvərlərinin fəlsəfəsidir. XX əsrin fəlsəfəsi bu suala artıq cavab vermişdir. İstiqbala ancaq inqilabi yolla nail olmaq mümkündür. Məruzəçinin iddiasından aydın olurdu ki, əsər fəlsəfi cəhətdən idealizm mahiyyəti daşıyır.

Doğrusu, heç gözləməzdik ki, Səməd Vurğunun əsəri ədəbi–tənqid tərəfindən belə qarşılana bilər. Səmədin məruzəyə və çıxışlara münasibətini intizarla izləyirdik. O, bu tənqidi qeydlərə, iradlara özünəməxsus bir təmkinlə cavab verirdi...

Müzakirədən hamı bir növ süst vəziyyətdə çıxdı. Əsər sonra oynanılmadı, ancaq Səməd elə həmin Səməd idi. Xalq onun poeziyasını sevə–sevə oxuyur, pyeslərinin tamaşasına tükənməz bir maraqla gedirdi.

1946–cı ildə APİ–nin 25 illiyinin qeyd edilməsinə hazırlıq gedirdi. Vaxtilə onun yetirmələri olan görkəmli şəxsiyyətlərlə görüşlər keçirilirdi. Belə görüşlərin biri Səməd Vurğunla oldu. APİ–nin iclas salonunda nəinki oturmağa, hətta ayaq üstə durmağa belə yer yox idi. Rəsmi çıxışlardan sonra söz Səmədə verildi. Alqış sədaları uzun müddət kəsilmədi. Axırda o özü dilləndi: – Belə getsə, şeir deməyə vaxt qalmayacaq.

Salona sükut çökdü. Şair APİ ilə bağlı xatirələrini danışandan sonra yeni şeirlərini oxumağa başladı. Az qala onun hər misrası

alqışlarla qarşılanırdı. Bu zaman biz böyük şairə – Səmədə, necə deyərlər, doyunca baxdıq. Bu görüş onun iştirakçısı olan tələbələrlə bərabər mənim də qəlbimdə şirin xatirə kimi yaşamaqdadır.

1956–cı ildə martın 22–də Səməd Vurğunun 50 yaşı tamam olurdu. Yanvarın 23–də ilk dəfə olaraq Azərbaycanın «Xalq şairi» fəxri adı təsis olundu və bu ad birinci dəfə ona verildi. Səməd xəstə olduğu üçün yubiley yığıncağının nə vaxt keçiriləcəyi hələ məlum deyildi. Respublikamızda hamı onun səhhəti ilə maraqlanırdı. Ancaq onun yanına müntəzəm gedib–gələnlər deyirdilər ki, onun səhhəti hələ yaxşılaşmır. Nəhayət, şairin yubiley gecəsi mayın 12–nə təyin olundu. O zaman rayon qəzeti redaktorlarını seminara çağırmışdılar. Fürsətdən istifadə edib yubiley yığıncağında iştirak etmək üçün biz də dəvətnamə ala bildik.

Opera və Balet Teatrında iynə atsan, yerə düşməzdi. Qonaqlar, yubiley komissiyasının üzvləri iş heyətində yerlərini tutdular. Şairin qardaşı Mehdixan görünəndə zala dərin sükut çökdü. Hamının qəlbi gizli bir kədərlə döyünürdü. Deməli, Səməd Vurğunu bundan sonra görmək daha heç kimə nəsib olmayacaqdır. Bu an ürəklərdə onun «Nə ömrə acıyır, nə yaşa dünya. Biz gəldi gedərik, sən yaşa, dünya»kimi neçə–neçə hikmətli misraları dolaşırdı.

Təntənəli yığıncağı Azərbaycan Yazıçılar İttifaqı İdarə Heyətinin sədri S.Rəhimov açdı. Məruzə üçün söz Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin sədri M.İbrahimova verildi. Onun Səmədin həyat və yaradıcılığı, bütünlükdə ədəbiyyatımızdakı xidmətləri haqqında geniş məruzəsi böyük diqqətlə dinlənildi.

Müxtəlif xarici ölkələrdən, respublikalardan gəlmiş nümayəndələrin, habelə respublikamızın müxtəlif peşə sahiblərinin çıxışları hərarətlə və sürəkli alqışlarla qarşılanırdı. Hamı böyük sənətkara olan sonsuz məhəbbətini məhz uzun sürən alqışlarda ifadə etdirirdi.

Budur, söz şairin qardaşı Mehdixana verilir. O, şairin yığıncaq iştirakçılarına yazdığı məktubu oxuyarkən alqış sədaları az qala salonu titrədirdi: «Əziz oxucular! Mən bugünkü məclisdə müvəqqəti səbəbə görə iştirak edə bilmirəm. Lakin gözüm gözünüzdən uzaq olsa da, könüldən–könülə yollar görünür.

Sağ olun! Hamınıza dünyanın ən şirin neməti olan can sağlığı arzu edirəm! Ümidvaram ki, yaxın gələcəkdə mübarizə meydanında görüşərik...»

Bu sözlərdən bütün zaldakılar kövrəlmişdi. Dillərdə alqış, ürəklərdə isə kədər! Çoxlarının yanaqlarında yaş gilələri görünürdü. Yubiley gecəsi nə qədər təntənəli keçsə də adamlar buradan böyük qəm yükü ilə çıxdılar. Yubiley yığıncağının doğurduğu təəssürat onun iştirakçılarını bu gün də çətin ki tərk etmiş olsun. Mən isə bu sətirləri yazarkən həmin anları yenidən yaşamış oldum.

Təəssüf ki, özü arzuladığı kimi, şairə mübarizə meydanında yenidən görünmək nəsib olmadı. Təntənəli yubiley yığıncağından düz 15 gün sonra mayın 27–də onun ürəyi döyünməkdən əbədi qaldı.

Dağ uzaqdan əzəmətli görünür. Zaman keçdikcə Səmədin ilhamlı poeziyası da bizə daha əzəmətli görünəcəkdir. Bu poeziya çözün tam mənasında xalqın qəlbi və ruhudur. Buna görə də böyük el məhəbbəti ona sağlığında nəsib olmuşdur. Özü haqqında bu misraları deməyə elə sağlığında da mənəvi haqq qazanmışdır:

***Məni yelkən kimi qərq etsə də dəryada zaman,***
***Vurğun öldü deməyin, bir əbədi sənəti var.***

## SÜLEYMAN ALƏMİ, SÜLEYMAN QƏLƏMİ

**Avtoqrafların birində «dəyişməz və sədaqətli, mənəvi dostlarından biri» kimi qiymətləndirdiyi veteran jurnalist Mürsəl Qocayev xalq yazıçısı Süleyman Rəhimovun ailə üzvləri, bir çox qohumları ilə müntəzəm münasibətdə olmuş, özü ilə dəfələrlə rəsmi və qeyri–rəsmi tədbirlərdə iştirak etmiş, onun yaradıcılığını ardıcıl izləmişdir. Xalq yazıçısının anadan olmasının 96–cı ildönümü ilə** əlaqədar olaraq onun görüş təəssüratlarını «İki sahil»in bu günkü sayında dərc edirik.

Uşaqlığın maraq dünyasının həddi–hüdudunu təsəvvür etmək çətindir. Nələr arzulamır, nələr düşünmür... Ömür zirvələşəndə

belə adam öz uşaqlıq, yeniyetməlik dünyasını həyəcansız xatırlaya bilmir. Məni bu gün kövrəldən belə xatirələrdən biri Süleyman Rəhimovla bağlıdır.

Onun adını ilk dəfə otuzuncu ilin ortalarında IV sinifdə oxuyarkən ilk müəllimlərindən biri, həmkəndlisi Bəhlul Rəcəbovdan eşitmişdim. Deyirdi ki, rayonumuzda yazıçılıqla məşğul olan ilk adamdır. Hekayələr yazır. Onun «Şamo» adlı romanı da vardır. Onu görmək arzusu da qəlbimdə məhz həmin vaxt baş qaldırmışdı. Ancaq bu arzuya çatmağın mənə nə zaman nəsib olacağını heç təsəvvürümə gətirə bilmirdim.

Otuzuncu illərin sonunda eşitdim ki, Əyin kəndində pioner düşərgəsi açılacaqdır. Buraya ancaq əlaçı uşaqlar göndərilir. O zaman bizim düşərgə haqqında təsəvvürümüz yox idi.

Dərs ilinin sonunda düşərgəyə getməli olan şagirdlər müəyyənləşdi. Bu şərəfin nəsib olduğu şagirdlərdən biri də mən idim.

Əyin kəndi bizim kənddən 90–100 kilometr aralı məsafədə yerləşir. Bir–birinə gediş–gəlişi çox olan kəndlər deyildi. Ancaq mənim bu kənddən olan müəllimim bizim kənddən qız almışdı. Bacısı da bizim kəndli ilə ailə həyatı qurmuşdu. Buna görə də kəndlərimiz arasında əlaqə yaranmışdı. Bu, S.Rəhimova olan marağımı daha da artırmışdı. Məndə belə bir ümid var idi ki, düşərgəyə gedəndə onu görə biləcəyəm. Deyirdilər ki, hər yay ailəsi ilə kəndə gəlir. Buna görə düşərgənin başlanmasını intizarla gözləyirdim.

Nəhayət, 1940 –cı ilin iyul ayında məni düşərgəyə apardılar. S.Rəhimovun özündən başqa, ailə üzvləri buraya yay istirahətinə gəlmişdilər. Uşaqları, xüsusən Oqtay və Şamo tez–tez düşərgəyə gəlib əyləncəli tədbirlərdə iştirak edirdilər. Yaxşı şahmat oynayırdı. Şahmatın ilk gedişlərini də mənə o öyrətdi. Şamo çox mehriban, səmimi, həmyaşıdları ilə ünsiyyət saxlamağı bacaran bir oğlan idi. S.Rəhimov haqqında xatirəmi ona görə Şamo ilə başladım ki, o mənə «Şamo» romanının qəhrəmanı olan adaşı ilə bir rəmzə çevrilmişdi.

Çox təəssüf ki, həmin yay S.Rəhimov kəndə gəlmədi. Ancaq onun atası Hüseyn əmini, qayınatası Şirin əmini, qayınanası Gül-

zar xalanı, ömür–gün yoldaşı Qələm xanımı, bacısı Səriyyəni, baldızları Şüşəni, Zərifi, Azadəni, bacanağı İsmayıl müəllimi, qayını Əliheydər müəllimi (pedaqoji elmlər doktoru, professor) və yaxın–uzaq bir çox qohum–əqrəbalarını yaxından tanıdım.

1941–ci ildə məni yenə də düşərgəyə göndərdilər. Bu dəfə Əyinə «köhnə sakin» kimi gəlmişdim. Yenə də ilk arzum S.Rəhimovu görmək idi. O zaman «Şamo»nun yeni çapının birinci cildini oxumuşdum. Öz aləmimdə düşünürdüm ki, romanı oxuduğumu demiş olsam, yəqin məndən razı qalmış olacaqdır. Bu isə mənə əvəzsiz və əziz bir töfhə olardı. Ancaq müharibə düşəndən bir həftə sonra məni bir sıra həmyaşıdlarımla bərabər elə düşərgədən səfərbərliyə alıb Bakıya, texniki peşə məktəbinə göndərdilər.

Bir dəfə Bakıda yaşayan həmyerlilərimizlə görüşdüm. Onunla söhbət edə–edə indiki «Azərbaycan» küçəsi ilə S.Vurğun küçəsinin kəsişdiyi yerdən keçəndə:

– Bax, Süleyman əminin evinin balkonu odur, – deyə əlini altıncı mərtəbəyə tərəf uzatdı. Sonra dəniz istiqamətində bir skamya göstərib:

– Bax, çox zaman bu skamyada oturub dənizi seyr edir, – deyə əlavə etdi.

Bu isə mənə muştuluq kimi oldu. Onu görmək ümidi ilə imkan tapan kimi bura gəlirdim. Nəhayət, 1946 –cı ilin bir bahar günündə neçə illərdən bəri onu görmək arzuma çatdım. Doğrudan da, o həmin yerdə oturmuşdu. Sıxıla–sıxıla ona yaxınlaşıb salamlaşdım və özümü təqdim etdim. Oqtaydan, Şamodan hal–əhval tutdum. Düşərgədə olarkən necə tanış olduğumu söylədim. Ali məktəbdə oxuduğumu eşidib çox məmnun qaldı. Bir sıra tövsiyələr verib:
– Nə çətinliyin olsa, mənə müraciət edərsən, – deyə institutu müvəffəqiyyətlə qurtarmaq üçün mənə xoş arzularını bildirdi.

Onun sadəliyi, göstərdiyi səmimiyyət məni xeyli ruhlandırdı. Fəxr edirdim ki, respublikamızın görkəmli bir sənətkarını görüb tanış olmuşam. Hətta qrup yoldaşlarımın yanında bununla öyünürdüm də!

Sonralar komitə sədri işləyərkən şəxsi işimlə əlaqədar olaraq, APİ–nin 25 illiyi münasibəti ilə keçirilən ədəbi–bədii gecədə

görüşdüm. Küçədə təsadüfən görüşlərimiz də az olmamışdı. İnstitutu qurtarıb Qubadlıya işə qayıdandan sonra elə vaxt olmadı ki, rayona gələndə onunla görüşməmiş olam. Onun anadan olmasının 60 illiyi ilə əlaqədar olaraq Qubadlıda keçirilən bütün görüşlərin iştirakçısı olmuşam. S.Rəhimov əsası Qori seminariyasının müdavimi, Zəngəzurun mütərəqqi ziyalılarından olan Həsən bəyin açdığı Qubadlı rus məktəbində təhsil almışdı. Onun inqilabdan əvvəl oxuduğu həmin məktəbin pedaqoji və şagird kollektivi, habelə keçmiş müdavimləri ilə keçirilən görüşünü çox kövrəkliklə xatırlayıram.

1964–cü ildə Naxçıvan MR–in 40 illiyi ilə əlaqədar Zəngilan–Qubadlı–Laçın rayonlararası «Kənd Həyatı» qəzetinin redaktoru kimi nümayəndə heyəti ilə birlikdə yubiley şənliklərində iştirak edərkən mehmanxanada onunla bir yerdə qalmış, şəhər orta məktəblərinin birində keçirilən görüşdə, «Şərq qapısı» qəzetinin redaktoru yazıçı H.İbrahimovun evindəki qonaqlıqda iştirak etmişəm. Burada bir söhbəti indi də xatırlayıram. Əli Vəliyevlə zarafat edirdilər. Birdən üzünü mənə tutub dedi:

– Əgər Qubadlıya xəbər yayılsa ki, Əli Qara oğlu Süleymana ot yoldurub, bunu hoydu–hoyduya salmayın.

Onun nəyə işarə etdiyini başa düşə bilmədim. Təəccübləndiyimi görüb əlavə etdi:

– Dünən Əli ilə Sisyana getmişdik. Elə yerlərə apardı ki, ayağım yerdə durmurdu. Hər dəfə sürüşəndə əl atıb topaldan tuturdum. Ağır adamam, topal davam gətirməyib qopub əlimdə qalırdı. Allah bilir nə qədər topal yoldum. Çox eşitmişdim ki, bəzi adamlar bir–birinə deyərdi ki, sənə ot yolduraram. Əli də mənə beləcə ot yoldurdu.

Yubiley vaxtı naxçıvanlıların hər iki yazıçıya olan dərin ehtiramlarının şahidi olmuşam. Onlar bu ehtiramı vaxtilə Naxçıvanda (Ə. Vəliyev «Şərq qapısı» qəzetinin redaktoru, S.Rəhimov isə Şərurda, Şahbuzda RPK–nin katibi) işlərkən qazanmışlar.

1967–ci il fevral ayı idi. Həyat yoldaşı Qələm xanımla Xocahan kəndində bacanağı Bəylər müəllimin qonağı idi. Bunu eşidib Zəngilandan onun görüşünə gəldim. Çox səmimi görüşüb söhbət

etdik. Onunla müxtəlif görüşlərdə çəkdiyim şəkilləri komplektləşdirib gətirmişdim. Bu şəkilləri çox məmnuniyyətlə qəbul edib ikimizin birlikdə çəkilən bir şəklin arxasına və «Mehman» povestinə avtoqraf yazıb mənə verdi. Bu gün ona təəssüf edirəm ki, bu söhbəti lentə yazıb saxlamaq mümkün olmamışdı. Bununla belə xatırladığım məqamlar bu gün onun necə bir şəxsiyyət olduğu haqqında məndə daha aydın təsəvvür yaradır.

Bir dəfə alimə S.Rəhimovun evində iş otağı, əl yazıları ilə tanış olmaq imkanı düşdü. Ona baxıb öz–özümə düşünürdüm ki, görən adi adamın bu əl yazmalarının surətini sadəcə köçürməyə ömrü və fiziki qüvvəsi çata bilərdimi?! Mübaliğəsiz deyərdim ki, çox çətin.

Bütün bu görüşlər ona dağ vüqarlı, dağ əzəmətli bir sənətkar adı verib, yaradıcılığını «Həyat nəhri» adlandıranlar nə qədər haqlıdırlar. Onun vüqarı, sadəliyi və təvazökarlığı ilə son dərəcə ahəngdarlıq təşkil edirdi. Qəddi–qamməti, fiziki sağlamlığı, mənəvi zənginliyi, kişi bütövlüyü bir–birini elə tamamlayırdı ki, buna ancaq qibtə etmək olardı. Mənim nəzərimdə o, fiziki sağlamlıq, mənəvi saflıq mücəssəməsi idi.

Onun gəncliyi gənclər üçün, ahıllığı ahıllar üçün nümunə göstərməyə layiq olmuşdur. Nurani–pirani görkəminə baxanda isə düşünürsən ki, kaş adam qocalanda da belə qocala. O, şam kimi yanıb ərisə də, 83 yaşında ölən gününə kimi əli qələm tutmaqdan, ürəyi isə yazıb–yaratmaqdan qalmamışdır. Heyrətlənirsən ki, yaradan ona gör necə böyük həyat eşqi veribmiş!

Çoxlarımız elə adamlar tanıyırıq ki, bir kitabçası çıxanda az qalır hamını özünə pərəstiş etdirə. S.Rəhimovla oturub–duranda isə adama elə təsir bağışlayır ki, elə bil cild–cild əsərləri yazan heç o deyildir. Halbuki L.N.Tolstoy Rusiya üçün necə bir şəxsiyyətdirsə, o da Azərbaycan üçün elə bir şəxsiyyətdir. S.Vurğun onu əbəs yerə nəsrimizin uzaqvuran artilleriyası adlandırmamışdır.

O, əsərlərində hər biri öz şəxsi xarakteri ilə yaddaqalan ümumiləşdirilmiş zəngin obrazlar qalereyası yaratmışdır. Bunu təsəvvür etmək üçün Şamonu, Qəməri, Saçlını, Mehmanı, Qaloşu, Murtuzovu, Alonu, Safonu, Sübhanverdizadəni, Dəmirovu,

Salavatovu və onlarla başqa obrazları xəyala gətirmək kifayətdir. Son illər artmış cinayətkarlıq istər–istəməz hüquq mühafizə orqanları işçilərindən Mehman qətiyyəti, Mehman cəsarəti tələb edir. Adamlar istəyirlər ki, əyriyə aman, doğruya zaval olmaması üçün onlar Mehman kimi nümunə göstərsinlər. Respublikamızın müstəqilliyi uğrunda mübarizədə xalq özünə Şamo kimi mətin, qeyrətli oğullar, «Şamo daş qoyan yerə Qəmər baş qoyar» – deyən Həcər timsallı qızlar istəyir.

S.Rəhimov əsrimizin yaşıdı olduğu kimi, yaradıcılığı da onun yaddaşıdır. Əsrimizin ictimai–siyasi hadisələri onun əsərlərində öz əksini hər tərəfli tapmışdır. Məşhur ədəbiyyat tənqidçisi Z.Kedrina «Həyat nəhri» məqaləsində dediyi bu sözlər çox səciyyəvidir: «Çox sürətlə axan çayın kənarında dayanıb baxanda insan istər–istəməz düşünür: suyu, qüvvəti və inadkarlığı bu çay haradan alır? Bu zaman insan həmin çayın başlandığı ilk bulaq haqqında, bütün yolboyu ona qoşulan, onun suyunu bollaşdıran qollar haqqında düşünməli olur. M.Auezovun «Abay» roman–operasını, A.Unitin «Yaşıl yarpaq» yaxud S.Rəhimovun «Şamo» əsərlərini oxuyarkən insan təxminən belə hisslər keçirir».

Vaxtilə S.Rəhimovun dediyi bu sözlər indi atalar sözünə çevrilib: «İstedad birdirsə, zəhmət yüzdür, bəlkə mindir...» O da taleyin bəxş etdiyi istedadın zirvəsinə məhz uzun illər çəkdiyi zəhmətlə yüksəlmişdir. Ona görə özünü «ədəbiyyatımızın fəhləsi» adlandırmağa mənəvi haqq qazanmışdır.

Həyatımızda son illər baş verən ictimai–siyasi dəyişikliklər nəticəsində bəziləri Süleyman kimi sənətkara sırf totalitar rejim prizmasından baxaraq onun yaradıcılığına tünd gölgə salmağa çalışırlar. Ancaq kim hansı dərəcəli bucaq altından, hansı prizmadan baxırsa-baxsın, onun yaradıcılığı Azərbaycan xalqının XX əsrdə keçdiyi yolun salnaməsidir. **06 aprel 1996-cı il.** «İki Sahil»

# GÖRÜŞ TƏƏSSÜRATLARI

1944–cü ilin ortaları idi. Sənət məktəbinin müdavimi kimi Binəqədi Neft Trestinin dəqiq ölçü alətləri sexində buruqlardakı ölçü cihazlarına xidmət çilingəri işləyir, həm də axşam orta məktəbində təhsilimi davam etdirirdim. O zaman bir sıra yazıçılarımızla bərabər Əli Vəliyevin də mətbuatda çıxan məqalələrini, dərc olunan kitablarını ardıcıl mütaliə edirdim. Onu şəxsən görməyə arzu və maraq isə ilk dəfə 1930–cu illərdə nəşr edilən «Nənəmin cəhrəsi» kitabından başlanmışdı. Sonra isə «Qarlı dağlar», «Ordenli çoban», «Dostlar», «Sübut», «Cəbhə hekayələri»ni, «Qəhrəman» romanını oxumuşdum. Bu kitablarda kənd həyatına aid hadisələr o qədər aydın, sadə və şirin dildə təsvir edilmişdi ki, elə bil onların iştirakçısı olmuşdum.

Dayım Zülfü Əhmədov Bakıya partiya məktəbinə kursa gəlmişdir. Bir dəfə Ə.Vəliyevin «Cəbhə hekayələri» kitabını əlimdə görüb dedi:

Yaxşı eləyib oxuyursan. Sözü bütöv kişidir, təsübkeşdir. Onunla görüşəndə adama xoş təsir bağışlayır. Dayımın onu yaxşı tanıdığını eşidib xeyli sevindim. Ürəyimdə arzu etdiyim bu söz dilimə gəldi: «Kaş onu görəydim!» Bunu eşidən dayım dedi:

– Mən Bakıya gələndə həmişə onunla görüşürəm. Bu günlərdə onun evinə getməliyəm, şəxsi işim var. Onda səni də apararam.

Bir istirahət günü dayımın yanına getdim. Birlikdə onun (o zaman yaşadığı ünvan Çkalov 15 idi) evinə getdik. Ucqar bir dağ kənd uşağı kimi o zaman nə yazıçı, nə şair görmüşdüm, nə alim. Bütün həmyaşıdlarım kimi onları az qala qeyri-adi adam kimi təsəvvür edirdim.

Otağa daxil olanda ev paltarında bir kişi stolun üstündə banka ilə gimrik duz əzirdi. İlk baxışda onu bizim öz kəndimizdə olan kişilərə oxşadırdım. Əkinçilərə məxsus iri əlləri, qalın, sıx və uzun tüklü qaşları, səsində isə bənzərini tapa bilmədiyim bir ahəng var idi.

Məni təqdim edəndə bildim ki, bu elə hələ otuzuncu illərin ortalarında ibtidai məktəbdə oxuduğum zaman müəllimlərimdən

eşitdiyim «Nənəmin cəhrəsi» hekayəsini yazan Əli Vəliyevdir. O, dayımla rayonun ümumi vəziyyətinə, camaatın güzəranına, əkin–biçin işlərinə, habelə rayon rəhbərlərinin necə işləmələrinə, Mahmudlu kəndində olan qohumlarına aid sorğu–sual apardı. Xeyli söhbət etdikdən sonra xudahafizləşib ayrıldıq. Bu ilk görüş məndə o qədər təəssürat yaratdı ki, indi də bu təəssürat şirin bir xatirə kimi qəlbimdə hifz olunmaqdadır.

APİ–də oxuyarkən mən ikinci dəfə onu S.Vurğunun «İnsan» pyesinin disputunda gördüm. Oğlu mərhum Məsudla isə APİ–yə gəlib–gedəndə tanış olmuşam. Artıq Ə.Vəliyev «Kommunist» qəzetinin redaktoru təyin edilmişdi. Buna görə də onun bütün publisistik fəaliyyətini daha müntəzəm izləyirdim. Rayona təyinat alandan sonra onun Zəngəzurdakı fəaliyyəti haqqında daha ətraflı məlumatım oldu. Laçın qəzasında müxtəlif vəzifələrdə, xüsusən «Sovet Kürdüstanı» qəzetində redaktor işləyərkən göstərdiyi fəaliyyət haqqında həmyaşıdlarımdan çox maraqlı epizodlar eşidirdim. Yazdığı bəzi əsərlərin mövzusu, bir çox qəhrəmanlarının prototipləri Zəngəzurdan götürülmüşdür. Sözün tam mənasında o, Zəngəzurun canlı ensiklopediyası idi. Öz xarakterinə görə Qubadlıda çox böyük ehtiram qazanmışdır. Əllinci illərin sonunda rayonda onunla keçirilən bir görüşdə bunun daha dərindən şahidi oldum. Bu görüşdə «Zəngəzur qartalları» kitabında bəhs olunan adamların sağ qalanları, dünyasını dəyişənlərin varisləri, ağsaqqallar, bütün ictimai təşkilatların nümayəndələri iştirak edirdi. Onun görüşdə etdiyi səmimi çıxış iştirakçıları elə cəlb etmişdi ki, bunu ifadə etməyə söz tapa bilmirəm.

Bu görüş ona görə təsirli idi ki, onu edən adam həyatın çox sınaqlarından mərdliklə çıxmış, muzdurluqdan cəmiyyətdə özünəməxsus mövqe qazanmışdır. Burada onun haqqında çıxış edən həmyaşıdları Zəngəzurda baş verən hadisələrdə onun iştirakı haqqında danışdıqları epizodlar, doğrudan da, nəsillərə nümunə üçün çox ibrətamiz idi.

1964–cü il oktyabrın 14–də Naxçıvan MR–in 40 illik yubileyinə də’vət olunan Zəngilan-Qubadlı istehsalat idarəsinin nümayəndələri tərkibində mən də vardım. Qonaqlar «Naxçıvan»

mehmanxanasında yerləşdirilirdi. S.Rəhimovu, Ə. Vəliyevi burada görəndə çox sevindim. Çünki onları xeyli müddət idi ki, görmürdüm. Çox səmimiyyətlə görüşüb rayonda vəziyyətə aid məni sorğu–suala tutdular. Çünki onlar da xeyli vaxt idi ki, Qubadlıya gəlmirdilər.

Mehmanxanada qonşu otaqlarda qalırdıq. Respublikanın rəhbərləri təcili Moskvaya çağrıldığından həmin gün yubiley sessiyası təxirə salındı. Bu, Xruşşovun vəzifədən götürüldüyü gün idi. Vaxtdan istifadə edib şəhərlə tanış olduq. Süleymanla Əlinin bir orta məktəbdə maraqlı görüşü keçirildi. «Şərq qapısı» qəzetinin redaktoru, yazıçı H.İbrahimov bizi nahara dəvət etdi. Burada müxtəlif məsələlərə aid söhbətlər getdi. Yeri gələndə bir–birinə incə zarafatlar edirdilər. Haşiyə: Mən sonralar bu zarafatların arxasında duran səmimiyyətdən bir daha dərk etdim ki, onların taleyi necə oxşar imiş!

Zəngəzurun azərbaycanlı ellərində onların adı həmişə qoşa çəkilir. Çünki Xaliq onlara həm zahiri, həm də mənəvi cəhətdən elə oxşarlıq bəxş etmişdir ki, bunu izah etmək çox çətindir. Hər ikisi əsrin başlanğıcında, Novruzda – baharın ilk günündə dünyaya göz açmışdır. Hər ikisi eyni məktəblərdə təhsil almış, eyni vaxtlarda müəllim işləmiş, eyni vaxtlarda eyni rayonlarda fəaliyyət göstərmişlər. Eyni vaxtlarda Bakıya gəlib yaradıcılıq fəaliyyətinə başlamış, Azərbaycan Yazıçılar İttifaqının həyatında hər ikisi çox fəal rol oynamış və xalq yazıçısı kimi fəxri ada layiq görülmüşdür. Hər ikisinin uca boyu, qəddi-qaməti yüz adamın içində belə seçilməsi, fiziki cəhətdən saf olması da tale oxşarlığıdır.

Totalitar rejim şəraitində, necə deyərlər, quş cınqırını çıxara bilmədiyi bir zamanda onlar öz mənəvi saflıqlarını qoruya bilmiş, həm də bir çox həmkarlarını gözləyən böhranlı məqamlardan xilas etməyə nail olmuşlar. İ.Əfəndiyev öz xatirələrində yazır: «Biz gənc yazıçılar özümüzdən yaşlı şair və yazıçılardan Səmədin və Əlinin köməyinə güvənərdik. Əli bizim nöqsanlarımıza qarşı nə qədər sərt idisə, xahişimizə qarşı o qədər qayğıkeş idi. Səməddə də, Əlidə də bizim ata-babalarımızdan, xalqdan gələn bir mərdanəlik var idi.»

Çox qəribədir ki, tale sanki onların kədərlərini də tarazlaşdırmışdır. Belə ki, Süleymanın oğlu, respublikada seymissalogiya sahəsində tanınmış gənc mütəxəssis Şamonun vaxtsız ölümü Rəhimovlar ailəsi üçün böyük itki idi. Bu, elə Əli kişinin ailəsi üçün də böyük kədər olmuşdur.

Belə bir ağır itki Ə. Vəliyevlər ailəsinə də üz verdi. Onun oğlu, filologiya elmləri doktoru Məsudun vaxtsız ölümü də Rəhimovlar ailəsinə böyük dərd oldu. Onları tanıyanlar yaxşı bilirlər ki, Süleymanla Qələm, Əli ilə Qumru xanım çox mehriban, sədaqətli ömür–gün yoldaşı olmuşlar. Onların da hər ikisi ərlərindən əvvəl dünyalarını dəyişmişdir. Eyni kədəri hər iki ailə birgə çəkməli olmuşdur. Taleyin daha bir oxşarlığı: hər ikisi 1983–cü il ay fərqi ilə əbədiyyətə qovuşmuşdur...

1971–ci ilin yayında «Durna qatarı» kitabına material toplamaq üçün Zəngilana gəlmişdi. Onda 70 yaşı tamam olmuşdu. Bu münasibətlə təbrik teleqramı göndərmişdim. Əvvəllər isə «Zəngəzur qartalları» kitabını oxuduqdan sonra ona məktub yazmış, kitabın necə qarşılanması, oçerk yazdığı adamların qohumlarının minnətdarlığı, öz şəxsi rəyimi ona ən xoş arzularımı bildirmişdim. Görüşərkən göndərdiyim məktub, vurduğum teleqram üçün mənə öz razılığını bildirdi.

Artıq işini qurtarmışdı. Səhər tezdən getməli idi. Əli müəllim onu çox səmimi qarşıladı, şirin–şirin hal–əhval tutdu. Məhərrəm (Mahi ilə görüşü yazıda yoxdu. Birdən birə Məhərrəm deyilir oxucu çaşa bilər. Buranı necə düzəldək) müəllim onu evə dəvət etdi. Vaxtının olmamasını nəzərə alıb getməyə tərəddüd etdi. Onun tərəddüdünü görüb söhbətə qarışdım:

– Əli dayı, – dedim – tələbənin, əsgərin, sanatoriya yoldaşlığının başqa aləmi var. Ayrılandan sonra nə vaxtsa görüşməyi arzulayırlar. O da sizin kimi bir adam ola. Məhərrəm müəllim sizi, necə deyərlər, göydə axtarırdı, yerdə, həm də qapısının astanasında əlinə düşmüsünüz. Onun sözünü necə yerə salmaq olar! Axı şairlərin xasiyyətini bilirsiniz. Onun ailəsi ilə tanış olmaq bəlkə sizə mövzu da verər. Siz qəhrəmanlardan yazırsınız. Onun arvadı Cahan xanım Sosialist Əməyi Qəhrəmanı olmasa da, 4 qızı,

6 oğlu olan Qəhrəman anadır. Bəlkə, sonralar belə analardan da ikinci bir «Durna qatarı» yazmalı oldunuz. Əli müəllim gülüb razılıq verdi. Bir şərtlə ki, çox ləngitməyək.

Məhərrəm müəllim ona yaxşı süfrə açdırmışdı. Lakin Əli müəllim şəkəri olduğu üçün pəhriz saxlayırdı. Buna görə də çox az yedi. Əslində söhbət onun yeməyindən getmirdi. Biz onunla heç olmasa bir saat artıq görüşməyi qənimət bilirdik. Axı belə bir imkanın bizim əlimizə bir də nə vaxt düşəcəyini heç xəyalımıza da gətirməzdik.

Doğrudan da, onunla sonralar görüşə bilmədik. Yalnız anadan olmasının 80 illiyi münasibəti ilə təbrik teleqramı göndərdim. İki il sonra isə «Zəngəzur qartalları»ndan biri olan Əli dayı ömür zirvəsində əbədiyyətə qovuşdu.

Bu günlərdə Aydın Məmmədov adına Azərbaycan Tərcümə Mərkəzi (sədr Afaq Məsuddur) Sevil Vəliyevanın tərtibi əsasında xalq yazıçısının xatirəsinə ithaf olunmuş «Yadda qalan xatirələr» adlı kitab nəşr etmişdir. Burada 32 nəfər tanınmış yazıçı və şairin xatirəsi dərc olunmuşdur. Səmimiyyətlə yazılmış bu xatirələri adam çox məmnunluq hissi ilə oxuyur. Müəlliflər onun şəxsiyyətindən, xarakterindən konkret faktlar əsasında dolğunluqla söz açmışdır. S.Rəhimov onu «Yeri görünən», İ.Şıxlı «qəlbi üzündən oxunan», R.Rza «Ədəbiyyata həyatdan gələn», M.İbrahimov «Ürəyi uşaq ürəyi kimi təmiz», Ş.Əsgərov «Bir sözlü, bir üzlü adam», M.Dilbazi «Xalqın kişi oğlu» adlandırmışdır.

B.Vahabzadə isə onu «mənəvi atamız» kimi xarakterizə edir. Biz jurnalistlər də bunu özümüzə şamil edirik. Çünki Ə.Vəliyev bədii yaradıcılıqla bərabər, jurnalistika sahəsində uzun müddət fəaliyyət göstərmişdir.

Milli qeyrətli, cəsarətli, kişi bütövlüyü və ümumiyyətlə, mənəvi saflığı ilə indiki nəsillərə nümunə olduğu kimi, gələcək nəsillərə də nümunə ola biləcək şəxsiyyətdir Əli Vəliyev.

# BU YERLƏRDƏ İZİ QALIB ŞAİRİN

APİ–də oxuduğum 1944–48–ci illərdə mətbuatda gedən bədii yazıları müntəzəm izləyirdim. O zaman şeirləri ilə tanış olduğum tələbə gənclərdən biri də ADU–nun şərqşünaslıq fakültəsinin tələbəsi Atif Zeynallı idi. İllər keçdikcə onun yeni–yeni şeirlərinə rast gəlirdim. 1958–ci ildə ilk şeir kitabı çıxanda, «Müasirlik və Şərq problemi» mövzusunda dissertasiya müdafiə edib filoloji elmlər namizədi daha sonra elmlər doktoru alimlik dərəcəsi alanda son dərəcə sevinmişəm. Ancaq institutu qurtarıb rayona getdiyimə görə onunla yaxından tanış olmağa məqam düşməmişdir. Rayon qəzetində redaktor işləyərkən (1970–ci ildə) belə bir imkan düşdü. Şair Zəngilana ezamiyyətə gəlmişdi.

Onun ezamiyyətdə olduğu müddətdə tələbəlik illərimizi, iştirak etdiyimiz kütləvi tədbirləri, xüsusən professor Əli Sultanlının doktorluq dissertasiyasının müdafiəsini, S.Vurğunun «İnsan» pyesinin ilk tamaşasını, onun ədəbi müzakirəsini, APİ–nin 25 illik yubiley tədbirlərini, o zaman bizə dərs deyən hörmətli müəllimlərimizi, akademik Məmmədcəfər Cəfərovu, görkəmli ədəbiyyatşünas Mikayıl Rəfilini, Cəfər Xəndanı, adlı–sanlı dilçi alim Əbdüləzəl 1 Dəmirçizadəni, pedaqoji elmlər doktorları Əhməd Seyidovu, həmçinin o zaman birgə təhsil aldığımız yoldaşlarımızı – Bəxtiyar Vahabzadəni, Vidadi Babanlını, Əliağa Kürçaylını, İslam Səfərlini, Qabili, Məsud Əlioğlunu və başqalarının yaradıcılığı haqqında xeyli fikir mübadiləsi etdik. 20–25 il əvvəlki bu xatirələr bizə son dərəcə şirin idi.

Bir neçə gün onu Zəngilanın görkəmli yerləri, iqtisadiyyatı, təbiəti, tanınmış şəxsiyyətləri ilə ətraflı tanış etdik.

Arazın qolları olan Bərgüşad, Oxçu, Bəsit çaylarının yaşıl vadiləri, Ağ oyuq, Gəyən düzləri, Arazın sağ sahilindəki Vinə dağları ilə üz–üzə duran sol sahilindəki Zəngəzur dağ silsiləsi, Süsən, Əsgülüm, Top, Leşkər meşələri, dünyada ikinci, Avropada birinci olan Bəsitçay təbii çinarlığı şairi məftun etmişdi.

O, Arazın qıvrıla-qıvrıla axdığı, göz işlədikcə uzanan məcrasına isə baxmaqdan doymaq bilmirdi. Söhbətlərinin birində isə

Arazın lap sahilinə getmək arzusunda olduğunu bildirdi. Onun bu arzusunu RPK–nın birinci katibinə çatdırdım. O, məmnuniyyətlə bu işi təşkil etdi. Atif müəllim bir xeyli müddət şair emosionallığı ilə Arazın sağ sahilini seyr etdi. Qayıdanda qamışlıqdan bir meşə xoruzu qalxdı. Katib ov tüfəngi ilə onu nişan aldı. O, xoruzu mənalı–mənalı çox süzdü, sonra onu özü ilə aparmaq arzusunda olduğunu bildirdi.

Çox–çox sonralar onun «Dünya arxayındır etibarıma» adlı kitabında «Sərhəd boyunda ov» adlı şerini (1990–cı il, səh.38) oxudum. Onda şairin 20 il əvvəl meşə xoruzuna çox mənalı–mənalı baxışını xatırladım. Onun bu qədər gec çap olunması əsassız deyilmiş. Axı, siyasi məzmununa görə o vaxt senzura onun çapına çətin imkan verərdi!

Sonra şairi Arazın sahilində salınmış Mincivan qəsəbəsi ilə tanış etdik. Qəsəbə ilə rayon mərkəzi arasında on kilometrlik şosenin hər iki tərəfində qamətli çinarlar çətirləşib yaşıl tunel əmələ gətirmişdi. Nəinki yayın ən qızmar çağında, hətta qışda belə bu yolla gedib–gəlmək adama ləzzət verir. Onun çəkilməsi, kənarlarının yaşıllaşdırılması haqqında söhbət saldıq. Şair yolu çəkənlər, ağacları əkənlər haqqında çoxlu xoş sözlər dedi. Onun bu səfərdə aldığı təəssürat «Mincivan» və «On min çinar» adlı şeirlərində öz əksini tapmışdır:

***Cərgənizlə vidalaşdım.***
***Hər yarpaqda gözüm qaldı.***
***Hayıf ki, tez vidalaşdım...***
***O nəğməli dilinizdə***
***Sanki on min sözüm qaldı.***

A.Zeynallı sonralar Zəngilana 1979, 1982–ci və sonuncu dəfə isə 1987–ci ildə gəlmişdi. Bu gəlişləri zamanı aldığı təəssürat altında «Koroğlu daşı», «Çinarlıq» və «Zəngilan» şeirlərini yazmışdır. Bu şeirlərdə şairin rayonun təbiətinə vurğunluq öz ifadəsini aydın tapmışdır. Azərbaycan torpağının gözəl guşəsi kimi Zəngilanı da öz ilhamının bulağı hesab etmişdir.

***Gül camalın gözlərimdən getməyib,***
***Sərt sözün də könlümü incitməyib,***
***Hələ nəğmən yarımçıqdır, bitməyib,***
***İlhamımın bulağısan, Zəngilan!***
***Azərbaycan torpağısan Zəngilan!***

Tanış olduğum dövr ərzində onda müşahidə etdiyim keyfiyyətlər – təvazökarlıq, mehribanlıq, konkretlik mənə son dərəcə xoş təsir bağışlayırdı. Atif müəllim o qədər sadə idi ki, zahirən heç bir cəhətdən diqqəti cəlb etmirdi. Adama elə gəlirdi ki, uzun müddətdir ki, onunla bir yerdə olur. Ancaq görüşlərdə onun intellektual səviyyəsi oxucuları dərhal maqnit kimi özünə cəlb edirdi. Bax, buna görə də, bir oxucu kimi hər görüş məndə dərin məmnunluq hissi doğururdu.

Onunla dördüncü görüşümüz 1987–ci ilin əvvəllərində oldu. Əvvəlki görüşlərimiz kimi, bu görüşümüz də hər ikimiz üçün çox xoş idi. Hava çox soyuq olduğu üçün tez–tez öskürürdü. Həmyaşıd kimi ona papirosu tərgitməyi təkid etdim. Hətta qeyri–təvazökarlıq olsa da, özümü nümunə göstərdim. Axı, mən papirosu tərgidəndən sonra xeyli yaxşılaşmışdım. Söz–söhbətdən sonra zarafatla hansı rayonda isə olarkən bir tütünçü qıza həsr etdiyi şerdən bir parçanı dedi:

***Abşerona dönüm necə?***
***Yanım necə, sönüm necə?***
***Pəncərəmin qabağında,***
***Bil ki tütün əkəcəyəm***
***Papirosu tərgitmişəm,***
***Bundan belə çəkəcəyəm.***

Söhbət zamanı bildirdim ki, onun nəinki özünün, hətta həyat yoldaşı Səyyarə xanımın, oğlu Xəzərin də yaradıcılığını izləyirəm. O, bundan çox razı qaldığını bildirdi. Səyyarə xanımın 1982–ci ildə çapdan çıxan «Mənsuriyyə» kitabına, Xəzərin «Ulduz» jurnalında dərc olunmuş bir sıra şerlərinə məmnuniyyətlə

avtoqraf yazıb mənə verdi. Atif iki gündən sonra qayıtmalı oldu. Gedərkən dedi:

– Baharda mütləq gələcəyəm. Zəngilana aid yazmalı mövzularım vardır.

Elə bu xoş arzu ilə biz ayrıldıq. Ancaq, doğrudan da, adam taleyin hökmündən xəbərsizdir. Xəyalımıza da gəlməzdi ki, bu, bizim axırıncı görüşümüz və əbədi ayrılığımız olacaqdı. Onda hələ Atif müəllim heç təqaüd yaşına belə çatmamışdı. Xudu Məmmədov, Kərim Rəfizadə, Hafiz Baxış kimi onun da ürəyi xalqımızın erməni təcavüzü nəticəsində düşdüyü faciəyə tab gətirmədi.

Onun haqqında verilmiş nekroloqu oxuyanda xalqımızın istedadlı şair və alim oğlunun vaxtsız vəfatı üçün kədərlənməkdən başqa əlimizdən nə gələrdi?! Ancaq onunla təskinlik tapmaq olardı ki, zəngin yaradıcılıq irsi xalqın qəlbində onu əbədi yaşadacaqdır.

Respublikamızın bir çox bölgələrində olduğu kimi, bizim dağlarımızda da onun izi, könlümüzdə isə sözü qalmışdır. Şairin Zəngilana dair yazdığı altı şerin hər biri isə rayonun sakinləri üçün şöhrət çələngidir. Qoy mənim bu təəssüratım da erməni təcavüzü nəticəsində indi didərgin düşüb respublikamızın müxtəlif yerlərində məskunlaşmış bütün zəngilanlılar adından bu xatirə günündə onun məzarı üstünə qoyulmuş ehtiram çələngi olsun!

**24 fevral 1994-cü il.** «İki Sahil»

# «QARA VOLQA»NI OXUYARKƏN

Ömür zirvəsində adam istər–istəməz keçdiyi həyat yoluna xəyalən nəzər salmalı, nə vaxtsa ünsiyyətdə olduğu adamları kövrək hisslərlə xatırlamalı olur. Mənim də həyatımda xatırlamalı olan adamlar az deyildir. Belələrindən biri yazıçı–jurnalist Cəmşid Əmirovdur...

Mən onunla «Komsomolskaya pravda» qəzetində müxbir işləyəndən maraqlanırdım. «Brilyant əməliyyatı» romanı çapdan çıxandan sonra onun jurnalistlik və yazıçılıq fəaliyyətini daha müntəzəm və maraqla izləməyə başladım. O zaman «Brilyant əməliyyatı» çox həvəslə oxunan əsər idi. Cəmşid müəllimlə şəxsən tanış olmaq marağı məndə məhz həmin vaxtlarda yaranmışdı. Rayonda işlədiyim üçün belə bir imkanın nə vaxt düşə biləcəyini ehtimal edə bilmirdim. Ancaq 1965–ci ilin dekabr ayında Şuşada istirahətdə olarkən belə bir xoş təsadüf mənə onunla şəxsən tanış olmağa imkan verdi.

Əlbəttə, bir həmkar kimi, onunla nəinki tanış olduq, hətta istirahət dövründə bir saatımız belə ayrı keçmədi. Ədəbiyyatımız, poeziyamız, nəsrimiz, dramaturgiyamız, publisistikamız haqqında söhbətlərimiz, fikir mübadiləmiz çox maraqlı keçirdi.

Cəmşid müəllim onda «Qara Volqa» üzərində işləyirdi. O, əlyazmalarını Şuşada hansı bir idarədə isə makinada yazdırır, sonra isə birlikdə oxuyub korrekturasını edirdik. Belə getsə, gərək kitabın qonararına səni də şərik edəm, – deyə zarafat edirdi. Beləliklə, «Qara Volqa»nın bəzi fəsillərinin makinadan sonra ilk oxucusu oldum.

On beş gün müddətində yan-yana otaqlarda olsaq da, günümüz daim bir yerdə keçirdi. Çox vaxt bir yerdə yeyib–içir və şəhərə də bir yerdə gəzməyə gedərdik. İki dəfə də Xankəndinə getdik. Bir dəfə Şuşada Üzeyir Hacıbəyov günləri keçirilirdi. Bakıdan böyük bir dəstə gəlmişdi. Dəstə incəsənət xadimləri, bəstəkarlar, aktyorlardan ibarət idi. Şəhər mədəniyyət evində keçirilən yubiley gecəsində Cəmşid müəllimlə birgə iştirak edirdik. Aldığım xoş təəssüratın təfərrüatını indiyə qədər xatırlayıram.

Atalar əbəs deməyiblər ki, yoldaş olmasan, qardaşının necə adam olduğunu bilməzsən. Bir yerdə dincəldiyimiz müddət qısa olsa da, onun haqqında konkret təsəvvürə malik olmaq üçün bu da kifayət idi. Cəmşid müəllim, doğrudan da, sadə, təvazökar, mehriban və həssas bir adam idi. O vaxt qardaşı Azərbaycan KP MK–nın katibi işləyirdi. Ancaq çalışırdı ki, istirahət evində bunu bilən olmasın. O, bir yazıçı kimi diqqəti özünə cəlb edən bir hərəkətə belə yol vermirdi.

Mən bir neçə gün tez çıxmalı oldum. Özümlə bərabər onun haqqında çox xoş təəssürat və müxtəlif məqamlarda çəkdirdiyimiz şəkilləri gətirdim.

Bir ildən sonra poçt ilə bir bağlama aldım. Bağlamada «Qara Volqa»nın avtoqraf yazılmış bir nüsxəsi var idi. Bu, mənim üçün əvəzsiz hədiyyə idi.

38 ildən sonra əsərin yeni nəşrini görəndə istər–istəməz onunla bağlı ötən xatirələr qəlbimdə baş qaldırdı. Yaradıcılığının yenicə çiçək açmağa başladığı bir vaxtda onun öz dünyasını dəyişməsi ədəbiyyatımız üçün, həqiqətən, ağır itki idi. Ömür vəfasızlıq etməsəydi, bəlkə də, indi o, Azərbaycan ədəbiyyatında nəsrimizin, publisistikamızın tanınmış nümayəndələrindən biri ola bilərdi.

Əsərinin təkrar çap olunması yazıçının xatirəsinə ehtiramdır. Digər tərəfdən romanın mövzusu elə indi aktualdır. Belə ki, 60–cı illərdə onun yazdığı təsvir olunan hadisələr dedektiv təsiri bağışlasa da, bu gün hər cür cinayət kütləvi şəkil almışdır. İndi edilən cinayətlərin forma və metodu, sərvət toplamaq fırıldaqları, qətl–qarət, rüşvət və başqa cinayət əməlləri romandakı hadisələrdə müqayisəyəgəlməz dərəcədədir. Romanın yazıldığı 60–cı illərdə cinayətkarlığa qarşı hüquq-mühafizə orqanları tərəfindən aparılan mübarizə o vaxtkı oxucularda ən böyük razılıq doğururdusa, indiki oxucularda cinayətkarlığa qarşı mübarizədə hüquq–mühafizə orqanlarından bir o qədər qətiyyət gözləyirlər.

Azərbaycan Dövlət Nəşriyyatı romanı təkrar çap etməklə çox nəcib iş görmüşdür. Bu, oxucuların indiki nəsli üçün dəyərli hədiyyədir. Heç şübhəsiz ki, onlar bunu elə bu cür də qiymətləndirəcəklər. Mən isə təəssüratımla sıramızdan vaxtsız getmiş Cəmşid

Əmirovu tanıyanların yaddaşında: qəlbində uyumuş xatirələri ayıltmaq istədim.

Bu şəkil isə «Qara Volqa» haqqında söhbət etdiyimiz zaman istirahət evinin kütləvi iş təlimatçısı (Kamal) tərəfindən çəkilmişdir. Cəmşid müəllim onun arxasına avtoqraf yazıb mənə vermişdir. Həmin şəkil heç zaman tutub saxlamaq mümkün olmayan o ömür atını (8 dekabr 1965–ci ili) xatırlatmağa imkan verdiyi üçün ən qiymətli yadigardır.

**05 may 1994-cü il.** «İki Sahil»

## ÖZÜN OLMAYANDA BİR GÜN CAHANDA

«Vətən böyükdür. Ancaq bu böyüklüyün içərisində hər kəs üçün daha əziz olan kiçik bir Vətən də var. Qoynunda göz açıb saf havası ilə nəfəs aldığım, sərin sularını içib, torpağının nemətləri ilə boya–başa çatdığım, uca dağlarını, laləli düzlərini, nəğməli meşələrini, yaşıl çəmənlərini dönə–dönə dolandığım doğma kəndimdir mənim Vətənim...»

Şair, rejissor Hafiz Baxışın «kiçik Vətən» adlandırdığı kənd Zəngəzurun füsunkar təbiətli Qafan rayonunun Gilətağ kəndidir. Bu kənddə adı el arasında ehtiramla çəkilən qeyrətli oğullar az olmayıb. Yeni nəsillərdən olan Hafiz Baxış da onların ənənələrinə sadiq olan oğullardan biridir.

Onunla ilk dəfə 1963–cü ildə, Teleradio Komitəsində işlərkən Zəngilana ezamiyyətə gələndə tanış olmuşdum. Elə bir il olmazdı ki, özünün dediyi kimi, «kiçik Vətən»ini yad etməsin. Hər dəfə gələndə görüşlərimiz çox maraqlı olardı. Televiziyada quruluş verdiyi musiqili veriliş (xüsusən muğamlara həsr edilmiş) proqramları, şerlərinə bəstələnən mahnılar barədə etdiyimiz fikir mübadiləsi onda xoş ovqat yaradardı.

Onunla ən yadda qalan görüşümüz 1980–ci il mayın 1–də Zəngilanın Gilətağ kəndində oldu. Hafiz orta məktəbi orda qurtarıb. O, qohumları və xüsusən ədəbiyyat müəllimi Qüdrət Bəxtiyarovla görüşmək üçün İlyas Tapdıqla birlikdə buraya gəlmişdi.

Təbiətin «xəyala, duyğuya qol-qanad verən» bir çağı idi. Heç bir vasitə ilə tutub saxlamaq mümkün olmayan bu anı yaxşı ki, fotokameranın köməyi ilə tutub saxlamaq mümkün olub. İndi bu şəkillərə baxanda onu çəkdiyim anda keçirdiyim hisslər qəlbimi elə kövrəldir ki, mərhum həmkarımız Alı Mustafayev demişkən, dəli bir ağlamaq keçir könlümdən.

O məsud günlərdə heç xəyalımıza da gəlməzdi ki, bu görüşümüz sonuncu olacaq...

1989-cu ilin avqust ayının sonu idi. Bir neçə gün idi ki, qohumlarımla görüşə getmişdim. Qayıdanda redaksiyada mənə dedilər ki, Hafiz gəlmişdi, səni görə bilmədiyinə çox təəssüf edib getdi. Elə mən də buna az təəssüflənmədim. Bu elə bir vaxt idi ki, Qafan rayonunda bir nəfər də azərbaycanlı qalmamışdı. Hafiz gəlib Qafan rayonu ilə sərhəd olan Günqışlaq kəndinə – qohumlarıgilə getmək və o «kiçik Vətən»ini uzaqdan da olsa, seyr edib, burada bir qədər dincəlmək istəyirdi. Ancaq onun ürəyinə elə bil nə isə dammışmış, o, sonuncu dəfə vidalaşmağa gəlibmiş. Əməkdaşlar mənə dedilər ki, o, çap etmək üçün redaksiyaya «Darıxmışam» adlı şeir də verib. Sanki o, ürəyinin ən ağır dərdini, yüz illərdən bəri dədə–babasının yaşadığı doğma yurdundan ayrı düşmək həsrətini öz oxucuları ilə bölüşməyə mənəvi bir ehtiyac duymuşdu.

***Qucağında bu dünyaya göz açdığım,***
***Qucağında pərvazlanıb tez uçduğum,***
***Harda olsa xatırlayıb söz açdığım,***
***Doğma, əziz ellər üçün darıxmışam!!!***
***Uca dağlar, qurbanınız olum sizin,***
***Zirvənizə bir də düşər yolum sizin,***
***Qoy dolansın boynunuza qolum sizin,***
***Sizdə keçən illər üçün darıxmışam.***

Qəfil ölüm mənə bir daha alman şairi Henrix Heynenin bu sözlərini xatırlatdı: «Bəşəriyyətin dərdləri şairin ürəyindən bir–bir çat kimi keçir»

***Ey odlar diyarı, müqəddəs ana,***
***Hazıram yolunda hər imtahana.***
***Sənsiz baxaramsa, əgər cahana,***
***Qoy onda kor olsun gözüm, ey Vətən!***

Bəli, Vətən dərdi Hafizin ürəyindən bir çat kimi keçdi. Elə bir dərdin, kədərin çatı ki, o vaxtlar görkəmli alimimiz Xudu Məmmədovu, yazıçı Fərman Kərimzadəni də əbədiyyətə qovuşdurub.

Həmin vaxtlar Hafizin üçüncü kitabı nəşriyyatda idi. «Eşqini sönməyə qoymaram» adlı bu kitabını görmək ona nəsib olmadı. Bu, onun pərəstişkarlarına qoyub getdiyi ən dəyərli yadigar idi. Onun ürək çırpıntıları həmin şerlərdə öz ifadəsini çox aydın tapmışdı.

Hafiz təbiət vurğunu idi. Vətənin qartal yuvalı qarlı dağları, bəyaz buludları, səsi şahnaz, şur timsallı, görkəmli, ağ duvaqlı gəlin şəlalələri, bal dadan buz bulaqları onun şerlərində ilhamla tərənnüm edilib.

«Mənim dünyam», «Dünyadır» şerlərini oxuyarkən əbədi və əzəli dünya haqqındakı poetik düşüncələri oxucunu kövrəldir. Bununla belə, bu şerlər inamsızlıq deyil, oxucuda Xaliqin ona bəxş etdiyi ömürdən xeyirxah əməllər üçün, xüsusən Vətənin xoş gələcəyi naminə istifadə etməyə inam doğurur.

Hafizin yaradıcılığı haqqında ətraflı danışmağı qarşıya məqsəd qoymamışam. Onun ayrı–ayrı şerlərinin məna və poetik məziyyətləri haqqında da ətraflı söz açmaq istəmirəm. Həmin şerlər elə məharətlə yazılıb ki, onların şərhinə də ehtiyac yoxdur. Ancaq bir oxucu kimi öz təəssüratımı bildirmək istəyirəm.

M.Araza nəzirə yazdığı «Salamat qal», «Bizim dost itirən vaxtımız deyil» kimi şerlərini oxuyarkən bu gözəl insanın, ilham sahibinin dünyadan vaxtsız getməsinə dönə–dönə təəssüf etmişəm.

Zəngilanı tərk edib Arazdan İrana keçmək məcburiyyətində qalarkən elə bil Hafiz bizim yanımızda durub Arazın sağ sahilindən sol sahilinə həsrətlə baxdığımız zaman bu şeri oxuyurdu:

*Ey gəlin bəzəkli boyalı dağlar,*
*Abırlı, ismətli, həyalı dağlar,*
*Dədəmin, babamın xəyalı dağlar,*
*Ayrılıq dəmidir, könlümü alın – Salamat qalın!*

Yeddi ildə çox–çox oğullarımızı, dostlarımızı itirməli olmuşuq. Bu ağır günlərdə elə bil Hafiz yanımızda durub mərsiyə üstündə «Bizim dost itirən vaxtımız deyil» şerini oxuyurdu:

*Tutub ha dünyanı qalan deyilik,*
*Əbədi məskən də salan deyilik,*
*Ömrü bir də satın alan deyilik,*
*Dostluqda hər anın qədrini bilək,*
*Bizim dost itirən vaxtımız deyil.*

Hafiz də itirilməli dost deyildi. Lakin nə etmək olar. Kövrək şair ürəyi namərd düşmənin Vətənimizə qarşı təcavüzünə dözmədi. Elə bil dünyadan vaxtsız gedəcəyi ürəyinə damıbmış. Bəlkə də bu kövrək misralar həmin hisslərin təsiri altında yazılıb:

*Hafizəm, yox işim şöhrətdə, şanda,*
*Yazaram, həvəsim hələ var canda.*
*Özüm olmayanda bir gün cahanda*
*Nəyim qalacaqdır sözümdən başqa?!*

Adam yalnız ondan təskinlik tapır ki, Hafizin gözəl poeziyası, Ə.Tağıyevin şairin «Qəşəngdir», «Azərbaycan oğluyam», «Mənim dünyam», «Yaz gəldi» və onlarca başqa şerlərinə bəstələdiyi mahnılar xalqımıza əbədi bir yadigar kimi qalıb.

**22 oktyabr 2002-ci il.** «İki Sahil»

# XATİRƏLƏR ÖMRƏ BƏZƏK...

N. Tusi adına APU–nun yanından keçəndə qeyri–ixtiyari olaraq Tofiq Mahmudun bu misralarını xatırlayıram.

***Liman kimi qalıb dəniz arxasında tələbəlik illərimiz.***
***Duman kimi can atsaq da o illərə çatmaz ancaq əllərimiz.***
***Ancaq ... Ancaq qəlbimizi, ruhumuzum alıb bizim.***
***O,illərdə neçə–neçə xatirəmiz qalıb bizim!***

Yarım əsr bundan əvvəl həmin binanın divarları arasında keçən tələbəlik illərinin xatirələri ömrün bu zirvələşən çağında elə hisslər doğurur ki, onu ifadə etməyə söz də tapmaq çətindir. Ancaq yaddaşın köməyi ilə həsrətini çəkdiyim o günlərə qovuşur və elə bil ki, onları yenidən yaşayıram.

Qrupumuza 30 nəfər qəbul olunmuşdu. Bu əvvəlki illərə nisbətən çox idi. Çünki müharibə ilə əlaqədar olaraq qəbul azalmışdı.

Nəhayət, dərslər başlandı. Hərəmiz bir rayondan gəlmişdik. Hamımız bir–birimizin kimliyi ilə maraqlanırdıq. Maddi ehtiyac bizi sıxsa da bütün bunlara dözür, yaxşı oxumağa çalışırdıq. Şamaxıdan Baba Xəlilov, Sultanpaşa Vəliyev, Naxçıvandan Əli Məmmədov, Hüseyn Bayramov, Qazaxdan Təyyar Musayev, Sədi Əfəndiyev, Bakıdan Qabil İmamverdiyev, Buzovnadan Əlibala Əliyev, Bakıdan Cəmil Ağayev bir–birimizlə daha yaxın ünsiyyətdə idik.

Bizim Zəngəzur zonasında qardaşa əzizləmə mənasında “qağa“ deyərlər. Mən də onlara həmişə belə bir müraciət edərdim. Bu söz Qabilin o qədər xoşuna gəlmişdi ki, elə hamımızı “qağa“ deyə çağırırdı. Ancaq elə əslində də bir–birimizə “qağa“ qardaş olmuşduq. Qrupumuzda olan bu mehribançılıq fakültəmizin başqa-başqa qruplarına da sirayət etmişdi.

Qabili bizdən əvvəl tanıyanlar ona «şair» deyə müraciət edirdilər. Təxəllüsü də Nikbin idi. Şer həvəskarı olan Əlibala «Zahir», Cəmil isə «Valeh» təxəllüsü daşıyırdı. Masallıdan Qurban adlı bizdən yaşlı, zarafatcıl bir yoldaşımız var idi. Onları birgə

görəndə «Vətən şairləri Qabil Nikbinə, Əlibala Zahirə, Cəmil Valehə eşq olsun!» – deyə salamlaşar və zarafat edərdik. Qabil də belə zarafatlardan geri qalan deyildi. Hətta bu cür zarafatlar üstündə bir dəfə institutun rektoru Ə.Seyidovun məzəmmətinə də düçar olmuşdu. İlk semestr sinfimizin bütün tələbələrinin qabiliyyətini üzə çıxartdı. Bir–birimizlə müqayisədən aydın dərk edirdik ki, kim–kimdən hansı cəhətdən üstündür. Bax,bu zaman hamımıza elə gəlirdi ki, Qabilin bizdən üstünlükləri çoxdur. Məsələn, biz semestr imtahanlarında müəllimlərin yazdırdıqları mühazilərdən kənara çıxa bilmirdiksə, Qabil mövzunu elə əhatəli danışırdı ki, ona həsəd aparırdıq. Doğrudan da onda yaradıcılıq təbi olduğu aydın nəzərə çarpırdı.

1945–ci ildə 2 semestrə özümüzə məxsus arzularla qədəm qoyduq. Ən başlıca arzu isə ancaq müharibənin qurtarması idi. Nəhayət 4 ildən bəri gözlədiyimiz gün gəlib çatdı. Bu münasibətlə institumuzda təntənəli mitinq keçirildi. Çıxış edənlərdən biri də Qabil oldu. Onun çıxışı və qələbəyə həsr etdiyi şeir çox hərarətlə qarşılandı.

Elə bil biz Qabilin qabiliyyətini yenidən kəşf etdik. Tədris proqramına uyğun olaraq vaxtaşırı tələbələrin bədii əsələrə aid yazdıqları referatlar müzakirə edilirdi. Qabilin L.N.Tolstoyun "Hacımurad" povesti haqqında yzdığı referat müzakirə olunarkən gözləmədiyimiz halda rektor Seyidov auditoriyaya daxil oldu. Qabil referatı yenicə oxumuğa başlamışdı. Rektor onun bir–neçə cümləsini elə ayaq üstə dinlədi, sonra keçib oturdu. Doğrusu buna təəccübləndik. Eynimizə belə bir fikir gəldi ki, bəlkə keçən il Qabili məzəmmət etdiyinə görə bura məqsədli gəlib? Qabil özünü itirmədən çox böyük həvəslə referatı oxuyurdu. Referat çox səviyyəli yazılmışdı. Dinlədikcə Ə. Seyidovun üz–gözündən məmnunluq duyulurdu. Professoru referatı axıra qədər dinləməyə də sövq edən məhz bu olmuşdu. Əhməd müəllimin institutda belə bir istedadlı gəncin oxuduğuna necə sevindiyi aydın hiss olunurdu. Buna görə də Qabilə çox səmimi sözlərlə öz xoş arzularını bildirdi. Bütün qrupumuz sevindi. Bu, həm də bizdə Qabilin gələcək uğurlarına inam yaratdı.

İnstitut illəri arxada qaldı. O əziz və unudulmaz tələbəlik illəri xatirələrə çevirildi. Adətən, tələbələr belə məqamlarda çox kövrəlir, gələcəkdə tez–tez əlaqə saxlamaq, məktublaşmaq, bir–birini unutmamaq arzusu ilə ayrılırlar. Qabil və Baba ilə mən də bu arzu ilə ayrıldıq. Baba Şamaxıya, mən Qubadlıya, Qabil isə Yardımlıya təyinat aldı. Vədimizə əməl edərək vaxtaşırı məktublaşırdıq.

Bir dəfə «müəllim» qəzetində Qabilin «Kənd müəllimi» adlı bir şerini oxudum. Hərçənd burada heç bir lirik motiv yox idi, ancaq eynimə gəldi ki, qağamın qəlbinə deyəsən məhəbbət düşüb. Qabilin özünə məktub yazıb bu barədə ona bir eyham vurdum. 1949–cu il 18 sentyabr tarixli məktubunda Bəyim xanımla nişanlandığını, nişanda da məşhur şair Məmməd Rahimin də iştirak etdiyini yazmışdı. Bu mənim üçün son dərəcə xoş xəbər idi. Mahnılarda deyildiyi kimi, axı dostum evlənirdi!..

1950–ci ildə Qabilin “Səhər açılır“ adlı ilk kitabı çapdan çıxdı. Çox sevindik. Ancaq bu bizim üçün gözlənilməz deyildi. Çünki kitabda verilən “Həyat eşqi“, “Ananın sözləri“, “Yetim segahı“, “Mənim romantikam“, “Qara şanı“, “Ürəyim nəşəlidir“ və s. şerlərin ilk oxucusu kimi onun istedadına inanmışdım. Bunu Qabil istedadının açılmaqda olan səhərinin rəmzi hesab etmək olardı. İnanırdıq ki, o, nə vaxtsa öz zəhməti ilə istedadının zirvəsini fəth edəcəkdi.

Bakı, Vidadi küçəsi 139.

Birmərtəbəli ikiotaqlı bu mülk 1950–ci illərdəki kimi Qabilin ata evinin ünvanı idi. Qabilin anası Suğra nənənin bu evdə çox nəvazişini görmüşük. Müstəqil həyata başlayandan sonra da ev Baba ilə mənə iqamətgah idi. Bakıya gələn kimi mütləq burada görüşərdik. Bu görüşdən Suğra nənə xüsusi ilə xoşhal olardı. O bizim Qabillə dostluğumuzdan çox razı idi. Çünki Qabil ailənin yeganə övladı idi. Həm də yaxın qohum əqrabası çox deyildi.

1950–ci ilin yayında yenə də Baba ilə Qabilgildə görüşdük. Qabil də evlənmişdi. Hər üçümüz ailə başçısı, dost kimi ailə qayğılarımızdan danışdıq. Tələbəlik illərimizin xatirələrini həsrətlə vərəqlədik. Xeyli söhbətdən sonra “İnturist“ə getməyi qərara aldıq. Axı tələbəlik illərində bir dəfə də olsun heç bir dəbdəbəli yer-

də yeyib–içməmişdik. Baba tez durub hərəmizə bir zənbil verib içini günəbaxan tumu ilə doldurdu.

– Dalımca gəlin. Arxayın olun, sizi tanıyan olmayacaq, forslanmayın. Özüm satacağam hamısını bir yerdən.

Qabilgilin evinin yaxınlığındakı Yəhudilər məhəlləsinə gəldik və tumun hamısını bir yerdən satdıq. Onda başa düşdük ki, bizə sürpriz göstərir, restoranın xərcini özü çəkəcəkdir. Birinci dəfə idi ki, belə ürək açıqlığı ilə üç dost oturub tələbəlik illərində çəkdiyimiz korluğun, necə deyərlər heyfini çıxırdıq.

Bakıya gələndə heç elə bir hal olmayıb ki, Qabilin ailəsi ilə görüşməyim. Elə vaxtlar olub ki, bunu eşidən Baba da Bakıya gəlib. Oğlu Mahirin ad günündə, həmçinin başqa vaxtlarda dəfələrlə Qabilin evinə gəlib görüşmüş, İsa Hüseynov, Salam Qədirzadə, Əliağa Kürçaylı, Məsud Əlioğlu, Abram Plavnik, İsi Məlikzadə, Hüseyn Abbaszadə və başqaları ilə də burada tanış olmuşam.

Rayonların birləşməsi ilə əlaqədar olaraq Zəngilan rayonuna köçmüş və burada rayonlararası qəzetdə redaktor işləyirdim. 1964–cü ilin  sentyabr ayı idi. Səhər işə gəlib təzəcə  materialları oxumağa başlamışdım ki, mədəniyyət şöbəsinin müdiri Camal Sultanov Qabil və nazirliyin bir nəfər işçisi ilə içəri daxil oldu. Az qala gözlərimə inanmadım. Xeyli vaxt görmədiyin əziz bir dostunu gözlənilmədən birdən–birə öz yanımda görmək necə də həyəcanlandırıcı olurmuş!

Ailəmiz və bütün qohumlarım da bilirdi ki, biz tələbəlik illərindən Qabillə necə münasibətdə idik. Ezamiyyətə gəlsə də şəxsi qonağımız  kimi onun ehtiramında necə lazımdısa durduq.

Sonra onun yerli radioda çıxışını verdik. Həvəskarlarla görüşünü təşkil etdik. Bunlar nəzərdə tutulmuş ezamiyyə məsələsinə aid deyildi. Sadəcə mən onu rayon ictimaiyyətinə tanıtmaq istəyirdim. Əməkdaşlarımızdan biri bu tədbirdən razı qalıb qalmadığını soruşduqda çox səmimiyyətlə dedi:

Mən Səməd Vurğun deyiləm ki ... Mənə elə bu da bəsdir,bu da xoşdur.

Artıq Qabilin öz yaradıcılıq zirvəsinə doğru irəliləmək üçün daha inamla axtarış aparmaq potensialı diqqəti cəlb edəcək dərə-

cədə təzahür etməkdə idi. 60–cı illərin ortalarından başlayaraq üzərində işlədiyi və 1970–ci ildə isə kitab halında nəşr olunan “Nəsimi“ poemasının birinci hissəsi buna aydın ümid verirdi. Nəsiminin anadan olmasının 600 illiyi ilə əlaqədar olaraq poemanın 1976–cı ildə Azərbaycan Dövlət Mükafatı Laureatına layiq görülməsi isə şairin çox böyük uğuru idi. Qabil taleyin bəxş etdiyi istedadını ardıcıl axtarışları, gərgin zəhməti, ilə reallaşdırmış oldu.

Bir dəfə seminara çağrılmışdım. Ona zəng vurub hal–əhval tutdum. Məni təkidlə evə dəvət etdi. İki gündən sonra gələcəyimi söylədim. Bir gün keçəndən sonra bir də gördüm Baba ilə birlikdə seminar keçirilən yerə gəliblər. Baba əl çəkmədi ki, gərək sizi aparım Şamaxıya. Qabil gedib kursun rəhbərindən mənə icazə aldı. Təbiətin təzə oyanan vaxtı idi. Yol söhbəti isə qəlbimizdə uyumuş xatirələri oyatmağa başlamışdı. Nədən söhbət edirdiksə, yenə də söz tələbəlik illərinin o məsum çağlarının üstünə gəlirdi. Bu yerdə Qabilin sonralar yazdığı rübailərdən birini indi xatırlamalı oldum.

***Xatirələr ömrə bəzək,***
***İnci–inci, çiçək–çiçək,***
***Yellər əsər, can üşüyər,***
***Xatirəsiz qalsa ürək.***

Bizim ürəyimiz isə tələbəlik illərinin xatirəsi ilə dolu idi. Bu xatirələr qəlbimizi isindirir, bizi bir–birimizə daha da yaxınlaşdırır, dostluğumuzu möhkəmləndirir. Fəxr edirdik ki, 1944–cü ildən başlanan dosluğumuzu davam etdiririk. Bir-birimizə ailəlikcə qovuşmuşuq. Baba ilə çalışmışıq ki, aramızdakı dostluq əlaqələri Qabilin yazıb yaratmasına xoş bir ovqat bəxş etmiş olsun. Qabil isə dostluğumuzu rübailərinin birində belə mənalandırırdı:

***Dostluq – qranit dağı,***
***Dostluq qönçə yarpağı,***
***Dostluq – dözümdə dəvə,***
***Dostluq ürəyin yağı.***

Dostluq nə qədər əvəzsiz mənəvi nemətdirsə, onu itirmək bir o qədər ağırdır. Bu ağır kədəri 1982–ci ildə 56 yaşlı, onun 38 ilini isə dostluq etdiyimiz Babanın öz dünyasını dəyişərkən çəkməli olduq. Vəfatından sonra Bakıda Qabillə görüşəndə onun xatirəsini birlikdə yad etdik. Mən son dərəcə kövrəlib özümü saxlaya bilmədim. Məni ən çox təsirləndirən Qabilin bu rübaisi oldu:

***Baba kimi dostum getdi,***
***Üstündə çox əsdim getdi...***
***Bundan belə Şamaxıya***
***Havalanmaq şəstim getdi!***

Dostumuzun vəfatından 14 il keçsə də onun xatirəsini həmişə əziz tutur və bundan təskinlik tapırıq ki, çırağını ömür yoldaşı mehriban Nəzihə bacı və övladları şöləlləndirir, dostluq ənənəmizi isə etiramla davam etdirirlər.

70 il bundan əvvəl avqustun 12–də Azərbaycanda nə qədər uşaq doğulduğunu statistik məlumatlardan bilmək olar. Onların hər biri öz taleyini yaşamışdır. Qabil isə şair olmuşdur. Tale onun yerini səhv salmamışdır. Onun Əməkdar İncəsənət Xadimi adına, Dövlət Mükafatı Laureatına layiq görülməsi, görkəmli şair və publisist kimi Atatürk adına Türkiyə Mədəniyyət Linqvistika və Tarix Cəmiyyətinə üzv seçilməsi və ən nəhayət Xalq şairi kimi yüksək fəxri ad alması bir neçə ilin deyil, düz yarıməsrlik yaradıcılıq axtarış və uğurlarının bəhrəsidir.

1980–ci ildən sonra o daha məhsuldar işləmişdir. Bu dövrdə onun ikinci dəfə “Nəsimi“ poeması və “Rübailər“, “Adsız balıqlar“, “Nağaraçı“, “Gülləboran eylədilər“ kitabları, xalq yazıçısı İsmayıl Şıxlının dediyi kimi, şair ürəyinin harayı olan “Ömür həbləri“ romanı, mətbuatda bir çox təsirli şerləri çapdan çıxmışdır.

Qabilin şerlərinin təhlilə ehtiyacı yoxdur. Elə yazmışdır ki, oxucu onu təhlilsiz də belə aydın dərk edir. Buna görə Qabil sevilə–sevilə oxunur. “Təmizlik“, “Səhv düşəndə yerimiz“ kimi onlarla bu cür şerləri, rübailəri dillər əzbəridir.

Qabilin bu gün Vətənimizin, xalqımızın bu ağır, dözümlü günlərdə öz haqq səsini ucaldıb, şair–vətəndaşlıq borcunu millət

harayını unutmur. Bu sətirləri yazan məqamda o mənə lap təzə yazdığı “Hava necə olacaq ?“ şerini oxudu.

***Həqiqi şairə Vətən möhtacdır,***
***Şair öz xalqının başına tacdır.***
***Şer igidlərə, qəhrəmanlara***
***Bərkdə ürək–dirək, darda əlacdır.***

Qabilin bu rübaisi onu şəxsi və yaradıcılığı ilə necə də həmahəng səslənir!

**07 avqust 1996-cı il. «İki Sahil»**

## ƏKİNÇİNİN MUZEY EKSPONATLARI

Zəngəzur mahalının Zəngilan bölgəsindən ucqar dağ kəndlərindən olan Sarallı Xəştabda Cəfər adlı bir cütcü baba nağıllaşmağa layiq olan ibrətamiz bir ömür sürmüşdür.

İyirminci illərdə ucqar kəndlərdə ilk məktəblər açılanda onun 24–25 yaşı var idi. Bu yaşda 7–8 yaşlı uşaqlarla parta arxasında oturmaq çox gec idi. Ona görə əlifbanı gecə kurslarında öyrənməli oldu. Ancaq çox işgüzar, səriştəli necə deyərlər, əlindən inli–cinli qurtarmazdı.

O vaxtı ilə bəylərin:

**Cütcü babasan, buğdanı ver darı yeyərsən,**
**Su olmasa qışda əridib qarı yeyərsən.**

– deyərək istehza etdikləri cütcü babaların sələflərindən olsa da zəhməti ilə nə buğdanı verib darı yeyəndi, nə də su əvəzinə qarı içərdi. Özünə əməlli başlı güzəran yaratmışdı.

Cəfər baba həm də kənd ustası idi. Dəmirçilik, dülgərlik edərdi. Körüyünün kürəsində qızartdığı dəmiri çəkicinin altında mum kimi yumşaldıb orağa, çinə, dəryaza, dəhrə–baltaya çevirərdi. Ən çox xış, vəl, şana–kürək, sapı, boyunduruq və başqa əkinçilik alətləri qayırmaqla məşğul olardı.

Alətləri düzəltmək üçün günlərlə meşələri gəzib ən bərk, lakin asan yonqara gələn, müvafiq alətləri düzəltməyə yarayan ağaclar axtarıb tapmalı olardı. Məsələn vəl düzəltmək üçün dairəsi ən azı 80–90 santimetr palıd ağaçı lazım gələrdi. Belə ağacı kəsib öküzlərə qoşub 15–20 kilometrlik məsafədən gətirmək, onları yonub formaya salmaq üçün cütcü babanın, necə deyərlər, köynəyi tərdən dönə–dönə sıxılmalı olardı. Kənddə müstəqil həyata qədəm qoyan hər bir gənc əkinçi dözümünün nə demək olduğunu Cəfər babanın timsalında görərdi.

O zaman bu ucqar kənddə texnika adında heç bir şey yox idi. Camaat telefonun, radionun yalnız adını eşitmişdi. Rayondan olan xəbərləri ancaq ora gedib–gələnlər və ya göndərilən xüsusi nümayəndələr gətirirdilər. Həmin gün kəndə gələn atlı biçinçilərin diqqətini uzaqdan cəlb etdi. O bir başa biçinçilərin yanına gəlirdi. Bayram əhval–ruhiyəsi ilə işləyən kənd sakinlərinin heç ağlına da gəlmirdi ki, indicə sarsıdıcı bir xəbər eşidəcəklər. Müharibə!..

Yaşlı nəsillərin nümayəndələri bu xəbəri eşidərkən keçirdikləri həyəcanı, sarsıntını indi də unutmamışlar...

Bir aydan sonra kənddə 50 yaşa qədər bir kişi belə qalmadı. 30 nəfər səfərbərliyə alınıb cəbhəyə göndrildi. Cəfər baba da öz çin–önlüyünü silahla əvəz etdi. 1400 gündən çox ölümlə üz–üzə durub at arabası ilə top mərmisi daşıya-daşıya 416–cı Taqanroq diviziyasının tərkibində Qafqaz dağlarından Berlinə qədər şərəfli döyüş yolu qət etdi...

Nəhayət qələbə günün sevinci qapıları döydü. Cəfər baba xoşbəxtlikdən sağ–salamat qayıdıb yenə də öz çini–önlyünü götürüb zəmi biçdi, xış qayırdı, körüyünün kürəsi bir an belə boş qalmadı, kərkisinin səsi ara vermədi.

İllər keçdi. Artıq bu dağ kəndinə də texnika gəlib çıxırdı. Alınan yeni texnikalar Cəfər babanın indiyə qədər düzəltdiyi alətləri dəbdən salırdı.

1960–cı ildə onunla görüşərkən dedi:

– Ay oğlum, bu xışların şəklini çək, qoy yadigar qalsın. Bizdən sonra gələnlər onu təsəvvür edə bilməyəcəklər. Heç olmasa

bu şəklə baxıb görsünlər ki, ata–babalar hansı alətlərlə necə çörək qazanırmışlar.

Onun xahişini yerinə yetirib şəkli çəkib və söhbətlərindən bəzi məqamları yazdım.

O torpaq haqqında kitablarda yazılan ilhamlı sözləri oxumamışdı. Ancaq onun əkinçi haqqında, torpaq haqqında söhbətləri, doğrudan da ibrətamiz idi. Onun dediklərindən bəzi epizodlar:

– Əkinçi gərək halal olsun, səxavətli olsun. Bilsin ki, torpağa atdığı toxum təkcə özü üçün deyildir. Ona görə ata–babalarımız toxumu ovuc–ovuc səpəndə deyirmiş: bu bir ovuc qarışqanın–quşun, bu bir ovuc – nəzir–niyazın, xüms–zəkatın, bu bir ovuc xırman üstə gələnin, qismət üstə çıxanın, bu bircə ovuc da mənim...

– Əkinçi biçin qabağı bir sünbülün dənəsini saymaqla özünün bütün zəmisinin məhsuldarlığını, onun il boyu ailəsinə çatıb–çatmayacağını hesablamağını bacarmalıdır...

1960–70–ci illərdə alınan yeni–yeni texnika doğrudan da Cəfər babanın düzəltdiyi bütün əl əkinçilik alətlərnin muzey eksponatlarına döndərdi. 1982–ci ildə rayonda tarix–diyarşünaslıq muzeyi təşkil ediləndə onun vaxtı ilə düzəltdiyi əkinçilik alətlərinin bütün nümunələri, xidmət etdiyi 416–cı Azərbaycan diviziyası barədə dissertasiya yazmış, onun döyüş yolu xəritəsinin tərtibçilərindən biri Respublika Vətən Müharibəsi Veteranları Şurasının fəal üzvü Rizvan Zeynalovun ona avtoqrafla bağışladığı həmin xəritə, habelə döyüşlərdə tərtif olunduğu «Qırmızı ulduz», «Qırmızı əmək bayrağı» ordenlərinin, beş döş medalının sənədləri, 8 fəxri fərman və təşəkkür muzeyin bölmələrinin birində nümayiş etdirilirdi. Muzeyin açılışına gələrkən vaxtı ilə düzəltdiyi alətlərinə özünün təkidi ilə 25 il əvvəl jurnalistə çəkdirdiyi şəklinə baxanda xeyli kövrəldi. Zəhmətlə keçən 90 illik ömrünü sanki yenidən yaşadı. Onun ömrü isə Azərbaycan əkinçisinin əsrimiz də keçdiyi yolun tarixidir.

Cütcü baba nə qədər zəhmət çəkmiş olsa da buna təəssüf etmirdi. Çünki bu zəhmət nəticəsində onun çuvalından taxıl, təknəsindən çörək, qapısından mal–qara, arıxanasından pətək, süfrəsindən süd–qatıq, yağ–bal, şor–pendir əksik olmamışdı.

Tarlalarda işləyən texnikalara baxanda təkcə gəncliyində belə texnikanın olmaması üzündən onu öyrənə bilmədiyinə heyfsilənirdi. Ancaq Cəfər baba ondan təsəlli tapırdı ki, onun itirdiyini övladları, nəvələri tapmışdı.

Ancaq heç ağlına da gəlməzdi ki, elə bir vaxt gələ bilərmiş ki, nağıllarda deyildiyi kimi, yağı ermənilər xaincəsinə hücum edib var–dövlətini yağmalayacaq, yurdunu tarmar edib, sakinləri didərgin salacaq, özündən isə şəkildən başqa bircə nişanə də qalmayacaqdır. Bu təkcə onun deyil, Kəlbəcər, Laçın, Ağdam, Füzuli, Cəbrayıl, Qubadlı, Zəngilan kimi ağır ellərin əkinçilərinin hamısının başına gələn bir faciə olacaqdır. Lakin dövran belə qalmaz. Vaxt gələr xalq özündə qüvvə tapıb işğal olunan torpaqları azad edər, didərginlər geri dönər, hər şey kimi tarix–diyarşünaslıq muzeyləri də bərpa olunar. Onda jurnalistin vaxtı ilə çəkdiyi bu şəkil və onun bu təəssüratı muzeyin yeni eksponatına çevrilər. Elə bu təəssürat da həmin inam və arzu ilə yazılmışdır.

**10 fevral 1996-cı il. «İki Sahil»**

## İKİ CƏBHƏNİN VETERANI

**Ömürdən keçib tarixə çevrilmiş, yaddaşlara yazılıb xatirələrə dönmüş günlər zaman-zaman xatırlandıqca adamlar xəyalən o günlərə qovuşur. Acılı-şirinli bu xatirələr adamda, hətta sözlə ifadəsi çətin olan qəribə hisslər oyadır.**

Peşə xidməti ilə əlaqədar olaraq 1941–45–ci il müharibəsinin yüzlərlə iştirakçısı ilə görüşmüş, onların xatirələrini dinləmiş, döyüş şücaətləri haqqında neçə–neçə məqalələr yazmışam. Hər dəfə onların döyüş şücaəti məni heyrətləndirmiş, qəlbimdə sonsuz iftixar hissi doğurmuşdur. Buna görə adamlar haqqında yazıb onların xidmətlərini yeni nəsillərə çatdırmaqda həmişə qəlbimdə bir rahatlıq tapmışam. Bax elə bu əlamətdar gündə belə adamlardan söhbət açmağı özümə mənəvi bir borc hesab edirəm.

Həsən Məmmədov gənclərə məxsus həyat arzuları ilə yaşayırdı. Orta məktəbi qurtaranda sənədlərini tibb institutuna vermək

istəyirdi. Təəssüf ki, buna nail ola bilmədi. O zaman kəndlərdə çox peşələrə ehtiyac var idi. Müəllimə də ehtiyac az deyildi. Ona görə sənədlərini Qaryagin (indiki Füzuli rayonu) Pedaqoji Texnikumunda müəllim hazırlayan qısamüddətli kursa təqdim etdi. Kursu qurtaran kimi onu Cambar məktəbinə müəllim təyin etdilər. Ancaq ona heç bir il tam müəllim işləmək nəsib olmadı. Müharibə başlandı.

1941–ci ilin sonunda onu səfərbərliyə alıb Bakı piyada qoşunları məktəbinə göndərdilər. Burada bir neçə ay təhsil aldıqdan sonra Krım cəbhəsinə yola saldılar. Onda Həsən müəllimin 20 yaşı var idi. Beləliklə, o öz gəncliyinin ən gözəl çağlarını düz 4 ilini gecə–gündüz əsgər şinelində Şimali Qafqazdan Berlinə kimi hər dəqiqə ölüm gözlənilən döyüş yolu keçmişdir.

Budur, zamanın saraltdığı əsgəri sənədləri qarşımdadır. İlk döyüş Taman yarımadasında düşmüşdür. Şimali Qafqazda gedən döyüşlərdə 2 dəfə yaralanmış və yenidən müalicə olunub döyüşə getmişdir. İlk təltifi «İgidliyə görə» medalı da elə həmin vaxt almışdır. Sonra minamyot batareyasında 1 rotanın komandiri kimi Kerçin, Sevastopolun, Feodesiyanın azad edilməsində fəal iştirak etmişdir. Onun xidmət etdiyi 383–cü diviziyanın 24 min alman əsgərinin əsir alınmasında xidməti xüsusilə böyük olmuşdur. Krım uğrunda gedən döyüşlərdə fərqlənən bir çox əsgərlər kimi H. Məmmədov da ikinci və üçüncü dərəcəli «Vətən müharibəsi» (*Bu «Ş*öhrət Ordeni *olmalıdı. «Vətən müharibəsi» ordeninin yalnız I və II dərəcəsi var III yoxdu. Bu çox güman ki, texniki səhvdi Ə.S*) ordeni ilə təltif olunmuşdur. Həsən müəllimin arxivində 3 nömrəli minamyot rotasının komandiri osetin Quzoyev, 2 nömrəli rotanın komandiri ukraynalı Xlustunovla birlikdə çəkdirdikləri şəkil həmin qanlı–qadalı günləri xatırlamağa imkan verən əvəzsiz bir yadigar kimi saxlanmaqdadır.

Sonra H.Məmmədov Jukovun komandanlıq etdiyi Birinci Belorus cəbhəsinə keçib Belorusiyanın, Polşanın azad olunmasında, Berlinin alınmasında iştirak etmiş, Reystaqın divarlarına öz imzasını atanlardan biri olmuşdur. Bütün bu döyüşlərdən ona 4 orden,

12 medal və komandanlığın bir çox təşəkkür məktubları yadigar qalmışdır.

İndi bu tarixi hünər haqqında o qədər aşağı səviyyədə düşünənlər var ki, adam təəccüblənməyə, təəssüflənməyə bilmir. Hətta bu orden medalları gəzdirənlərə həqarətlə baxanlar da vardır. Ancaq beləlәri Həsən müəllimin və onun kimi döyüş yolu keçmiş adamların həyatını yaşamış olsaydılar, nə qədər yanıldıqlarını dərindən dərk etmiş olardılar.

Həsən müəllim 1946–cı ildə tərxis olunub qayıtdıqdan sonra öz sevimli müəllimlik peşəsini həvəslə davam etdirmiş, yarımçıq qalmış ali təhsilini başa vurmuş Zəngilan işğal olunana kimi fasiləsiz olaraq Canbar, Bürünlü, Şayıflı məktəblərində direktor işləmiş, 1994–cü ildən sonra məskunlaşdığı Xətai rayonunda Zəngilanın 13 saylı qaçqın məktəbində öz pedaqoji fəaliyyətini davam etdirməkdədir.

Öz pedaqoji ustalığına, bacarıqlı, təşkilatçı məktəb rəhbəri kimi Həsən Məmmədov Zəngilanın ən nüfuzlu maarif işçilərindəndir. Onun yüzlərlə yetirməsi həyatda özlərinə fəal mövqe qazanmışdır. Onların arasında hər cür ixtisas  sahibi vardır.

Həsən müəllim Maarif Nazirliyinin dəfələrlə təşəkkürünü, fəxri fərmanını almış, metodist müəllim fəxri adına layiq görülmüşdür.

Səkkizinci onilliyin astanasında iki cəbhənin veteranı olan Həsən müəllim özünə  nurlu bir ahıllıq qazanmış, nəsillərə nümunə ola biləcək bir ömür yaşamışdır.

Bu ixtiyar çağında doğma yurddan didərgin düşüb qaçqınlıq dərdi ilə yaşamaq çox çətindir. Bu , elə gələn bir dərd olsa da ona dözüb yaşamaq təmkin tələb edir. Müharibə və əmək veteranları rayon şurası adından Həsən müəllimi və onun timsalında bütün veteranlarımızı hərarətlə təbrik edir və ən xoş arzularımızı bildiririk.

**15 iyun 2005-ci il. «Vətən səsi»**

# AZƏRBAYCAN TEATRI - 125

***Səhnəmizin Cahandar ağası***

Mövqeyindən, peşəsindən asılı olmayaraq bütün adamlar tanınmış ədəbiyyat və incəsənət xadimlərinə böyük maraq göstərirlər. Onlarla şəxsən görüb tanış olmağı hamı arzu edir. Buna nail olanların təəssüratı isə yaddaşlarda unudulmaz bir xatirəyə çevrilir.

Peşəmlə əlaqədar olaraq belə xadimlərin bəziləri ilə müxtəlif vaxtlarda görüşüm qəlbimdə xoş təəssürat doğurmuşdur. Onlardan öz dünyalarını dəyişənləri həmişə ehtiramla xatırlayır, sağ qalanlarının yaradıcılığını isə maraqla izləyirəm.

Bu günlərdə İsmayıl Şıxlının “Ölən dünya“ romanını oxuyarkən onunla ilk tanışlığımı, “Dəli Kür“ romanını, onun kinosunu sözlə ifadə etməyə çətinlik çəkdiyim bir heyranlıq və kövrəkliklə xatırladım.

Mən APİ–də tələbə olarkən İsmayıl Şıxlı 1946–cı ildə ordudan tərxis olunub aspiranturaya oxumağa gəlmişdi. O, ədəbiyyat kafedrasında müəllim işləyirdi. Onun elmi rəhbəri professor Əli Sultanlı idi. Professor bizim sinfə dünya ədəbiyyatından dərs deyirdi. Buna görə də sinfimiz Əli müəllimin aspirantı, həm də çox mehriban, sadə və təvazökar insan kimi İsmayıl Şıxlıya böyük ehtiram bəsləyirdi. Ancaq heç təsəvvürümüzə gəlmirdi ki, illər keçəcək, o, respublikanın xalq yazıçısı kimi yüksək nüfuz sahibi, “Dəli Kür“ romanı və onun ekrana çıxarılması ilə ədəbiyyatımıza böyük xidmət göstərmiş olacaqdır.

Ekrana buraxılandan bəri “Dəli Kür“ kinosuna nə qədər baxdığımın sayını xatırlaya bilmirəm. Ancaq bundan sonra da neçə dəfə baxsam belə, yenə də yorulmaram. Əsərin hər bir iştirakçısı bitkin bir ədəbi obrazdır. Onun əsas qəhrəmanı Cahandar ağa obrazı isə sözün əsl mənasında çox böyük ustalıqla yaradılmışdır. Demək olar ki, İ.Şıxlının yaradıcılıq tapıntısıdır. Cahandar ağa uzun illər bizə təbliğ edilmiş əzazil bəy kimi təəssürat yaratmır. Yazıçı bütün kişilik, mərdlik, məğrurluq kimi milli xüsusiyyətləri Cahandar ağanın timsalında çox məharətlə əks etdirə bilmişdir.

Buna görə də bütün ziddiyyətləri ilə bərabər tamaşaçı, oxucu Cahandar ağaya rəğbət bəsləyir.

Çoxları kimi, mən də bu klassik obrazı ekranda məharətlə yaratmış aktyor Ələddin Abbasova həmişə pərəstiş etmişəm. Ələsgər Ələkbərov "Böyük dayaq"da Rüstəm, Həsən Turabov "Yeddi oğul istərəm"də Gəray bəy, Adil İsgəndərov "Axırıncı aşırım "da Kərbəlayı İsmayıl rolunu nə səviyyədə oynamışlarsa, Ələddin Abbasov da Cahandar ağanı o səviyyədə oynaya bilmişdir.

Təəssüf ki, onunla şəxsən görüşmək üçün məqam düşmürdü. Belə bir məqam "Günəşli" sanatoriyasında müalicə olunarkən düşdü. Korpusun foyesində görən kimi tanıdım.

– Səhnəmizin Cahandar ağasına eşq olsun! – deyə şuxluqla onu salamladım.

O, məni heç zaman görmədiyinə baxmayaraq, mənim şuxluqla onu salamlamağıma heç təəccüblənmədi və köhnə tanışı kimi görüşdü. Onun təəccüblənməsi də təbii idi. Axı. özü demişkən, İsmayıl Şıxlı onu bütün respublikaya tanıtmışdı. Kim bilir, Mənim kimi neçə–neçə adam ona elə birbaşa ərköyünlüklə Cahandar ağa – deyə müraciət etmişdi. Elə sanatoriyanın özündə də bunun dəfələrlə şahidi oldum.

Müalicə olduğumuz müddətdə tez–tez görüşüb müxtəlif məsələlərdən söhbət açırdıq. Məni ən çox onun fəaliyyəti, oynadığı rollar və bu rollar üzərində necə işləməsi maraqlandırırdı.

Ələddin Abbasovun bu il 75 yaşı tamam olmuşdur. Ömrünün 50 ilini Gəncə Dövlət Dram Teatrına həsr etmişdir. Onun səhnəsində C.Cabbarlının əsərlərində olan Oqtay Eloğlu, Aydın, Yaşar, Elxan, "Qatır Məmməd"də Məşədi Göyüş, "İstintaq"da Seyfi və bir çox başqa rolları məharətlə ifa edib tamaşaçı rəğbəti qazanmışdı. Ancaq onun "Dəli Kür" kinosunda ifa etdiyi Cahandar ağa rolu aktyorun yaradıcılığında zirvə hesab olunmağa layiqdir. Bu obrazı səhnədə oynamaq hər aktyora nəsib olmaz. Təsadüfi deyildir ki, Ələddin deyir ki, əgər Ələsgər Ələkbərov onda sağ olsaydı, bu rolu mənə verməzdilər. Mən də heç ona çəkilməyə razı olmazdım.

– Bəs necə oldu ki, bu rolda sizi çəkdilər?

– Rejissor Həsən Seyidzadə məni əvvəl Allahyar roluna çəkmək istəyirdi. Sonradan mənə teleqram verib Bakıya çağırdılar və Cahandar ağa roluna sınaq çəkilişi apardılar. Məndən əvvəl bir neçə aktyorun da sınaq çəkilişi aparılmış, ancaq bəyənilməmişdir. İsmayıl Şıxlı ilə studiyada görüşdüm. Onun özü də güman etmirdi ki, bu rolun öhdəsindən gələ bilərəm. Sınaq çəkilişinin kadrlarına baxdıqdan sonra bəyənib razı oldu. Beləliklə, rejissorla rol üzərində gərgin işləməli oldum. Yazıçı obrazı elə mükəmməl işləmişdi ki, bu, məni ekranda obrazı daha dolğun yaratmağa ruhlandırırdı.

Əsərlə filmin sonluğu arasında fərq vardır. Bunun səbəbini soruşanda o belə izah etdi:

– Əsərdə belə bir epizod var ki, general Cahandar ağanı çağırıb deyir ki, qoruğun canişin Varantsovun xoşuna gəlib. Cahandar ağa deyir ki, mən onu pulla almamışam, babamdan yadigar qalıb. Oranı satmıram.

Səhəri xəbər gətirirlər ki, qoşun qoruğu zəbt etmişdir. Cahandar ağa gəlib görür ki, kazakların böyüyü ağacların altında oturub kababla araq vururlar. Soruşur ki, bu, nə həngamədir? Cavab verirlər ki, ay bəy, bura daha sənin deyil, zəbt etmişik.

Cahandar ağa deyir ki, dur burdan zir–zibilini yığışdır, rədd ol! Kazakların böyüyü isə “bəy, deyəsən, ürəyindən sürgün keçir“ – deyə cavab verir.

Sonra atışma başlanır. Cahandar ağa çox kazak öldürür. Gülləsi tükənir. Qaçıb özünü Kürə atmaq istəyir. Kazaklar onu arxadan vururlar.

O vaxt Moskvada bu epizodla razılaşmadıqları üçün belə bir finalla kinonu ekrana buraxmaq istəmirlər. Adi bir azərbaycanlının bir sürü rus kazakını öldürməsi onların heysiyyətinə toxunurdu. Kinoda bu, məişət münaqişəsi zəminində – Cahandar ağanın guya Allahyarın adamları tərəfindən arxadan vurulması ilə əlaqələndirilir.

Aktyor bunu da əlavə etdi ki, həmin lenti studiyanın özündə kəsib arxivə atmışlar. Sonradan onu operatorun köməkçisi olan bir rus oğlan tapıb. İndi belə bir fikir var ki, həmin lentlər filmə əlavə ediləcəkdir.

Müalicə müddətində hörmətli aktyorla yaxından tanış oldum. Onun çox sadə, mehriban, təvazökar olması diqqətimi elə ilk tanışlıqdan cəlb etdi. Oynadığı rolların yüksək mənəvi keyfiyyətləri elə bil onun, necə deyərlər, canına, qanına hopmuşdur.

Hazırda Azərbaycan teatrının 125 illiyi qeyd edilir, onun keçdiyi yola, səhnə ustalarının yaradıcılığına dönə–dönə nəzər salınır. İnanıram ki, məşhur obrazlar qalereyası yaratmış istedadlı aktyorlarımızla bərabər, Gəncə Dövlət teatrının qocaman aktyoru Ələddin Abbasov da teatrımızın tarixinə səhnəmizin Cahandar ağası kimi daxil olacaqdır. Bu gün isə ona yeni–yeni yaradıcılıq uğurları qazanmaq üçün möhkəm can sağlığı arzulayırıq.

**13 dekabr 1998-ci il. «İki Sahil»**

## Milli mətbuat günü

### Həmkarlarım haqqında xatirə və təəssüratlar «Möcüzəsiz möcüzə»nin müəllifi

Çoxdan görüşmədiyinlə görüşmək arzusu adamda həmişə xoş hisslər doğurur. Mən də belə hisslər keçirə-keçirə xeyli müddət görüşmədiyim xəstə bir həmkarımla görüşə tələsirdim.

Onun Qubadlının Məmər kəndində olan bacısının evinə gətirildiyini eşitdim. Mən onda Zəngilanda işləyirdim. Buna görə onun yanına getməli oldum. Necə vəziyyətdə olduğunu təsəvvürə gətirə bilmirdim. Görüşərkən keçirdiyim sarsıntını güclə gizlədib zahiri bir təmkinlə hal-əhval tutmağa başladım.

Onun üzgün baxışları, taqətsiz, zəifləmiş bədəni, əllərinin üstündə ağac kökləri kimi şaxələnmiş damarları özgəsinin köməyi olmadan o tərəf-bu tərəfə dönə bilməməsi məni elə qəhərləndirirdi ki, az qala ağlamaq istəyirdim. Əslində ağlayırdım, ancaq göz yaşlarım yanaqlarıma deyil, ürəyimə axırdı. Elə zənn edirdim ki, tale məni onunla görüşməyə deyil, vidalaşdırmağa çəkib gətiribmiş… Yaradanın ona belə bir tale qismət etməsinə təəssüf etməkdən başqa təskinlik tapa bilmirdim.

Müşahidə etdiyim bu səhnə xəyalımda ilk gənclik çağlarında yaddaşımda uyumuş bəzi təəssüratları oyatdı. Zəngilan rayonunun qonşu Seyidlər kəndindən olan dərzi Məşədi Mütəllim haqqında atamın söhbətlərini xatırladım. O deyirdi ki, bizim zonada ilk Məşhədə gedənlərdən biri Mütəllim olmuşdur. Dərzi kimi isə sənətkarlığına söz ola bilməzdi. O zaman heç eynimə də gəlməzdi ki, onların bu münasibətləri qohumluq səviyyəsinə yüksələcək, Məşədi Mütəllim kişinin qızı Məmər kəndində ana qohumlarından Şirin kişinin oğlu ilə ailə quracaq.

60-cı illərin əvvəlində müvafiq rayonlar birləşdirilib iqtisadi zona birlikləri yaradılmağa başlanılmışdır. Həmin dövrdə rayon qəzetləri də birləşdirilib rayonlararası zona qəzetləri təşkil edilirdi. 1963-cı il mayın əvvəllərində məni Laçın, Qubadlı, Zəngilan rayonlararası «Kənd həyatı» qəzetinə redaktor təyin etdilər. Iş üçün mənə çox gənc müraciət edirdi. Onlardan biri Zəngilan Komsomol Komitəsində şöbə müdiri Ərşad Əzimov idi. O, yeniyetmə vaxtlarında atamdan eşitdiyim dərzi Mütəllimin oğlu idi. Budur, bir vaxtlar tanımadığım və nə vaxtsa bu ailə ilə yaxın olub onun qayğılarına şərik ola biləcəyimi ehtimal belə edə bilmədiyim bir hadisə reallığa çevrilmişdi.

Ərşad hərbi xidmətə getmiş, tərxis olunandan sonra yerli hava bürosu məntəqəsinin rabitə şöbəsində işləmişdir. Sonra onu Komsomol Komitəsində şöbə müdiri vəzifəsinə irəli çəkmişlər. Qiyabi surətdə təhsilini ADU-nun jurnalistika fakültəsində davam etdirmişdir. 1963-cü il mayın 3-də onu redaksiyaya şöbə müdiri kimi işə götürdüm. O nəinki keyfiyyətli məqalələr yazır, həm də təzə götürülən bəzi işçilərə də kömək edirdi. Onun bu qabiliyyəti məni çox sevindirirdi. Buna görə səmərəli işləməsi üçün ona əlimdən gələn köməyi göstərirdim.

Ərşad təzə evlənmişdi, amma evi yox idi. Haradasa isə çox narahat yerdə yaşayırdı. O zaman Zəngilana köçdüyüm üçün mənim də evim yox idi. Ancaq rayon mərkəzində on iki mənzilli ev tikilməkdə idi. Binadan mənə ev verdilər. Ərşad müəllimə də həmin binadan ev verilməsinə kömək etdim.

Ərşad qəzetdə səmərəli fəaliyyət göstərdi. Jurnalistika sahəsində qiyabi təhsilini uğurla başa vurdu. Işlədiyi «Kənd həyatı» qəzetində problemlərin işıqlandırılması barədə diplom müdafiə etdi.

Rayonda bədii yaradıcılığa meylli olanları qəzet ətrafında toplayıb yaradıcılıqlarına kömək məqsədilə Ərşadın təşəbbüsü ilə «Süsən» ədəbi-bədii birliyi yaradıldı. Bəyənilən yazıları dərc etmək üçün qəzetdə «Süsənin səsi» rubrikası altında xüsusi səhifə buraxıldı. Şəhər orta məktəbinin dil-ədəbiyyat müəllimi şair Məhərrəm Mahi «Süsənin səsi» dərnəyində poeziya guşəsini, redaktor müavini Nəriman Bəxtiyarov isə «Kəlbətin» satirik guşəsinin aparıcısı oldular. Bədii yazı həvəskarları «Süsənin səsi», «Kəlbətin» guşələrində öz istedadlarını nümayiş etdirməyə çalışırdılar.

Redaksiya təzə təşkil olunarkən qiyabi surətdə öz jurnalist təhsilini davam etdirənlər diplomlu jurnalist kimi AJI-nin üzvlüyünə qəbul olundular. Artıq redaksiyada çalışan jurnalistlərin sayı artırdı. Bizim zonada fəaliyyət göstərən rayon qəzetləri redaksiyaları arasında Azərb. Jurnalistlər Birliyinin ilk təşkilatı məhz bizim Zəngilanın «Kənd həyatı» qəzeti redaksiyasının nəzdində yaradıldı. Onun ilk fəal üzvlərindən biri də məhz Ərşad müəllim oldu.

Əlbəttə, belə görünə bilər ki, bizim münasibətlərimiz, necə deyərlər, yağla bal kimi olmuşdu. Mübahisəsiz də keçinə bilmirdik. Ancaq bunlar kecici olurdu. Buna aid bir faktı xüsusilə xatırlamalı oluram.

Ərşad «Manuşaq» adlı bir hekayə yazmışdır. Hekayə məzmun və bədii cəhətdən çox qüsurlu olduğuna görə çapına razı olmadım və o incidi. Mən məzuniyyətə gedəndə məsul katib hekayəni dərc etmişdi. Ancaq belə bir hekayənin bizim qəzetdə getməsinə həmişə təəssüflənirdim.

Universiteti qurtarıb jurnalist diplomu alandan sonra rayonda işləmək istəməməsi haqqında mənə müraciət etdi. Onu işdən buraxmaq istəməməyimi başqa cür yozacağını nəzərə alıb azad etməyə razılıq verdim. Düşündüm ki, bəlkə, özünə respublika

mətbuatında daha geniş yaradıcılıq imkanı əldə edə bilər. Onun qabiliyyətinə inanırdım.

O, bir neçə il «Azərbaycan gəncləri», «Molodyoj Azərbaycan», «Bakinskiy raboçiy», «Həyat» qəzetlərində səmərəli fəaliyyət göstərdi. Sonra «Azərbaycan» qəzetində xüsusi müxbir işlədi. Onun yaradıcılıq fəaliyyətini müntəzəm izləyirdim. Işıq üzü görmüş «Arandan gələn Adam», «Cehiz», «Sığırçınlar uçub gəldi», «Qara kahada həyəcan» povestləri və bir çox maraqlı süjeti olan hekayələri, qəzet səhifələrində gedən publisistik yazıları da oxucular tərəfindən rəğbətlə qarşılanmışdı. Qəzetimizin yetişdirməsi kimi mən onunla fəxr edirdim.

Sonuncu dəfə Bakıya kursa gələrkən referat yazmalı idim (rus dilində). Mən isə rus dilini mükəmməl bilmirdim. Buna görə onu Azərbaycan dilində yazıb tərcümə üçün Ərşad müəllimin yanına getdim. Referatı tərcümə edib qurtarandan sonra xeyli söhbət etdik. Əgər əlimdə imkan olsaydı, «Manuşaq» hekayəsi çap olunan qəzetin bütün nüsxələrini alıb yandırardım ki, heç izi də qalmasın.

Onun bu etirafı mənə çox xoş gəldi. Ona görə yox ki, haqlı olduğumu etiraf edirdim, ona görə ki, artıq onun səviyyəsi xeyli yüksəlmişdi.

Işə qəbul edəndə Ərşadın bioqrafik dəlilləri ilə ətraflı tanış olmuşdum. Onun yeniyetmə və gənclik çağları müharibə illərinə və müharibədən sonra keçən ilk ən ağır iqtisadi çətinliklər dövrünə təsadüf etmişdir.

Ailədə baş vermiş uğursuzluq, ata-anasının vəfatı, qardaşının müharibə illərində həlak olması (*o həlak olmayıb-Ə.S*) onun xeyli sarsılmasına səbəb olmuşdu. Keçirdiyi sarsıntılar fiziki durumuna da öz təsirini göstərmişdir. Buna görə də Bakıya gedəndən sonra bütün bu sarsıntılar öz təzahürünü göstərmiş və uzun illər müalicələr qəbul etmək təsirli effekt verməmişdir.

Budur, söhbətimin əvvəlində dediyim ağır vəziyyətə düşdüyü üçün həkimlər onu kəndə aparmağı «məsləhət» bilmişdilər. Bu isə o demək idi ki…

Atalar çox yerində demişlər ki, çıxmayan candan ümid üzülməz. Artıq o əlillik dərəcəsi almış, öz ağrılarını çəkə-çəkə sağala-

cağına ümid bəsləməklə yaşayırdı. Əslində isə ancaq nəfəsi gedib-gəlirdi…

Sonradan öyrəndim ki, bir az kənddə qalıb kənd həkimi Qulunun, habelə kənd türkəçarələrinin xalq təbabətinin bəzi üsullarından istifadə edəndən sonra nisbətən yaxşılaşmağa başlamışdır. Səhhətində əmələ gəlməyə başlamış dəyişikliklər onda inam yaratmış və yapon alimi Nişinin xalq tibbi sağlamlıq sistemi ilə tanış olduqdan sonra ondan istifadə etməyə başlamışdır…

Iş elə gətirdi ki, Bakıya qayıtdığı üçün on ilə yaxın bir müddətdə görüşə bilmədik. Ancaq onun Qubadlıda olan bacısının əri Hacı vasitəsilə xəbər tuturdum. Öyrənirdim ki, özü-özünü müalicə etməklə məşğul olur. Artıq böhranlı günləri keçmiş, çəliklə gəzə bilir…

Nəhayət, Zəngilan işğal olunandan sonra 1994-cü ilin əvvəllərində onunla Birləşmiş Nəşriyyatda «Azərbaycan» qəzeti redaksiyasında görüşdüm. Onunla görüşəndə heyrətimi, təəccübümü gizlədə bilmədim. Qeyri-ixtiyari olaraq ağır vəziyyətdə gördüyüm günləri göz önünə gətirdim. Əgər onda kədərimi gizlətməyə çalışırdımsa, indii sevincimi büruzə verməyə çətinlik çəkirdim. Mənim heyrət və təəccübümü görüb:

- Görürsənmi, kəfəni yırtmışam, - deyə zarafat etməyə başladı. Qısa hal-əhvaldan sonra əlavə etdi:

- Bu barədə yazdığım kitabda müfəssəl bəhs etmişəm.

Onun «Möcüzəsiz möcüzə» tibbi-publisistik povestini oxuyandan sonra görüşümüzdə dediyi sözləri xatırladım. «Ölü kəfəni yırtdı» sərlövhəli bölməsində özünü necə müalicə etmək haqqında müfəssəl bəhs etmişdi.

Müdriklər demişlər ki, ən böyük möcüzələrdən biri adamın özü-özünə qalib gəlməsidir. Bu mənada Ərşad müəllimin görkəmli yapon alimi Konsudzo Nişinin xalq təbabətinə əsaslanaraq yaratdığı sağlamlıq metodologiyasından inadla, ardıcıl istifadə etməklə sağlamlığını bərpa etməsi möcüzə olmasa da, möcüzə timsalındadır.

Nişi 1884-cü ildə orta təbəqəyə mənsub bir yapon ailəsində doğulmuşdur. Çox erkən xəstəliyə mübtəla olan və bütün əlaqə-

dar fiziki inkişafdan qalan Nişinin döş qəfəsi o dərəcədə kiçik imiş ki, onu orta məktəbə götürməmişlər. Dövrünün məşhur həkimlərindən biri isə onun böyüklərinə təəssüflə bildirmişdir ki, bu cavan oğlan 20 yaşına belə çatmayacaq.

Işıqlı zəkaya malik olan Nişi xəstəlik üzündən öz əqli potensialından istifadə edə bilmirdi. Sağlamlıqla bağlı olan hər hansı bir kitabı, məqaləni, məlumatı böyük acgözlüklə oxuyarmış. Bir dəfə dövrünün tanınmış təbibi Fletqerin kitabı onun əlinə keçir. Bu kitabı oxuyandan sonra Nişin ən vacib və düzgün nəticəyə gəlir: insan üçün ən gözəl təbib yalnız təbiətin özüdür.

Sonra o qədim Misir, yunan, Çin, Tibet, Yəmən, Hindistan, Rusiya və sair ölkələrə məxsus sağlamlıqla bağlı 70 min ədəbiyyat araşdırıb, onun 362-sini seçib özünün məşhur təlimini yaratdıqdan, bu təlimlə həm özünü, həm də başqalarını sağaltdıqdan sonra onu elm aləminə bəyan etmişdir.

Nişi belə bir inkaredilməz həqiqəti açıb ki, insan özü-özünə vurduğu zərbəni kənardan heç kəs ona vura bilməz. Bu zərbələr nədən ibarətdir? Hər bir oxucu Ərşad müəllimin bu kitabında onun şərhinə və praktikasına aydın cavab tapa bilər.

Hər bir adamın stolüstü ola biləcək bu kitab 1996-cı ildə müəllifin öz şəxsi vəsaiti hesabına çox məhdud miqdarda çap edilsə də, oxucu kütləsi arasında geniş yayılmamışdır. Kitabdan istifadə etmək istəyənlər onuN sorağını axtarmalı olurlar.

Kitab yaradanın bəxş etdiyi ömrü xəstələnmədən, gümrah və şən yaşayıb başa vurmaq üçün Nişinin ecazkar sağlamlıq təlimi sisteminə əməl etməyə çağırışı adamı ciddi düşünməyə sövq edir. Onun bu çağırışı Azərbaycan Milli Məclisinə yazdığı işgüzar müraciətində də öz əksini xüsusilə aydın tapmışdır. Hətta müəllif bu sağlamlıq sistemini dövlət səviyyəsində kütləvi surətdə tədqiq etmək üçün öz mülahizələrini də qeyd etmişdir.

On ilə qədər xəstəliyə məruz qalmış müəllif yaradıcılığından qalsa da, onun əvəzini, necə deyərlər, öz «Möcüzəli möcüzə» tibbi-publisistik povesti ilə çıxmışdır.

Sağlamlığı bərpa olunmağa başlandıqdan sonra müxtəlif janrlarda yazdıqları onun fiziki sağlamlığının mənəvi ovqatının son dərəcədə yüksəldiyini nümayiş etdirir.

Onun 45 ilə qədər keçirdiyi jurnalistlik fəaliyyəti «Möcüzəsiz möcüzə» tibbi publisistik povesti ilə bərabər, yüksək vətəndaşlıq ehtirası ilə yazdığı «Mən Rusiyanı necə görmək istəyirəm» adlı rus dostu yazıçı Qustr Ivanoviçə məktub publisistik oçerkini oxuyan hər kəs onu hər hansı bir yüksək jurnalist təltifinə layiq görmək istərdi. Bu təəssüratı da yazmağa məni sövq edən məhz həmin istəkdir.

Ərşad Əzimov ömrünün müdrik çağlarında – 80-ci ilin asatanasındadır. O, təqaüdə çıxıb, xeyli müddət xüsusi müxbir işlədiyi Quba rayonunda yaşamaqdadır. Buranı təsadüfən seçməmişdir. Onun uzun illərdən bəri özünü müalicə etdiyi Nişinin müalicə üsullarını həyata keçirmək üçün burada hər cür tibbi şərait, hər cür maddi nemətlər mövcuddur.

Neçə illərdən bəri Nişinin sağlamlıq texnologiyası üzrə özü üçün «Möcüzəsiz möcüzə» tibbi proqramı əsasında öz müalicəsini davam etdirir.

Heç şübhəsiz ki, nə Ə.Əzimovun bu tibbi-publisistik povesti, nə «Mən Rusiyanı necə görmək istəyirəm» rus yazıçısı Pyotr Ivanoviçə məktub» povesti, nə də yaradıcılıq fəaliyyəti Milli mətbuat tədqiqatçılarımızın diqqətindən kənarda qalacaqdır.

Indi isə işğala məruz qaldığı üçün nəşriyyatı dayandırılmış Zəngilan rayonlararası «Kənd həyatı» qəzetində vaxtilə bir yerdə işləyib qəzetin nəşrində rol oynamış, onun sağ qalıb müxtəlif yerlərdə müxbir işləyən digər əməkdaşları adından (onların bir neçəsi artıq Azərbaycan Yazıçılar Birliyinin üzvüdür) ona rahat ahıllıq, inam və iman kamilliyi arzu edirəm.

**28 iyun 2007-ci il.** «Kredo»

## Zəngəzurun şölələnən ilk maarif məşəli

Azərbaycanın ən füsunkar guşələrindən biri Zəngəzur mahalıdır. Təbiət burdan səxavətini əsirgəməmişdir. Zirvələri qarlı, qartallı dərələri, dərin uçurumlu yaşıl yamacları, sürülər otlağı, yarğanlardan süzülən şəfa qaynaqları, örpəkli gəlini xatırladan şəlalələri necə vəsf edəsən!..

Vəsfə gəlməyən bu ecazkar diyarın nurani- pirani, səxavətli, dostluğa möhkəm kişiləri, dili nağıllı – nəğməli, şirin laylalı, xanım – xatın nənələri, mələksima qız – gəlinləri zaman – zaman dillərdə dastan olmuşdu.

Zəngəzuru əhatə edən 6 bölgədən biri, həm də iqtisadi cəhətdən həmişə imkanlı taxıl anbarı hesab olunan Qubadlı öz düyüsü, taxılı, mal-qara naxırları, at ilxıları, qoyun – quzu sürüləri ilə məşhur olmuşdur. Onun ərazisindən keçən Bərgüşad, Həkəri, Araz çaylarının sahilləri boyu taxıl zəmiləri, çəltik plantasiyaları, bağ – bostan məhsulları bütün il boyu təkcə Qubadlının deyil, habelə Zəngəzurun digər bölgələrinin rifahında böyük rol oynayırdı.

Burada yaşamış bəylər, bəyzadələr, mal- mülk sahibləri həmişə öz yerlərini hər cəhətdən inkişaf etmiş mədəni bir diyar kimi görmək arzusunda olmuşlar. Təəssüf ki, feodal patriarxal dövlət qurumu buna imkan vermirdi. Bununla belə, mahalın müdrik, uzaqgörən, xeyirxah maarifçi adamları mütərəqqi tədbirlər görmək üçün əllərindən gələni əsirgəməmişlər. Bunu Qubadlıda Sultanovlar sülaləsinin timsalında görmək olar. Nəinki öz övladlarının başqa ölkələrdə olan dünyəvi məktəblərdə təhsil almalarına səy göstərmiş, hətta 125 il bundan əvvəl 1882 –ci ildə Zəngəzurun Qubadlı bölgəsində ilk maarif ocağını şölələndirən də məhz həmin sülalənin törəmələri olmuşlar.

Yaşlı adamlar deyirlər ki, ermənilər 1878-ci ildə Zəngəzur qəzasının mərkəzi olan Gorusda yeni məktəb açanda Ildırım bəy Sultanov bunu heç cür özünə sığışdıra bilmir. Deyirmiş ki, necə ola bilər ki, erməni dığaları dünyəvi məktəb açsın, bizim gül kimi bəy balalarımız məktəbsiz qalsın?!

Ildırım bəy Sultanovlar sülaləsində ən imkanlı insanlardan biri imiş. Qubadlının Məmər kəndindən tutmuş Bərgüşad, Ağa çaylarının sahilləri böyük Çay Zəmiyə qədər salınan kəndlər, torpaqlar onun mülkiyyəti kimi və onun bütün gəlirlərini özü idarə edirmiş. Buna görə məktəb açdırmaq üçün o böyük imkanlara malik imiş. Təkcə imkanın çox olması şərt deyil, gərək adamda hünər, təpər, istək ola. Ildırım bəy isə el təəssübü çəkən bir bəy olmuşdur. Buna görə bu istək onu yeni məktəb açdırmağa sövq etdirmişdir.

Qardaşı Teymur bəyin oğlu Zəngəzurun qazisi olan Həsən bəyi də götürüb Yelizavetpol quberniyasının mərkəzinə-indiki Gəncə şəhərinə gəlir. Burada qubernatorla danışıb məktəb açılmasına razılıq alır. Şərtə görə məktəbi bina, yanacaq, tədris ləvazimatı, müəllimlə təmin etmək Ildırım bəyin öhdəsinə düşür.

Beləliklə, 1882-ci ilin sentyabrında Teymur bəyin, Ildırım bəyin hazırladıqları iki otaqlı binada Zəngəzurda ilk maarif ocağı şölələnməyə başlamışdır. Məktəb 4 illik iki sinifdən (1-3 ilə, 2-4) ibarət idi. Iki il ona 43 nəfər qəbul olunmuşdur. Sonralar bina darısqal olduğu üçün Teymur bəy özünə tikdirdiyi iki mərtəbəli yeddi otaqlı evin birinci mərtəbəsində üç otağı məktəbə verir. Bir müddətdən sonra bina yenə də darlıq edir. Yerdən 1,5 metr hündürlükdə yeddi otaqlı məktəb binası tikilir. Bu məktəbə, adətən, hamı Həsən bəy məktəbi deyirmiş, çünki məktəbin bütün rəhbərlik işini Həsən bəy özü aparırmış. Sonralar öz atasından aldığı torpaq payını da məktəb üçün bağ salmağa verir. O burada çox diqqətəlayiq meyvə bağı saldırır.

Sovet hakimiyyəti qurulduqdan sonra məktəb yeddi illiyə çevrildi, ona əlavə olaraq yeni tipli bina tikildi. 1937-ci ildən sonra isə ilk dəfə olaraq bu məktəbə 10 illik təhsil verən orta məktəb statusu verdilər. Onun nuru 125 ildir ki, neçə – neçə nəslin yolunu işıqlandırmaqdadır.

1982-ci ildə rayonun qabaqcıl ziyalıları, bu məktəbin yetişdirmələri onun 100 illiyini çox böyük təntənə ilə qeyd edib keçdiyi yola nəzər salmışlar. Yubilyar məktəbin Zəngəzurda xalq maarifinin inkişafı yolunda , həqiqətən, bir məşəl olduğuna inanmışlar. O vaxt hər 5-10 ildən bir məktəbin yubileyini qeyd etmək ənənə kimi qərara alınmışdır. Çox təəssüf ki, baş vermiş tarixi bir hadisə o ənənəyə vaxtlı -vaxtında əməl etməyə imkan vermədi. Sovet hakimiyyətinin süqutundan sonra ermənilərin «Böyük Ermənistan» iddiaları baş qaldırıb Azərbaycanın torpaqları hesabına öz «dövlət»inin sərhədlərini Qarabağ və Zəngəzurun hesabına genişləndirmək arzusu isə böyük fəlakətə səbəb oldu. Bu barədə geniş söhbət açmağa ehtiyac yoxdur. Faciəni hamımız bu və ya digər səviyyədə yaşamış və yaşamaqdayıq.

Nəhayət, 1993-cü il avqustun 30-da Qubadlı, oktyabrın 30-da isə Zəngilan işğal edildikdən sonra ermənilərin Qarabağla Zəngəzuru birləşdirmək xülyası reallaşdı. O zamanlar heç kəs bunun baş verəcəyini nəinki güman etmir, hətta xəyallarına belə gətirmirdilər. Ancaq oynanılan siyasi oyunlar bunun həqiqət ola biləcəyinə inanmamağa ehtiyac qoymadı. Bu sətirləri yazarkən şahidi oluduğum Qubadlının qaçqın köçünün Zəngilan-- Horadiz şosse yolu ilə Qubadlını necə ürək ağrısı ilə tərk etməli olduqlarını xəyalıma gətirəndə o günləri sanki yenidən yaşamalı oluram.

Köçdə kimdən soruşurdunsa, əksəriyyəti tərəddüd etmədən Sumqayıta gedəcəyini söyləyirdi. Bəs niyə məhz Sumqayıta?!

Müharibə dövrü bir sıra qonşu rayonlara taxıl, düyü, mal-qara məhsulları ilə köməklik edən Qubadlı 1947-52-ci illərdə iqtisadi cəhətdən çox zəiflədi. Buna görə də ehtiyac içərisində olan adamlar ailəni dolandırmaq üçün işləməyə başqa yerlərə getməli olurdular. O zaman Sumqayıtda, Mingəçevirdə, Bakıda geniş tikinti işləri gedirdi. Fəhlə qüvvəsinə isə böyük ehtiyac var idi. Buna görə də Qubadlıdan bir çox iş sahibi olan adamlar aparılan tikintilərdə işləmək üçün həmin tikintilərə, xüsusən yeni salınmaqda olan Sumqayıt şəhərinə getməli olurdular. Bir müddət Sumqayıtda şəhər partiya komitəsinin birinci katibi işləmiş Azərbaycanın qeyrətli, işgüzar, qayğıkeş oğlu siyasi xadim Kamran Hüseynov öz həmyerlilərinin təəssübkeşliyi ilə deyil, əsl humanistlik qayğısı ilə Sumqayıta gələnlərin hamısına olduğu kimi, qubadlılara hər cəhətdən kömək edirdi. Buna görə də Sumqayıtda, necə deyərlər, qubadlılaşma gedirdi. Bax buna görə də qaçqınlar həmin qohum-əqrəbalarına ümid bağlayıb Sumqayıtda məskunlaşmağa gedirdilər. Qaçqınlıq davam edən günlərdə Sumqayıt avtomaşınları Bakı – Daşburun stansiyaları arası yollarda Qubadlı qaçqınlarının köçünü qarşılamaq üçün sumqayıtlılar çox böyük qayğıkeşlik göstərirdilər. Bununla belə, əsrlərlə bir yerdə yaşayan köçkün nəsilləri yeni yaşayış yerində məskunlaşdırıb onun qurulmasını bərpa etməyin nə qədər çətin olduğunu təsəvvür etmək heç də asan deyildi. Bütün bu çətinliklərə baxmayaraq, qubadlılar Sumqayıtda məskunlaşmağa başlamaqla öz strukturlarını tədri-

cən bərpa etməyə başladılar. Bərpa işlərinə birinci növbədə xalq maarifi strukturunu bərpa etməklə başladılar. Ilk növbədə onun birinci məktəbi olan Qubadlı orta məktəbini bərpa etdilər.

Bu məktəb boş vaqonlarda, boş binalarda, Sumqayıtın 3 növbəli məktəblərində yerldəşdirildi. Təkcə bu məktəbin deyil, bütünlükdə Sumqayıtda olan Qubadlı rayon məktəblərinin imkanının yaxşılaşdırılmasına böyük kömək göstərildi. Buna görə respublika Prezidenti Heydər Əliyevin 1994-cü il 1 iyul sərəncamı ilə təsdiq edilmiş «Qaçqın və məcburi köçkünlərin yaşayış şəraitinin yaxşılaşdırılması və məşğulluğunun artırılması üzrə «Dövlət Proqramı»na əlavələr edilməsi haqqında» 31 oktyabr 2007-ci il tarixli sərəncamı əsasında məktəbin 125 illiyinə həsr edilmiş- yubiley keçirilmişdir. Bu kitab da həmin yubileyə həsr olunmuşdur.

Bu təntənəli yubileydə təkcə Qubadlı ictimaiyyətinin nümayəndələri deyil, başqa zonalardan da nümayəndələr dəvət olunmuşdu. Yubileyi giriş sözü ilə Qubadlı Icra Hakimiyyətinin başçısı Malik Isaqov açmışdır. Sonra təhsil naziri Misir Mərdanov prezident Ilham Əliyevin yubiley iştirakçılarına müraciətini oxumuş və bu müraciət alqışlarla qarşılanmışdır. Nazir məktəbin direktoru Nuşirəvan Əsədovun və pedaqoji fəaliyyətində fərqlənmiş müəllimlərə «Respublikanın qabaqcıl təhsil işçisi» döş nişanlarını və nazirliyin fəxri fərmanlarını təqdim etmişdir. Təbrik üçün söz qonaqlara verilmişdir. Icra Hakimiyyətinin başçıları V.Əliyev ( Sumqayıt ş), Z.Fərəcov (Abşeron), N.Bəhmənov (Şuşa), M.Quliyev (Cəbrayıl), E. Təhməzov (Laçın), E.Hüseynov (Xocavənd), V.Quliyev (Zəngilan), Ş.Yusubov (Xocalı), V.Məhərrəmov (Kəlbəcər), Tuğ kənd orta məktəbinin direktoru (Xocavənd), Sumqayıt ŞTS müdiri V.Bağırov, Azərbaycan Texniki Universitetinin rektoru Havar Məmmədov, ADPU-nun rektoru AMEA-nın müxbir üzvü Y.Məmmədov, professor, yubilyar məktəbin məzunu Edil Eyvazov, BDU-nun xarici dillər kafedrasının müdiri dosent Abbas Abbasov, məktəbin əməkdar müəllimi Əminə Bayramova və başqa çıxış edənlər xalq maarifinin inkişafında ilk məktəbin və onun pedaqoji kollektivinin göstərdi-

yi xidmətindən çox böyük razılıq hissi ilə danışdılar. 12 il ərzində məktəbdə 200 nəfər müəllim çalışmışdır. Bu böyük pedaqoji kollektiv öz fəaliyyətlərini təkmilləşdirə – təkmilləşdirə özlərinə məxsus təhsil sistemi yaratmışlar. Buna görə də məktəbin bütün məzunları öz təhsillərini artırmaqla ixtisaslı mütəxxəsislər olmuşlar. Həmyerliləri yetişdirdikləri elm xadimləri ilə haqlı olaraq fəxr edə bilərlər. Çünki bu ucqar dağ rayonunun 20 nəfər müxtəlif ixtisaslar üzrə elmlər doktoru, 25 nəfər elmlər namizədi, 1 nəfər 1952-cü ildə SSRI Milli Akademiyasının müxbir üzvü olmuşdur. Yubilyar məktəbin direktorun 125 il ərzində 20 nəfərinin yalnız 3-ü kənardan gətirilmişdir. Rayon yetişdirdiyi kadrlarla nəinki öz yerli idarəetmə strukturlarını təmin etmiş, hətta respublikada Ali Sovetin, Nazirlər Sovetinin, Həmkarlar Ittifaqının sədrləri,onların müavinləri, nazir, komitə sədrləri və başqa bir neçə nəfər yüksək hərbi rütbə ilə respublikada böyük nüfüz qazanmışdır. Quruculuq dövründə altı nəfər istehsalat qabaqcılı SSRI – də ən yüksək fəxri ad olan Sosialist Əməyi Qəhrəmanı adını almışdır. Yubilyar məktəbin müdavimi əvvəl müəllim olmuş, sonra Azərbaycan Yazıçılar Ittifaqının sədri işləmiş S.Rəhimov respublika ədəbiyyat və incəsənət işçiləri arasında birinci olaraq bu fəxri ada layiq görülmüşdür.

1988-ci ildən 1993-cü ilin avqustuna kimi Qubadlı, demək olar ki, ön cəbhə hesab olunurdu. Göstərdikləri igidliyə görə 6 nəfər gənc Azərbaycanın Milli Qəhrəmanı Fəxri adına layiq görülmüş dür.

Lakin mürəkkəb erməni hiyləsi ilə Qubadlı işğal olundu. Budur, indi 15 ildir ki, qubadlılar Sumqayıtda məskunlaşmışlar. Onlar 125 il bundan əvvəl Qubadlıda təməli qoyulmuş maarif ocagının indi Sumqayıtda yanan məşəlinin şöləsinin ətrafına toplaşıb, məktəbin keçdiyi şərəfli yolunu yad edirlər.

Işğaldan əvvəl Qubadlıda 13 orta, 16 səkkizillik, 12 ibtidai, 20 axşam kənd məktəbi fəaliyyət göstərirdi. Həmin məktəblərdə 1317 müəllim çalışırdı. Qubadlı orta məktəbində isə 461 nəfər təhsil alırdı. Əslində bu şəbəkə təhsilinin qurulması imkanına görə işğaldan əvvəlki səviyyədən heç də geri qalmır. Bir çox cəhətlərə

görə müasir tələblərə çox uyğundur. Ancaq maddi – texniki bazasının yaradılması, məktəbdə kompyuter texnologiyasının gətirilməsindən tutmuş digər müasir avadanlıqlarla təchizatının təmin ediməsinə ehtiyac çoxdur. Ancaq təhsil sahəsi də sürətlə yeniləşir. Bu yeniləşmə özünü göstərməkdədir.

Müəllif kitabda Qubadlı orta məktəbi və bütünlükdə rayon maarifi ilə əlaqədar olan bir çox adlı- sanlı adamlar haqqında ensiklopedik bioqrafik məlumatlar verməklə yanaşı, onun bilavasitə müdavimi olmuş adamların geniş xatirələrini də vermişdir. Bütün bunları oxuyub təhlil edərkən bir daha inanırsan ki, bu məktəb, doğrudan da, daim şölələnən bir maarif ocağı kimi bütünlüklə Qubadlı tarixinin ayrılmaz hissəsi olmuşdur.

Bu barədə danışmaq mənə ona görə xoşdur ki, bu məktəb mənim həyatımda unudulmaz izlər buraxmışdır. 1948-ci ildə API-ni qurtaranda ilk təyinatım bu məktəbə olmuşdur. 3 il bu məktəbdə dil – ədəbiyyat müəllimi, 2 il yarım isə təlim-tərbiyə işləri üzrə direktor müavini işləmişəm. 1955-ci ildə rayon partiya komitəsinə şöbə müdiri vəzifəsinə irəli çəkilmiş, 1957-ci ildə rayon qəzetinə redaktor təyin olunmuşam. Sonra Cəbrayıl rayonlararası qəzetdə işləmiş, 1969-cu (1963-Ə.S.) ildən Zəngilan rayonlararası qəzetə redaktor təyin olunmuşam. 1989-cu ildə təqaüdə çıxsam da, indiyə qədər öz jurnalistlik fəaliyyətimi davam etdirirəm. Bu məktəbdən başlanan əmək yolum mənə həmişə uğur gətirmişdir. Buna görə də Qubadlı 1№- li orta məktəb həmişə mənim üçün əziz olmuşdur. Buranı qurtaran neçə –neçə uşağın attestatında imzam olduğu üçün fəxr edirəm. Qubadlı orta məktəbi haqqında məndə iftixar hissi doğuran da məhz budur.

İnanıram ki, gec- tez bu maarif ocağı yenə də Qubadlıda şölələnəcək, onun Sumqayıt həyatı xatirələrə dönəcəkdir.

**13 sentyabr 2008-ci il. «Kredo»**

# ZƏNGƏZURUN ƏYAN NƏSİLLƏRİ

***Ot bitər kök üstə, əsli nə isə...***
***Vaxtın dəyirmanında daş əridi qum oldu,***
***Tarixə atdığımız qayıtdı, lüzum oldu.***
***Dünənin həqiqəti bu gün tərs yozum oldu,***
***Niyə də yozulmasın, axı dünya fırlanır.***

**Bəxtiyar Vahabzadə**

Şəlaləsi ağ örpəkli gəlin timsallı, dərələri gözəlliyi vəsfə gəlməyən qədim Zəngəzur dağları... Bu dağların qoynunda camaatı çox gur olan bir kənd var idi. adına da Dağ Gilətağ deyilirdi. Bu kənd yaz–yay aylarında mal–qara bəsləmək üçün əlverişli olsa da, çox məhdud idi. Buna görə də kəndin sakinləri XVIII əsrin əvvəllərindən Zəngəzurun aran hissəsində, Süsən meşəsinin ətəklərində əkin–biçin üçün çox əlverişli olan bu yerlərdə özlərinə qışlaq salmağa başlamışlar.

Illər geçdikcə bu qışlaqlar Böyük Gilətağ və Dərə Gilətağ adı ilə iki kənd kimi formalaşmışdır. 1920 –ci ildən sonra bu iki kənd Qubadlının (1962 –ci ildə (1963-Ə.S.) isə Zəngilanın), Dağ Gilətağ isə Ermənistanın Qafan rayonunun inzibati ərazisinə daxil edilmişdir. Indi isə bu böyük el–oba məskəni, nağıl-larda deyildiyi kimi, yommalanıb viran edilmiş yurdlara dönmüşdür. Dağ Gilətağ kəndi milli münaqişə ilə əlaqədar olaraq 1905–1920 –ci illərdə qismən, 1988 –ci ildə bütünlüklə köçürülmüş, Böyük Gilətağ və Dərə Gilətağ isə Zəngilanın işğalı ilə əlaqədar olaraq 1993 –cü il oktyabrın 30 –da mühasirəyə düşüb Arazdan İran sərhədini keçərək qaçqın kimi Azərbaycanın rayonlarına: Bakı və Sumqayıt şəhərlərinə pənah gətirmişlər.

Deyirlər ki, el–obanı öz igid oğulları tanıdar. Bunu Zəngəzur mahalında Gilətağın timsalında aydın görmək olar. Öz tərcümeyi–halına burada doğulduğunu iftixarla yazan general rütbəsinə yüksəlmişə, alim–təbibə, filosofa, filoloqa, şairə, müxtəlif dərəcəli alimlərə, respublika miqyasında tanınan ictimai xadimə, ba-

carıqlı sənaye və kənd təsərrüfatı mütəxəssislərinə rast gəlmək olar. Hətta nəsillər var ki, ona məxsus olanlar öz ata–babalarının nəcib ənənələrini davam etdirməklə ağsaqqallıqda, xeyirxahlıqda elə nüfuz qazanmışlar ki, indi də camaat o nəslə ehtiram bəsləyir. Məsələn, Kərbəlayi Molla Bəxtiyar kimi.

Gənclik illərində eşitdiklərimə sadəcə məlumat kimi baxırdım. O zamankı ideoloji istiqamət bizi elə bir məhdud vəziyyətə salmışdı ki, hər şeyə qara eynəklə baxmalı olurduq. Molla, Hacı, Kərbəlayi, Məşədi, yüzbaşı, kəndxuda və s. deyəndə elə bilirdik ki, onlar heç bir insafı, nəcabəti olmayan, rəzil adamlardır. Xəyalımıza gəlmirdi ki, adi məlumat kimi eşitdiklərimizə yeni bir rakursdan baxmaq zərurətində qalıb bütün bunların necə yanlış mövqe olduğunu etiraf etməli olacağıq.

Kərbəlayı Bəxtiyarın özündən əvvəlki nəslin neçənci arxadönəninə mənsub olduğunu xatırlamaq çətin olsa da, özü bir nəslin ulu babası, həm də böyük bir elin şəriksiz ağsaqqalı kimi qəbul etdiyi şəxsiyyət olmuşdur. O, mükəmməl dini təhsil görmüş, dünyəvi elmlərdən başı çıxan maarifpərvər adam kimi el rəğbətini qazanmışdır.

Deyilənə görə, Dağ Gilətağda ilk məktəbin, fərdi təhsilin əsasını da Kərbəlayı Molla Bəxtiyar qoymuşdur. Onun Əlyar, Almurad, Molla Mehdi və Zaman adlı dörd oğlu olmuşdur. Onlar da ataları kimi öz xeyirxahlıqları, ağıllı, qoçaq olmaları ilə yaddaşlarda yaşamaqdadırlar. Oğlu Əlyar, Almuradın oğlu Abbasəli isə hər cəhətdən xüsusi ilə fərqlənmişlər.

Əlyar da mükəmməl təhsil almış, hətta az–çox rus dili də öyrənmişdir. O zaman kənddə sayılıb–seçilən gənc kimi nüfuz qazandığına görə ermənilərlə azərbaycanlıların birgə yaşadığı zonada hər iki icmanın tabe olduğu bir quruma – yüzbaşılığa onu başçı təyin edirlər. Bu yüzbaşılığın əhatə etdiyi zona Zəngəzurda milli münaqişənin ən gərgin yeri idi. Burada işləmək o qədər də asan deyildi. təmkinli, tədbirli, qətiyyətli olmaqda atasından geri qalmayan Əliyar 1905–1918 –ci ilə qədər olan bir müddətdə azərbaycanlıları ermənilərin törətdiyi qırğından mühafizə etmək üçün çox cəsarətlə fəaliyyət göstərmişdir. O öz qoçaqlığı ilə zonada

böyük nüfuzu olan qardaşı oğlu Abbasəlinin başçılığı altında özünümüdafiə dəstəsi yaratmışdır. Ermənilərin lideri olan Samsunun bütün məkrli hərəkətlərinin qarşısını almaq üçün onun başçılıq etdiyi dəstə daim ayıq-sayıqlıq göstərirdi. Bu da ermənilərin hiylələrinin qarşısını vaxtında almağa imkan verirdi. Onun göstərdiyi igidlik epizodları az qala əfsanələşdirilmişdir.

Milli münaqişənin çox gərgin bir vaxtında, on doqquzuncu illərin əvvəllərində Əlyar kişinin vəfatı azərbayganlıları olduqca mütəəssir etdi. Ancaq həmyerlilərinin təskinlik tapmağa da ümid yeri var idi. Bu ümid yeri isə bacarıqda, ağsaqqallıqda atasından geri qalmayan oğlu Ismayıl idi.

İsmayıl 1887 –ci ildə anadan olmuşdur. O həm dini, həm də rus dilində ibtidai təhsil görmüşdür. Çox gənc olmasına baxmayaraq, necə deyərlər, hər cəhətdən diqqəti cəlb edirdi. Babası Bəxtiyarın, atası Əlyarın bütün müsbət irsi keyfiyyətləri onun şəxsiyyətində təcəssümünü tapmışdı. Bu yerdə adam istər–istəməz belə bir xalq hikmətini xatırlayır: “Əsil azmaz, düz iyiməz“. Buna görə də camaat tərəddüd etmədən onu atasının əvəzinə özlərinə ağsaqqal kimi qəbul etmiş və hörmət əlaməti olaraq Əlyaroğlu deyə çağırmağa başlamışlar.

Artıq Qızıl Ordu Zəngəzuru işğal edib ADR –in hakimiyyətinə son qoymuş, milli qırğın qismən sakitləşmiş, Sovet hökumətinin ilk qurumları yaradılmağa başlanmışdır. Əlyaroğlu Ismayıl 1925 –ci ilə kimi meşəbəyi, kənd və rayon kooperativlər ittifaqının sədri, milis şöbə rəisi kimi vəzifələrdə çalışmışdır. Bu vəzifələrdə göstərdiyi təşkilatçılıq bacarığına görə onu kənd şurasının sədri seçirlər. Dövrün mürəkkəbliyi baxımından kənddə ilk dövlət qurumu olan bu vəzifədə çalışmağın nə qədər gərgin olduğunu təsəvvür etmək çətin deyildi. Axı, necə deyərlər, evdə bişməyib, qonşuda da görünməyib...

Uzun illərdən bəri davam edən milli münaqişə, birinci dünya müharibəsi, vətəndaş müharibəsi, ADR – in süqutu ölkədə böyük xaos əmələ gətirmişdi. Üstəlik yeni cəmiyyət quruculuğu başlanmışdı. Belə bir şəraitdə qarşıya çıxan çətinlikləri həll etmək üçün saysız–hesabsız müqavimətlər olurdu. Bütün bunlara baxmaya-

raq, o, qəza icraiyyə komitəsi tərəfindən kəndin iqtisadi–sosial və mədəni quruculuğuna aid müəyyən edilən ilkin tədbirlərin həyata keçirilməsi üçün böyük təşkilatçılıq göstərirdi. Bir ziyalı kimi o, kəndlərdə məktəblər açmaq, savadsızlığı ləğv etmək, ictimai sosial xidmət obyektləri tikdirmək arzuları ilə yaşayırdı. Bütün bu arzuların necə və nə vaxt həyata keçməsinin mümkün olacağını hələ təsəvvür etməsə də, buna böyük inam bəsləyirdi. Onu həvəslə işləməyə  ruhlandıran da məhz bu idi...

1925 –ci ilin son ayları idi. Əlyaroğlu qəza icraiyyə komitəsinin iclasından çox yüksək əhval–ruhiyyə ilə çıxmışdı. O, arzusunda olduğu bir tədbirin həyata keçirilməsi üçün çətinliklə də olsa, razılıq ala bilmişdi. Belə ki, beş kənddə yeni məktəb tikintisi aparmaq nəzərdə tutulurdu. Bunları yalnız əhalisi çox olan iri kəndlərdə tikmək lazım bilinirdi. Gilətağ kimi ucqar bir kənddə məktəb tikməyin hələ tez olduğunu iddia edənlər bunu şura sədrinin təkid etməsini öz kəndi olması ilə  əlaqələndirənlər idi. Lakin Əlyaroğlu Gilətağın on dörd kəndin ortalığında olması və həmin kəndlərin uşaqlarının da burada oxumaq imkanı olacağına icrakom üzvlərini qətiyyətlə inandıra bilmişdi. Binaların sürətlə və keyfiyyətlə tikilməsi kənd şura sədrlərinə həvalə olunduğundan Əlyaroğlu məktəbi bütün kəndlərdə tikilənlərdən daha tez tikilməsinə nail olacağına qətiyyətlə söz vermişdi.

Qəzanın mərkəzindən kəndə qədər olan 35–40 kilometrlik bir məsafəni Əlyaroğlu şirin xəyalların qanadlarında, at nalının cingiltili sədaları altında, enişli-yoxuşlu, dərəli–təpəli, kol–koslu yerlərdən keçən cığırlarla zümzümə edə–edə öz sevincini camaatla bölüşməyə tələsirdi...

Yolboyu onu tərk etməyən düşüncələrdən biri məktəbin tikintisi ilə bağlı olan problemlərin həlli üçün görülməli olan tədbirlər idi. Birinci növbədə bina üçün yer haqqında düşünürdü. Torpaq şəxsi adamlara məxsus olduğundan onu almaq o qədər də asan deyildi. Adamlar az qala heç qəbiristanlığa yer verməyə qıymırdılar. Əlyaroğlu könlündə kəndin mötəbər adamlarından biri olan Fərəc Məmmədqulu oğlunun 1,5 hektarlıq yerini çoxdan gözaltı etmişdi.

Ismayıl kəndin sayılıb–seçilən ağsaqqallarını yığıb bu şad xəbəri çatdırmaqla bərabər məktəb üçün torpaq sahəsi ayırmaq üçün məsləhətləşmək istədiyini bildirdi. Oturanlara müraciət edəndə ilk söz alan Fərəc kişi oldu. Əlyaroğlu sözü ortalığa desədə nəzərini ona yönəltməyinə laqeyd qalmadı. Eyninə dammışdı ki, Əlyaroğlunun onun evinin yanındakı yerdə gözü vardır. Buna görə də tərəddüd etmədən buna məmnuniyyətlə razılıq verdi.

Başlanğıcının mübahisəsiz uğurlu olması onu daha da həvəsləndirdi. Çox çəkmədi ki, tikintiyə xüsusi mühəndis göndərildi. Əlbəttə, böyük həcmli məktəb binasının o zaman inşa etmək asan deyildi. heç bir texniki imkanı, hətta arabası olmayan bir yerdə inşaat materialları daşımaq çox böyük çətinlik törədirdi. Daşı, qumu on kilometrlə uzaqdan ulaqla daşımaq, əhəngi xüsusi quyularda yandırıb istehsal etmək, milləri, dönləmə, tahan taxtasını, taxtapuş üçün təbəqə dəmirləri də ulaqla 150–160 kilometr uzaqda olan dəmiryol dayanacaqlarından daşımaq lazım gəlirdi.

Inşaatda işləmək üçün işçi qüvvəsi toplamaq, kənardan gələn mühəndis və ustaların qalmaları üçün kənddə şərait yaratmaq tikintinin sürətlə aparılması üçün çox zəruri idi. Əlyaroğlunun təşkilatçılığı sahəsində bütün bu qayğılar çox müvəffəqiyyətlə öz həllini tapırdı. Bütün bu işlərə rəhbərliyi kəndin çox fərasətli gənclərindən biri olan Ismayıl Dünyamalı oğlunu cəlb etmişdi.

Əlyaroğlu yorulmaq bilmədən çalışmasına inşaatçılar heyran qaldılar. Bu onları da həvəslə işləməyə ruhlandırırdı.

Aylar ötdükcə divarlar qarış–qarış ucalır onun layih cizgilər reallaşırdı; Binanın üstü dəmirlə örtülüb qurtaran gün kəndə əsil bayram təntənəsinə çevrildi. Inşaatçılar binanın daxili işlərini davam etdirməyə daha həvəslə girişdilər. Əlyaroğlunun nüfuzundan qıcıqlanan bədxahlar dedi–qodular etməyə başlamış və onu həbs etdirmişlər. Səkkiz ay dustaq saxlandıqdan sonra buraxılmışdır. Işinə bərpa olandan sonra daha səylə işləyib yarımçıq qalan məktəbin başa çatdırılmasına nail olmuşdur. Yerdən yarma damlar,daxmalar fonunda bina, şah sarayını xatırladırdı. Onun geniş, işıqlı otaqları kənd əhalisində belə otaqlarda yaşamaq həvəsi də oyatdı. Çox keçmədi ki, kənddə bu tipli otaqlar tikməyə başladılar.

Yeməzli kəndindən Namazqulu Qocayev onun direktoru, Xocamsaxlı kəndindən Nüşrəvan, Şovkət Kərimovlar, Fərcan kəndindən Bəhrəm və Fərrux Xudadovlar onun ilk müəllimləri oldular. Əlyaroğlu İsmayılın yeganə oğlu, indi 75 yaşnıda olan Qüdrət müəllim isə onun ilk şagirdlərindən biri oldu.

Çox təssüf ki, Əlyaroğlunun sevinci uzun sürmədi. Yüzbaşı oğlu olduğu üçün onu vəzifədən çıxardılar. Sən demə onu hələ bir ağır repressiya aqibəti gözləyirmiş.

Əlyaroğlu dedi–qodulardan uzaqlaşmaq üçün Qafan şəhərlərində mis mədənlərindn işləməyə gedir. Axı onun əsli indi bu rayonun ərazisinə daxil edilmiş Dağ Gilətağ kəndindən idi. O burada nəqliyyat şöbəsində işə düzəlir.

O zaman arabadan və  atdan başqa heç bir nəqliyyat vasitəsi yox idi. Mədənə yüklər Horadiz və Yevlax dəmiryol dayanacaqlarından ulaqla, araba ilə daşınırdı Əlyaroğlu Qafanda və onun ətrafında olan azərbaycanlılar yaşayan kəndlərdə şəxsi nüfuza malik idi. Məhz buna görə camaatı öz ulaqları ilə yük daşımağa geniş cəlb edə bilmişdi.

Təşkilatçılıq qabiliyyətini gözü götürməyənlər onun haqqında yenə də «**danos**» lar yazmağa başladılar. Babasının molla, Kərbalayı, atasının yüzbaşı olması ilə əlaqədar olaraq onu “xalq düşməni“ kimi “ifşa“ etməyə çalışırdılar. Həm də ermənilər onun atası Əlyarın milli münaqişə zamanı onlara qarşı necə qətiyyətli olduğunu unutmamışdılar. Beləliklə, türk qanına yerikləyən ermənilərin əlinə fürsət düşmüş oldu. Buna görə də bu mərd kişini ailəsinin belə xəbəri olmadan 1938 –ci ildə həbs edib Yerevana göndərirlər. Onda Əlyaroğlunun 50 yaşı var idi. Yalnız 40 il sonra həbs edildiyi il güllələndiyi məlum oldu. Onun övladları və bütün qohumları bu illər ərzində hakimiyyət orqanları qarşısında «**Siyasi məhbus**» damğası ilə gözükölgəli, səksəkəli günlər keçirməli oldular. Çəkdikləri maddi və mənəvi əzab isə heç cür ölçüyə gəlməzdi. Ancaq camaat  Bəxtiyarlıların nəsillikcə necə el qeyrəti çəkən, mərd, xeyirxah olduğunu yaxşı bilirdi. Buna görə də onların ehtiramını gizli də olsa həmişə saxlayırdılar. Bu isə mənəvi dayaq kimi onlara böyük təskinlik verirdi.

«Su gələn arxdan bir də gələr». Xalq deyiminin hikmətinin təzahürünü konkret olaraq elə Baxtiyar babanın arxa dönmüşlərinin və dönməkdə olan indiki nəsillərinin, nəticəsi Qüdrətin atası olduğu nəslin timsalında da görmək olar.

“Siyasi məhbus oğlu“ kimi hər cür qınaqlara məruz qalmasına baxmayaraq ata–baba ləyaqətini həmişə qürürla qorumağa çalışmışdır. Ali pedoqoji təhsil almış, yarım əsrdən çox atasının təşəbbüsü və təşkilatçılığı ilə inşa edilmiş Gilətağ orta məktəbində müəllim işləmişdir. Əmək fəaliyyətin-də yüksək pedoqoji ustalığı, məişətdə, münasibətdə isə, necə deyərlər, xeyirdə–şərdə yeri görünən, ata–babası kimi ağsaqqal tanınmışdır.

Ailənin yeganə işləyəni olsa da özünün dörd oğlunun yüksək ixtisas təhsili almasına nail olmuşdur. Iki oğlu APİ –ni, bir oğlu ADU –nun jurnalistika fakultəsini, bir oğlu isə texniki təhsil məktəbini bitirmişdir. Onlar hamısı ailə qurmaqla Bəxtiyarlıların yeni arxadönən bir nəslinin ataları olmuşlar.

Belə bir xalq deyimi var ki, ad bostandır, kim nəyi seçir seçsin. Ancaq Qüdrət müəllim oğlanlarına ad qoyanda bostan seçimi ilə deyil, nəsil-nəcabətinə ehtiram rəmzi ilə seçim etmişdir. Belə ki, oğlanlardan birinə ulu babası Bəxtiyarın, digərinə babası Əlyarın, üçüncüsünə isə atası İsmayılın adını qoymuşdur. Bununlada istəmişdir ki, oğlanları uşaq yaşlarından adın daşıdıqları babalarının ənənələrinə sadiq qalmağa borclu olduqlarını daim dərk etsinlər, onların ruhu qarşısında mənəvi məsuliyyət daşısınlar. Böyük oğluna isə pərəstişkarı olan Q.B.Zakirin adını vermişdir. Bu da bostan seçimi deyildir. Vaxtilə, satiralarına görə təzyiqlərə məruz qalıb sürgün olunan, lakin öz inamından dönməyən şairə olan ehtiramından irəli gəlmişdir. Axı Qüdrət müəllimin atası da belə bir tale yaşayıb, repressiya qurbanı olmuşdur. Əlbəttə, övlada arzu etdiyi adı qoymaqla arzuya çatmaz. Onun reallaşması üçün rol oynayan amillər çoxdur. Uzun illərdən bəri daim ünsiyyətdə olduğum üçün o,deyərdim ki, Yaradan Qüdrət müəllimin oğlanlarından öz səxavətini əsirgəməmiş. onlara nəcib irsi qabliyyətlər bəxş etmişdir. Aldıqları ailə və məktəb tərbiyəsi isə bu qabiliyyətləri daha da inkişaf etdirməyə təkan vermişdir. Buna

görə də onlar mənəvi baxımdan kənddəki həmyaşıdlarından daha çox diqqəti cəlb edirlər. Bax buna görə də istər–istəməz belə bir xalq hikmətini konkret olaraq bu nəslin timsalında da xatırlamalı oluram: ot bitər kök üstə, əsli nə isə!

Zəngəzurun bütün rayonlarında belə zadəgan, əyan nəsillər az olmamışdır. tarixi proseslərin inkişafı nəticəsində bizə nəsib olan müstəqillik prizmasından nəzər saldıqda həmin nəsillərin ənənələrindən nə qədər aralı düşdüyümüzü, nələr itirdiyimizi, mənəvi cəhətdən nə qədər aşındığımızı da dərindən dərk etməyə başlayırıq. Bütün bunları sistemli surətdə xatırlamaqla yeni nəsilləri nəcib ənənələri öyrənib ondan ibrət götürməyə istiqamətləndirməliyik.

Müstəqil dövlət quruculuğu ilə əlaqədar olaraq mənəvi tərbiyə vasitəsi kimi bu müstəsna əhəmiyyətə malikdir.

## ZƏNGƏZUR ELLƏRİNİN SÖZ BOĞÇASI

***Zarafatcıl və hazırcavab adamlar:***
***Məmmədbəyli Aşırxan***

Qədim Zəngəzur təkcə təbii füsünkarlığı ilə deyil, həm də öz müdrik ağsaqqalları, xanım–xatın ağbirçəkləri, gözəl–göyçək qız–gəlinləri, igid oğlanları, hazırcavab və zarafatcıl adamları ilə də məşhurdur. Belə adamların dedikləri zaman–zaman dildən–dilə keçib atalar sözlərinə, zərb–məsəllərə, Molla Nəsrəddin lətifələri, Bəhlul Danəndə hikmətləri timsalına çevrilmişdir. Ömrü gülüş dolu olan belə adamlardan biri Zəngilan rayonunda iri kəndlərdən biri olan Məmmədbəylidə yaşamış Aşırxan Rüstəm oğludur.

O, 1912–ci ildə anadan olmuş, 1993–cü ilin payızında, Zəngilanın ermənilər tərəfindən işğalı ərəfəsində öz dünyasını dəyişmişdir. 1941–45–ci il müharibəsinin iştirakçısı və onun əlili olmuşdur. Bütün ömrü boyu kənd təsərrüfatında işləmiş, öz halal əməyi ilə ömür sürüb 5 övlad böyütmüşdür.

Aşırxanın lətifələri, zarafatları, baməzə deyimləri, müsahibədə yığcam və tutarlı cavabları təkcə öz kəndlərində deyil, bü-

tünlüklə rayonun kəndlərində də çox adamların hafizəsində hifz olunmaqdadır. İndi də xalq kəlamına çevrilmiş «Aşırxan demişkən», «Bu yerdə Aşırxan belə deyərdi...», «Aşırxanın sözü olmasın...» kimi ifadələr işlədilməkdədir.

Aşırxan müharibədə bədən yarası alıb ağrılar keçirsə də çox nikbin adam idi. O öz zarafatları ilə həmişə öz ətrafındakılarda xoş əhval yaradardı. El–obanın heç bir xeyir–şərindən qalmaz, toylarda, məclislərdə isə baməzə söhbətləri ilə, necə deyərlər, kef verərdi.

Aşırxanın heç xəyalına gəlməzdi ki, onun müxtəlif məqamlarda dediyi bu baməzə sözlər, lətifələr, verdiyi lakonik cavablar folklorlaşıb dillərdə dolaşaraq toplanıb kitablarda çap olunarmış.

Kənd müəllimi Həsən Quliyev ədəbiyyat həvəskarı kimi onun bu deyimlərini toplamaqla məşğul idi. Hətta rayon qəzetində onun məzəli əhvalatlarından bir neçəsini də çap etdirmişdi. Qaçqınlıqla əlaqədar olaraq Aşırxan kişinin dediklərinin itib–batmaması üçün onu toplayıb kitab nəşr etdirməyə Həsən müəllim imkan axtarırdı. Nəhayət, qaçqınlıqdan sonra Bakının Bakıxanov qəsəbəsində məskunlaşıb məktəb direktoru işləyən Həsən müəllim bu yaxınlarda buna nail ola bilmişdir. Onun «Gülüşlə dolu bir ömür» kitabı işıq üzü görmüşdür. Kitab müəllifin ön sözü, əməkdar pambıq ustası Oruc Quliyevin, tibb elmləri namizədi, həmkəndlisi Sabir Əmirəliyevin, əmək veteranı, mexanizator Mikayıl Bəylərbəyovun, Aşırxanın qonşuları Əşrəf Bağırovun, qabaqcıl maarif işçisi Qabil Həsənovun xatirələri, təəssüratları ilə açılır. Sonra isə onun 60–dan çox lətifəsi, məzəli əhvalatları verilir.

Kitabı oxuyub qurtarandan sonra adam Aşırxan kişinin deyimlərindən son dərəcə xoşhal olduğu kimi, onları toplayıb dərc etdirmiş Həsən müəllimin xidmətindən də eyni dərəcədə razı qalır.

Doğrudan da, qaçqınlıq həyatı keçirən bir adam üçün belə bir kitabı dərc etdirmək maddi baxımdan o qədər də asan deyildir. Bu işdə Aşırxanın övladları Sərxeyil və Əbdül qardaşlarının göstərdikləri köməyə görə müəllifin razılığına oxucular da qoşulmaq istərdilər.

Əgər gələcəkdə Zəngəzurda yaşamış belə hazırcavab, zarafatcıl adamların, satira–yumor ustalarının deyimlərindən ibarət bir külliyyat dərc edilsə, ***(Nə vaxtsa buna təşəbbüs göstəriləcəyi şübhəsizdir),*** onda Həsən müəllimin «Gülüş dolu ömür» kitabı yaxşı bir mənbə kimi istifadə olunmağa dəyər.

**31 dekabrl 1994-cü il. «İki Sahil»**

## ƏLİL QAYĞILARI, ƏLİLLƏRƏ QAYĞI

Qoltuğunda ağacı, qılçasında və ya qolunda qoburu tək qollu, tək qılçalı, əl–ayaq barmaqları kəsilmiş, gözləri qəlpə zədəsindən şikəst olmuş, bu və ya digər bədən üzvü yara almış, bədənində qəlpə gəzdirən neçə–neçə adamlar… 1941–45–ci illərdə yaşayan nəsillərin ürəyini belə adamlar az ağrıtmamışdır. Onların bir çoxu itirdikləri bədən üzvlərinin, aldıqları yaraların fiziki və mənəvi ağrılarını yarım əsrdən çoxdur ki, çəkməkdədirlər. Ancaq özləri ondan təskinlik tapırlar ki, Avropada baş qaldırmış, bütün dünyada ağalıq etmək iddiasına düşən faşizmin məğlub edilməsi, Vətənin müdafiəsi uğrunda mübarizədə əlil olmuşlar.

On il bundan əvvəl Azərbaycan xalqının ağlına da gəlməzdi ki, 1905–1918–20–ci illərdə olduğu kimi, erməni qəsbkarlarının təcavüzünə məruz qalacaq, onun leksikonuna «Qarabağ əlilləri», «Qarabağ şəhidləri», «Şəhidlər xiyabanı», «Şəhidlər bulağı», «Şəhidlər bağı» kimi yeni məfhumlar düşəcəkdir.

Ermənistanın Mehri və Qafan rayonları ilə 160 kilometr sərhəddi olan Zəngilan rayonunda Qarabağ hadisələri dövründə xeyli adam əlil olmuşdur. Respublika Əlillərin Sosial Müdafiəsi Fondunun Zəngilan şöbəsinin müdiri Əli Sobulunun (Əli Seyfulla oğlu Cümşüdlü) «Zəngilan əlilləri» adlı kitabı məhz onlara həsr edilmişdir.

Kitabda Zəngilan rayon şöbəsində qeydiyyatda duran 87 nəfər 1941–45–ci il müharibəsində, Qarabağ döyüşlərində iştirak edən 122 nəfər hərbi və milli münaqişə zəminində və Çernobıl AES–in qəzası zamanı əlil olan 19 nəfərin siyahısı verilmişdir.

Müəllif Qarabağ döyüşlərində əlil olmuş 33 nəfərin döyüş fəaliyyəti ilə oxucuları tanış edir.

Mincivan qəsəbəsindən Elxan Abbasov, Səxavət Babayev, Elsevər Muradov, Hüseyn Səfərov, Qıraq Müşlan (Ağalı-Ə.S) kəndindən Şahbaz və Şəmsəddin Baxşəliyev qardaşları, Baharlı kəndindən Səxavət Cabbarov, Gəyəli kəndindən Rasim Camalov, Zəngilan şəhərindən Vüqar Cabbarov, Səfər Xəlilov, Gürşad Mehdiyev, Güloğlan Süleymanov, Şayıflı kəndindən Füzuli Cəbrayılov, Oqtay Məmmədov, Ağbənd kəndindən Əlyar Əsgərov, Şəfibəyli kəndindən Elşad Əzizov, Məşədi İsmayıllı kəndindən Eldar və Xanlar Həsənovlar, Bartaz kəndindən Məzahir Həsənov, Məlikli kəndindən Əlövsət Həmidov, Nüşrəvan Səmədov, Çöpədərə kəndindən Əşrəf İbadov, Gilatağ kəndindən Salman Quliyev, Yuxarı Yeməzli kəndindən Mürsəl Məmişov, Rəzdərə kəndindən Bəhrəm Musayev, Əzim Nuriyev, Alıbəyli kəndindən Elçin Orucov, Keçikli kəndindən Şəmsəddin Rüstəmov, Məmmədbəyli kəndindən Şamil Teymurov, Hacallı kəndindən Oruc Yusifovun döyüş yolu ilə tanış olarkən göstərdikləri cəsarət və igidlik oxucuda sonsuz iftixar hissi doğurur. Onların bu fədakarlığı gələcək nəsillər üçün ibrətamiz vətənpərvərlik nümunəsidir.

Əli müəllimin əlillərə ictimaiyyətin diqqətini cəlb etmək üçün göstərdiyi bu təşəbbüs təqdirə layiqdir.

Müəllifin göstərdiyi kimi, müqəddəs amal uğrunda mübarizədə, azadlıq, istiqlaliyyət savaşında əlil olmaq elə yarı şəhid olmağa bərabərdir. Qaçqın olmaq doğma torpağı, isti od–ocağı itirmək nə qədər ağırdırsa, qaçqın olub üstəlik əlil olmaq, əmək qabiliyyətini itirmək ikiqat ağırdır. Bax, buna görə də hər bir əlilə hamı tərəfindən elə qayğı göstərilməlidir ki, bu qayğı onun fiziki və mənəvi əzablarını qismən də olsa yüngülləşdirməyə kömək etmiş olsun. Əlillərə «yazığı gəlmək» baxımından deyil, yüksək insanpərvərlik baxımından kömək göstərmək vətəndaşlıq borcudur.

**20 iyun 1998-ci il. «İki Sahil»**

# DƏRDLƏRİ DƏRDİMİZ OLUB, EVİMİZ EVLƏRİ

Öz mənbəyini Zəngəzurun ağ çalmalı dağlarından götürən Oxçu çayının Zəngilandan keçən sol sahilində, Süsən dağının sıldırımlı qayalarının ətəyində salınmış mavi rəngli quraşdırma taxta evlər diqqəti uzaqdan cəlb edir. Get-gedə bu evlərin sayı artır. Onlar hələ çox deyildir. Cəmi on üçdür. Lakin hər həftə yenilərinin təməli qoyulur.

Vaxtı ilə kəndlərə göstərilən etinasızlıq üzündən, ölkənin bir çox yerlərində olduğu kimi, Zəngilanda da bəzi kəndlərin yalnız adı və yeri qalmışdı. Belə kəndlərdən biri Tağlıdır. Onun sonuncu sakinlərinin öz doğma ocaqlarını tamamilə tərk etdikləri vaxtdan yarım əsr keçir. Lakin, görünür, atalar təsadüfən deməmişlər ki, su gələn arxdan bir də gələr. Doğrudan da, indi həmin Tağlı kəndi özünün ikinci ömrünü yaşamağa başlayır.

Qafan rayonundan Azərbaycan kəndlərinin minlərlə sakini 1988-ci ilin fevralından başlayaraq məcburiyyət üzündən öz doğma yurdlarını tərk etməli olmuşdur. Gödəklər, Müsəlləm, Qaraçimən, Qovşud kəndlərindən olan neçə-neçə ailə iki il müddətində Azərbaycanın müxtəlif yerlərində müvəqqəti yaşamalı olmuş, nəhayət, bu il Zəngilanın həmin Tağlı kəndini özlərinə daimi yaşayış yeri seçmişlər. Bu, təsadüfi deyildir. Çünki bu yer təbii mənzərəsi və şəraitinə görə köçkünlərin doğma kəndlərinə çox oxşayır.

Rayon partiya və icraiyyə komitələri didərginlərin burada daimi məskunlaşması üçün lazım olan tədbirləri görməkdədirlər. Bu tədbirlərdən ən başlıcası onlar üçün ev tikdirməkdir. Bunun üçün çoxotaqlı və yaraşıqlı quraşdırma taxta evlər alınmışdır. Bu evlər daş bünövrə üzərində qurulur. Tikintini rayonun 33 nömrəli SMD-nin inşaatçıları aparırlar.

Budur, salınmaqda olan yeni kənddə işlərin gedişi ilə tanış oluruq. 33 nömrəli SMD-nin rəisi S. Ağayev quraşdırılmış, habelə təməli qoyulan evləri göstərib deyir:

- İşçi qüvvəsi sarıdan çətinliyimiz yoxdur. Tikintiyə didərginlərin özləri cəlb olunublar. Onlara heç bir nəzarət lazım gəlmir. Çünki hamı bilir ki, tikilən ev özünündür. Buna görə də qüsursuz işləməyə səy edirlər.

Kəndin ağsaqqalı Mehman Cabbarovun ürək sözləri:

- Qısa müddətdə göstərilən qayğı bizim çətinliklərimizi qismən azaltmış, mənəvi cəhətdən isə kədər və qüssəmizi xeyli yüngülləşdirmişdir. İki il ərzində harada daimi yaşayış yeri seçmək haqqında keçirdiyimiz tərəddüdlər indi ümidlə əvəz olunmuşdur.

Kəndin ağbirçəyi Nazlı Səfərova onun sözünə qüvvət verir:

- Əvvəlcə Əli Bayramlıya getmişdik. Sağ olsunlar, orada bizə çox kömək etdilər. Ancaq biz dağ adamlarıyıq. Oranın şəraitinə uyğunlaşa bilmədik. Ona görə də buraya gəldik. Burda da bizi çox yaxşı qarşıladılar. Atalar yaxşı deyib: Dar gündə haray dədəm oğlu, qardaş. Dərdimiz sizin üçün dərd oldu, eviniz isə bizim üçün ev.

Bu sözlər istər-istəməz azərbaycanlıların Ermənistandan qovulduğu o gərgin günləri xatırlatdı. O zaman Qafan, Mehri, habelə Ermənistanın digər rayonlarından qaçqınlar üçün Zəngilan əsil dayaq nöqtəsi idi. Dəmiryol stansiyalarında qaçqınları qəbul edib maşın və digər nəqliyyat vasitələri ilə respublikanın başqa yerlərinə göndərmək üçün bütün zəhmətkeşlər gecə-gündüz çalışmalı olurdular. Rayon mərkəzində, Mincivan qəsəbəsində, ayrı-ayrı kəndlərdə qaçqınların böyük dəstəsi yerləşmişdi. Elə ailələr var idi ki, öz evində beş-altı qaçqın ailəsi saxlayır, onlara əllərindən gələn qayğını göstərirdilər.

Bir xalq hikmətində deyilir ki, insanların kədəri tüstülənsə idi, kürreyi-ərz əbədi dumana bürünərdi. Bunu didərginlərə də aid etmək olardı. Öz doğma yerlərini, illərdən bəri çətinliklə düzəltdikləri ev-eşiklərini tərk edib çöllərə düşmək, təhqir olunmaq, sözlə ifadə olunmayan mənəvi sıxıntılara məruz qalmaq... Bu dərdləri necə unutmaq olar?! Lakin unudulmasa da, yüngülləşdirilə bilər. Bax, buna görə də Tağlı kəndinin yeni sakinləri olan didərginlər onların dərdlərinə şərik çıxıb yüngülləşdirənlərə minnətdarlıqlarını bildirməklə mənəvi rahatlıq tapırlar.

Tağlı qaçqınların daimi məskunlaşdığı yeganə kənd deyildir. Rayonun Vənətli, Şərifan, Bartaz kəndləri yanında da onlar üçün münasib yeni kəndlər salınır. Hazırda rayonda 174 ailədə birləşən 634 didərgin yaşayır. Rayonda xüsusi köçkünlər komissiyası yaradılmışdır. Bu komissiya köçkünlərin bütün problemlərini öyrənib rayon XDS İcraiyyə Komitəsi qarşısında məsələ qaldırır və onlara lazımi kömək edir.

Didərginlərin problemləri çoxdur. Onlara müvəqqəti yaşamaq üçün vaqon-evlər verilmiş, 112 hektar həyətyanı sahə ayrılmış, 200 min manat uzunmüddətli ssuda buraxılmışdır. Köçkünlərin bir qismi fərdi yolla, bir qismi isə təşkilatlarla müqavilə əsasında özlərinə ev tikdirirlər. 33 nömrəli SMD yeni Tağlı kəndində daha 60-70 taxta ev quraşdıracaqdır. Köçkünlər yaşayan kəndlərdə uşaq bağçaları, kitabxana, tibb ocaqları və başqa sosial obyektlər tikmək üçün perspektiv plan hazırlanıb.

Respublika hökuməti tərəfindən ayrılmış 436 min manatdan başqa, didərginlərə respublika Qayğı cəmiyyəti, Uşaq fondu, Azərsutikinti idarəsi, Azərbaycan SSR Səhiyyə Nazirliyi, Xəzər Gəmiçiliyi İdarəsi, Bakı Dövlət Universiteti, habelə rayonun bir sıra kolxoz, sovxoz, idarə və müəssisələrinin fəhlə və qulluqçuları tərəfindən on min manatlarla nəqd pul, xeyli ərzaq, geyim paltarları, yanacaq, məişət avadanlıqları verilmişdir.

Köçkünlərin yaşadığı yerlərdə vaxtaşırı səyyar ticarət təşkil olunur. Onların siyahıları rayon istehlak cəmiyyətinə verilmişdir ki, hər ay lazım olan ərzağı vaxtında ala bilsinlər Sosial-təminat şöbəsi, sığorta müfəttişliyi, mədəniyyət, rabitə, maliyyə şöbəsi, rayon mərkəzi xəstəxanası, məişət xidməti kombinatı və digər müəssisələr öz istiqamətləri üzrə didərginlərə lazımi xidmət göstərirlər.

Rayon partiya komitəsi veteranların, rayon ağsaqqallarının, idarə, müəssisə rəhbərlərinin köçkünlərlə vaxtaşırı görüşlərini təşkil edir. Bu görüşlər fikir mübadiləsi, ümumi tanışlıq, ehtiyacların öyrənilməsi, bir sözlə, mənəvi baxımdan çox faydalı olur, didərginlərin qardaşlıq köməyinə ümid və inamını artırır.

İndi buradakı hər bir köçkün doğma kəndində olduğundan da yaxşı ev-eşik sahibi olacağına inanır. Lakin bu da gizli deyil ki, kimi din-dirirsən doğma yurdunun, göz açıb böyüdüyü səfalı Qafan dağlarının, onun təkrarsız mənzərəsinin həsrətini çəkir. Vətən həsrəti necə ağır dərd imiş!

Heç şübhəsiz, bu günlər tarixə çevriləcək, gələcək nəsillər erməni millətçilərinin yenidənqurma pərdəsi altında törətdikləri bu faciəni qəzəblə lənətləyəcəklər**.**

**“Kənd həyatı“ jurnalı, N 8, 1990, avqust**

## ZƏNGİLAN: ŞAHİDİN DEDİKLƏRİ

1970-ci ilin oktyabr ayı idi. Şair, filoloq alim Atif Zeynallı Zəngilana görüşə gəlmişdi. Bura İranla ən yaxın sərhəddir. O vaxtlar müxtəlif həyəcan siqnalları və işarəvermə qurğuları ilə mühafizə edilən sərhəd zolağına – Arazın sahilinə quş da səkə bilməzdi. Şairin Arazın sahilinə getmək istəyini həsrət dolu baxışlarından oxudum. Onun bu arzusunu o zaman rayon partiya komitəsinin birinci katibi vəzifəsində işləyən N.Kərimova çatdırdım. Katib bizi iki sərhədçinin müşaiyəti ilə Arazın sahilinə apardı. Öz dünyamızdan ayrılıb sükut içində Arazın sağ sahilini seyr edirdik. Xan Araz isə baxışlarımızı sahildən yığaraq qıvrılan sularına qatıb tarixin sirr dəryasına axıdırdı. Onda ağlımıza gəlməzdi ki, 23 il sonra elə həmin ayın həmin günündəcə və həmin yerdə insanı sarsıdan bir mənzərənin şahidi olacağam, düşmənə girov düşüb alçalmamaqdan ötrü min bir əziyyətlə topladığı var-dövlətini, doğma el-obasını tərk edib xilas olmaq ümidi ilə İran-Azərbaycan sərhədinə – Araza pənah gətirən minlərlə qaçqın...

Onların məşəqqətlərini yalnız görənlər təsəvvür edə bilər. Arazın sağ sahilində İran sərhədi boyunca salınmış qaçqın düşərgələrinə, Arazı vahimə içində keçən qız-gəlinə baxdıqca adamın bağrı qan olurdu. Soyuqdan xəstələnənlərin sayı-hesabı bilinmirdi. Yolda ölənləri elə ordaca dəfn edirdilər.

Dünyanın işinə bax ki, adamların daldalanacaq tapdığı sahildə doğulan uşaqlar da olurdu. Topdağıtmaz evi, əmlakı yağılara qalmış ana çağasını böləməyə bir parça əsgi tapmırdı.

Mincivan qəsəbəsi, Baharlı, Bartaz, Tiri və Hacallı kəndləri istiqamətində keçidlərdən insan axını iki sutka ara vermədi. Arazı gecə keçmək nə qədər əzablı və qorxulu olsa da, düşmən əlinə düşmək çayda qərq olmaqdan yaxşı idi.

Deyirlər, dərd adamları yaxınlaşdırır. Araz sahilinə cəmləşənlər bir-birinin dərdinə şərik olmağa çalışırdı. İranın Arazboyu kəndlərinin sakinləri, xüsusən Bartaz kəndindən olan traktorçular qaçqınların Arazdan salamat keçirilməsində əsl fədakarlıq göstərdilər. İran Qırmızı Aypara Cəmiyyətinin nümayəndələri çadırlar qurub camaata tibbi yardım edirdilər. Kənd sakinləri çörək bişirib paylayır, avtobuslar isə camaatı İmişli rayonuna daşıyırdı. Zəngilanlılar İran vətəndaşlarının və İran hökumət orqanlarının göstərdiyi bu maddi və mənəvi yardımı həmişə dərin minnətdarlıq hissi ilə xatırlayacaq.

Bu məqalənin müəllifi zəngilanlıların arzu və xahişi ilə göstərdikləri maddi və mənəvi kömək üçün İranın dövlət orqanlarına və vətəndaşlarına onların minnətdarlığını çatdırır.

1992-ci ilin dekabrında Zəngilan-Qubadlı rayonlarına hücumlar, Ağdam, Füzuli, Cəbrayıl rayonlarının intensiv surətdə atəşə tutulması, görünür, Kəlbəcər gedişinə hazırlıq imiş. Həmin dövrdə Qafan şəhərinin 10-15 kilometrliyində yerləşən Şayıflı zonasındakı kəndlərin darmadağın edilməsi, buradan Qafan şəhərinin cənub-şərq və cənub-qərb hissəsinə çıxış yolundakı strateji mövqelərin tutulması Qafanı Zəngilan istiqamətindən təhlükəsizləşdirmək üçün edilən bir gediş idi. Çünki Qafan iri sənaye mərkəzidir. Burada mis, molibden mədənləri, onların ilkin emalı kombinatları vardır. Rayonda təxminən 80-90 min əhali yaşayır. Oradan Qarabağa müntəzəm olaraq hərbi sursat göndərilir.

Kəlbəcər işğal edildikdən sonra «Komsomolskaya pravda» qəzetində yazılmışdı ki, ermənilər Horadizdən yolu kəsib oradan cənub-qərbdə yerləşən rayonların əhalisinin İrana keçmək zərurətini ortaya çıxarmaqla İran üçün də yeni problemlər yaratmaq niy-

yətindədirlər və qəzet bu niyyəti açıqlamasa da biz istər-istəməz «Böyük Ermənistan» xulyasını xatırlayırıq. Axı, Arazın sağ sahili Cənubi Azərbaycandır və burada yaşayanlar da azərbaycanlılardır! Bu isə çox şey deyir. Maraqlıdır ki, Kəlbəcər işğal edildikdən sonra Tehranda çıxan qəzetlərdən birində siyasi icmalçının «Qarabağ Tehranın gözü ilə» məqaləsində («Ayna» qəzetinin aprel ayı nömrələrinin birində dərc olunmuşdur) bəzi eyham-lar vurulmuşdur. Bu eyhamlar ermənilərin region üçün oynadıqları çox məkrli siyasi oyundan xəbər verir.

Zəngilan Ermənistanın Qafan və Mehri rayonları ilə 150 kilometr məsafədə iki tərəfdən həmsərhəddir. Qubadlının işğalından sonra onun mühasirə dairəsi qısalıb, müdafiə dairəsi üçüncü tərəfdən 100-130 kilometr  uzandı. Qubadlının işğal olunmamış kəndlərini də Zəngilandakı hərbi hissə müdafiə edirdi. Ancaq bu qüvvə ilə ermənilərin hücumunu dəf etmək olmazdı. Buna görə də əhali təşvişə düşüb kömək gözləyirdi. Baş nazirin müavini A. Abbasov Zəngilana gəlmişdi. Camaat ondan, icra hakimiyyətinin başçısı İ.Hüseynovdan və polk komandiri F. Şabanovdan yol bağlanmamış tədbir görülməsini tələb etdilər. Onlar özləri də vəziyyətin ağırlığını dərk edirdilər. Camaat da onların tərəddüdlərini hiss edirdi.

Qubadlı əhalisinin köçməsi istər-istəməz Zəngilana da öz təsirini göstərdi. Cəbhəyə lap yaxın olan kəndlərdən arvad-uşaq çıxarıldı. Yalnız Mincivan qəsəbəsində və bu zonada heç kəs evini tərk etməmişdi. Hətta şəhər əhalisinin təkidi ilə icra hakimiyyəti Mincivandan rayon mərkəzinə ehtiyat üçün eşalon göndərilməsinə göstəriş verməsinə baxmayaraq, Mincivan dəmiryolçuları və qəsəbə fəhlələri bunu təxribat kimi qiymətləndirib ciddi müqavimətlə kütləvi köçmənin qarşısını aldılar. Ermənilər Qubadlını qarət edincə nisbi sakitlik yarandı. Sonra isə noyabrın 5-ə kimi atəşkəs haqqında əldə edilən razılıq ermənilərin hücum etməyəcəklərinə ümid yaratdı. Buna görə də rayonu tərk edənlərin əksəriyyəti geri qayıtdı.

Bəli, camaat həmişə olduğu kimi, Sabir Rüstəmxanlı demişkən, aldana-aldana inandı, inana-inana da aldandı. Oktyabrın

25-də ermənilər atəşkəsi pozaraq Zəngilana hücum etdilər. Artıq Zəngilan tam mühasirəyə düşdü.

Beləliklə, bir zamanlar həsrətlə baxdığımız Arazın sağ sahilindən indi onun sol sahilinə – Şükrətaz, Əskülüm, dağlarına, füsunkar Süsən, Top, Leşkər meşələrinə, Rəzdərə təbii çinarlığına, Oxçu, Bərgüşad, Bəsid çaylarının vadilərinə göz yaşları içində baxmalı olduq. Düşmən mərmilərindən viran olan rayon mərkəzinə, Mincivan qəsəbəsinə, kəndlərə baxdıqca adamın qəlbi az qalır ki, döyünməkdən qalsın.

Bəli, bu gün respublikamızın düşdüyü vəziyyət ağırdır. Lakin aqillər demişkən, hər millətin bir qisas günü də var. Xalqımız həmin günü reallaşdırmaq üçün indiyə kimi aldandıqlarından və aldana-aldana inandıqlarından əməli nəticə çıxarmalıdır.

**N-63, 19.12.1993-cü il. «İki Sahil»**

## DİDƏRGİN QAYĞILARI, DİDƏRGİNƏ QAYĞILAR

Yaşlı nəsillərə ehtiyac olmasa da gənclərə bunu dönə-dönə xatırlamaq zəruridir ki, Qafqazdan Berlinədək 1418 gün əzablı döyüş yolu keçmiş Sovet Ordusu sırasında Azərbaycan oğulları, o cümlədən, indi bəzilərinin istehzasına məruz qalan, öz yurdlarından didərgin düşməyə məcbur olan rayonların oğulları da böyük hünərlər göstərmişlər. Elə bunu respublikanın ucqar dağ rayonu olan Zəngilanın da timsalında görmək olar. Təkcə 416-cı Taqanroq diviziyasının tərkibində şərəfli döyüş yolu keçmişdir. Onun alaylarından birinin komandiri İsmayıl Sayılov 1943-cü ildə şiddətli döyüşlərdə misilsiz qəhrəmanlıq göstərmişdir. Bu dövr mətbuatında «Bakraboçi» qəzetinin müxbirinin «Əfsanəvi kapitan», filoloq alim Rasim Tağıyevin «Süngüyə dönmüş qələm» kitabında onun haqqındakı məqalələri, yazıçı jurnalist Calal Bərgüşadın teleradio oçerkini xatırlamaq kifayətdir.

Melitopolda əbədiyyətə qovuşmuş kapitan İsmayıl Sayılovun necə bir döyüşçü zabit olduğu diviziyanın salnaməsində şərəfli yer tutur.

Marşal Qovrov Zəngilanın Vejnəli kəndindən olan sıravi əsgər, snayperçi Şaban Qocayevin adını dönə-dönə iftixarla çəkmişdir. O, döyüş zamanı 20 faşisti susdurmuşdur.

Partizan dəstələrindən birində xidmət edən Zəngilanın Orta Yeməzli kəndindən olan İslam Niyazağa oğlu Belarusiyada Partizan dəstəsindən birinin döyüş şöhrəti salnaməsində onun uğurlu əməliyyatları haqqında çox faktlar yazılmışdır.

Belarusiya partizan hərəkatı xadimlərindən biri Maşerov onun igidliyini öz çıxışlarında dönə-dönə xatırlamışdır.

Qıraq Müşlan kənd sakini Vəli Quliyev göstərdiyi igidliyə görə «Şöhrət» ordeninin üç dərəcəsinin üçünə də layiq görülmüşdür. Bu, Sovet İttifaqı Qəhrəmanı kimi yüksək fəxri ada bərabər bir təltif idi. Latviyada bir məktəbə də onun adını vermişlər.

Alman faşizminə qarşı müharibədə Zəngilandan səfərbərliyə alınmış 3000 nəfərdən yarısı öz doğma yurdundan min kilometrlərlə uzaqda olan döyüş meydanlarında əbədiyyətə qovuşmuşdur. Ermənilərin işğal etdiyi bütün rayonlarımızdan onlarla belə nümunələr göstərmək olar.

Arasında tək-tək qeyrətsiz, qorxaq olsa da bütövlükdə camaata qeyrətsiz demək olmaz. Bu günkü məğlubiyyəti və bunun nəticəsində baş vermiş qaçqınlıq faciəsinin çox dərin siyasi kökləri vardır. Buna görə də camaata bu damğanı vurmaq onların qaysaqlanmamış yaralarının üstünə duz səpib göynətmək deməkdir.

Qafan və Mehri kimi böyük sənaye potensialına malik olan iki rayonun sərhədində Zəngilan kimi kiçik bir rayonun 2110 sutka təhlükəyə dözməsini  qorxaqlıqmı hesab etmək olar?!

Rayon işğal oluan kimi onun 15 kəndi dağılmış, yüzə qədər adamı şəhid olmuş, rayona dəyəri milyon manatlarla hesablanan maddi ziyan vurulmuşdur. Rayonun ərazisinə minlərlə mərmi yağdırılmışdır. Bununla  belə camaat Qubadlı işğal olunana kimi, hətta bir ay da artıq inamını itirməyərək doğma yurdunu tərk etməmişdir.

Yalnız tam mühasirəyə düşüb Xocalıdan daha dəhşətli bir faciəyə məruz qalacağını yəqin etdikdən sonra əhali çox əzabla Arazdan İran sərhədinə keçmək məcburiyyətində qaldı. Həm də elə bir vəziyyətdə ki, on illərlə topladığı az-çox mal-mülkünün çox cüzi bir hissəsini belə götürməyə imkan tapmadı.

Buna görə də öz yurdunu tərk etmək məcburiyyətində qalanlara qeyrətsiz demək, onları alçaltmaq ən azı insafsızlıqdır.

Xalq xeyirxahlardan xali deyil. Bu gün minlərlə adam sözün tam mənasında didərginlərin dərdlərini öz dərdləri, qayğılarını da öz qayğıları hesab edirlər. Hətta respublika prezidentinin çağırışına qoşularaq bəzi imkanlı adamlar didərginləri şəxsi himayəsinə götürürlər.

Bu günlərdə Bakı müəssisələrinin yataqxanalarında – Bilgədə, Sumqayıtda, Qaradağda, Xırdalanda yerləşən bir çox zəngilanlı ilə görüşdüm. Onlara xeyirxahlıq göstərən ayrı-ayrı adamlar, əmək kollektivləri haqqında xoş sözlər eşitdim, zəngilanlılar xeyirxahlıq göstərənlərin hamısına mətbuat vasitəsi ilə öz minnətdarlıqlarını çatdırmağı xahiş edirdilər.

Bütün bunlarla bərabər, onların problemləri, qayğıları hədsizdir. Zəngilan didərginlərinin əksəriyyəti Bakı və onun rayonlarında, Sumqayıtda sığınacaq tapmışlar. Sabirabadda olan icra hakimiyyətinə və fəaliyyətə başlamış bəzi idarələrə gedib-gəlmək üçün nəqliyyat xərclərinin bahalığı maddi cəhətdən onsuz da korluq çəkən adamlar üçün xüsusilə çətinlik törədir.

Didərginlərə alçaldıcı nəzərlərlə baxanlara gəlincə, eybi yoxdur, hələlik buna da dözmək lazım gəlir, ancaq hər şeyi zaman göstərəcəkdir...

**03 yanvar 1994-cü il. «Meydan»** qəzeti

## ERMƏNİ SİQLƏTİ

Qafan rayonunda çıxan «Mis uğrunda» qəzetində 1978-ci ildə Ermənistanın Rusiya ilə birləşməsinin 150 illiyi ilə əlaqədar olaraq dərc olunmuş «Dağ qartalı» adlı bir məqaləni xatırlayıram.

Məqalədə 1724-ci ildə türklərə qarşı müharibədə Davidbekin sərkərdəlik məharətindən danışılır. Məqalədə belə bir epizod vardı: Türk ordusu Qafanın «Halinuzor» qalasında Davidbekin 300 nəfərlik döyüşçüsünü mühasirəyə alıb. Bu, döyüşçüləri ruhdan salsa da, Davidbeki ruhdan salmır. O, xilas olmaq üçün çıxış yolları axtarır. Bir gün o, 169 madyanı qaladan çölə buraxır. Madyanlar Türk ordusunun ayqırlarını (erkək atlarını) təlatümə gətirərək bərk qarma-qarışıqlıq yaradır. Bundan istifadə edən Davidbekin dəstəsi mühasirədən çıxıb hücuma keçir və böyük tələfat verməklə 70 minlik Türk ordusunu məğlub edir.

Məqalə başdan-ayağa türklərə qarşı nifrət ruhunda yazılmışdı. Əlbəttə, bu təəccüblü deyildi. Bu, ermənilərdə ümumi azardır. Ancaq məqalədə 169 madyan məsələsi diqqəti xüsusilə cəlb edir.

Bu uydurma, iki yalançıdan birinin toyda bir pud duz işlətməsinə, digərinin isə əkdiyi boranı tağının Arazın üstündən adlayıb körpü kimi istifadə olunması haqqındakı uydurmaya bənzəyir. Lakin erməni-türk münasibətləri prizmasından baxanda dərk edirsən ki, «Əfsanələşdirilmiş» bu əhvalat erməni hiyləgərliyinin tipik bir variantıdır. Bu əfsanə istər-istəməz başqa bir faktı - erməni qızları ilə azərbaycanlıların saysız-hesabsız nigahını yada salır. Sən demə, ermənilər qızları ilə kişilərimizi də «təlatümə» gətirmişdir.

Bir zamanlar bu barədə nəinki söhbət açmaq olardı, hətta, necə deyərlər, adamın atasını da yandırardılar. Belə nigahlar beynəlmiləlçiliyin rəmzi kimi təbliğ olunurdu. (Bu məktubun müəllifi də «Beynəlmiləlçi ailələr» haqqında yazıb danışanlardan biri olduğunu səmimiyyətlə etiraf edir).

Azərbaycan xalqı eşqi ailə səadətinin əsası kimi çox müqəddəs saymışdır. Böyük Nizami isə ona belə bir poetik məna vermişdir: «Eşqdir mehrabı uca göylərin». Qızlarımızın gözəlliyi dillərdə dastan olduğu halda, necə olmuşdur ki, bizim oğlanlar hayqanuşları, siranuşları evlərinin «xanımı»... «yan»ları da övladlarının dayıları, babaları etmişlər?! Bəs, nə üçün münasibətlər kəskinləşən kimi bu ailələr sabun köpüyü kimi yoxa çıxdılar?!

«Komsomolskaya pravda» qəzetinin nömrələrinin birində Quliyeva familiyalı orta məktəbdə oxuyan bir qızın məktubun-

da deyilir ki, atam azərbaycanlı, anam ermənidir. Atam qorxaqlıq edib anamı boşamışdır. Biz köçüb başqa yerə getmişik. İndi mən bilmirəm, haralıyam...

Bəli, belə bir sualın ortaya çıxması təbiidir. Çünki qızcığaz bunu atasının qorxaqlığında görür. Ancaq dayıları «yan»ların necə günahkar olduqlarından heç adını da çəkmir. Ancaq neçə-neçə illər sonra anasından lap beşikdə eşitdiyi «Səsini kəs, türk gəlir» sözləri ilə öz uşaqlarını da qorxuzacaqdır. Necə bizim analar öz uşaqlarını «xortdan»la qorxuzan kimi.

Bir vaxtlar müxtəlif mədəni kütləvi tədbirlərlə əlaqədar olaraq, Qubadlı, Zəngilan, Laçın rayonlarının nümayəndələri ilə, Gorus, Qafan, Mehri nümayəndələri arasında tez-tez görüşlər olardı. Bu rayonlarda da qarışıq ailələr  var idi. Hərdən zarafatla soruşardım ki, Qara keşiş Əslini Kərəmə verməmək üçün hər cür kələyə əl atırdı. Bəs necə oldu ki, indi siz öz qızlarınızı tərəddüd etmədən azərbaycanlılara verirsiniz? Bu sualıma 1920-ci ildə Bakıdan Gorusa göndərilmiş partiya veteranı Nikol Ayriyan belə cavab verdi:

- Əşşi, o vaxt keşiş bir səhvdir edibdir. Dilimiz ayrı olsa da, bir yerdə yaşayırıq, adət-ənənələrimiz, hətta musiqimiz də bir-birinə oxşayır. Bizim üçün nə fərqi var.

O vaxtlar bu cavab mənə çox «səmimi» görünürdü. Lakin erməni-azərbaycanlı münasibətinin kəskinləşməsi ilə əlaqədar olaraq olub keçən, yaxud davam edən hadisələrə, proseslərə aşkarlıq prizmasından nəzər salarkən gec də olsa, çox mənbələri dərk etməli olduq. Heç bir sübuta ehtiyacı olmayan bir faktdır ki, ermənilər öz qızlarının azərbaycanlılara ərə getməsinə nəinki mane olmur, hətta onları buna təşviq də edirlər. Onlar bu intim yolla Azərbaycanda uzun müddətli erməniləşmə siyasətini yeritmişdilər. Əgər təkcə əsrimizin əvvəlindən bəri, xüsusən, 30-cu illərindən sonra statistik tədqiqatlar aparılsa, nəticəsi, sözsüz, bunu təsdiq edər. Tanınmış publisist Vasili Lvoviç Veliçko özünün 1904-cü ildə Sankt-Peterburqda dərc etdirdiyi «Qafqaz» məcmuəsinin birinci cildinin 5-ci fəslinin ermənilər adlı bölməsində verilmiş məlumatlar çox xarakterikdir. Çox təəssüf ki, Azərbay-

can oxucuları bu kitabın üzünü yalnız keçən il görmüşlər. Veliçko yazır kı, erməni qadınları farslarla, Azərbaycan tatarları ilə, türklərlə, gürcülərlə, dağlılarla və başqa millətlərlə məcburi əlaqəyə girməli olmuşlar. Bir də ki, axı onlar dövlətçiliyin onunla bağlı olan qürur və mənliyini müdafiə qabiliyyətini itirmiş bir xalqın qadınlarının nazı ilə oynamayacaqlarmış ki! Belə bir şəraitdə ermənilərin damarından hər cür qan axması mümkündür.

«Asiyada təmiz qanlı ermənilərin «dovşandan qorxaq» adlandırılması haqqında yaranmış el məsəli də təsadüfü deyil. Bununla belə bu tutqun fonda istisna olaraq zaman-zaman ermənilərdən igid sərkərdələr də çıxmışdır. Bu ondan irəli gəlir ki, onların qanı başqa cəngavər millətlərin qanıdır...»

Veliçkonun bu müddəasını oxuyarkən adamın daxilində istər-istəməz gümanlar, sirli suallar baş qaldırır: Görəsən, sovet hakimiyyəti illərində marşal səviyyəsinə yüksələn iki nəfərin (Baqramyanın və Babacanyanın) hər ikisinin Azərbaycanın eyni kəndindən - Şəmkir rayonunun Çardaxlı kəndindən olmasını Veliçkonun bu müddəası ilə izah etmək günah olmaz ki!? Bu barədə günaha batmaq istəmirəm, ancaq bunu sübut etməyə ehtiyac yoxdur ki, yüksək hərbi rütbə müxtəlif mənsəb sahibi olmuş bir çox ermənilərlə bərabər, onlar da öz mayalarını Azərbaycanın min bir neməti ilə tutmuşlar. Ancaq öz nankorluqlarını həmişə mühafizə etmişlər. 100 illərlə erməni millətçilərinin kilsə xadimlərinin apardığı siyasət sayəsində Ermənistanda bir nəfər azərbaycanlı qalmadığı halda Bakının özündə minlərlə erməni damazlığı və onun törəməsi yaşamaqdadır.

Kim zəmanət verə bilər ki, kimlərinsə himayə etdiyi bu ermənilər və onların törəmələri təxribatla, xəfiyyəçiliklə məşğul olmurlar və ya olmayacaqlar?!

Nəinki küçə, bazar və meydanlarımızda, hətta dövlət idarələrimizdə danışılanlardan Ermənistanda dərhal xəbər tutulmasının səbəbini məhz bununla izah etmək olar?! Təkcə son vaxtlar Bakıda baş vermiş təxribatlar buna sübut deyilmi?

Bəli, yaradan Azərbaycandan öz səxavətini əsirgəməmişdir. Ona yerüstü, yeraltı sərvət, hər cür iqlim şəraiti, dağ, aran, çaylar,

dəniz, göllər də bəxş etməklə yanaşı, onun ürcahına nankor, son dərəcə məkrli, bədxahlıq üçün arvadından belə keçən qonşu da çıxarmışdır.

Əsrlərdən bəri məkrinə dəfələrlə düçar olsaq da, bunu tez də unutmuşuq. Elə bilmişik ki, bu qırğınlar bir də olmayacaqdır. Ancaq bu unutqanlıqla biz 1988-ci ildən indiyədək daha artıq fəlakətə düçar olduq.

Görəsən,ermənilər daha nə kimi hiylələr işlətməlidir ki, biz ayılıb ondan bir dəfəlik qəti ibrət dərsi alaq!

**N- 13, 02.06.1994. «İki Sahil»**

# VƏTƏN DƏRDİ - FƏLƏK VERDİ

***Ay ana, ana!***
***Günləri sana.***
***Mən gedirəm Zəngilana***
***Qal yana-yana!***

Vaxtilə məşhur xanəndəmiz Zülfü Adıgözəlovun oxuduğu, indi Azərbaycan radiosunun fondunda saxlanan bu mahnının nə vaxt yarandığını söyləmək çətindir. Mahnının motivində dərin bir kədər duyulmaqdadır. Onun sözlərindən aydın olur ki, Zəngilana getmək sanki gedər-gəlməzə - sürgünə getmək kimi bir gəza imiş. Zəngilan bir zamanlar, doğrudan da, Qarabağ bəylərinin sürgün yeri olmuşdur. Bunu söyləməyə Qarabağın Cavanşirlər nəslindən olan Məmmədbəy Aşiqin valideynləri tərəfindən Zəngilana göndərilməsi əsas verir. Məmmədbəy Aşiq Zəngilani təxəllüsünü özünə məhz buna görə götürmüşdür. Necə deyərlər, o vurub-yıxan, at oynadan bəy balalarından deyildi. O, həssas qəlbli, şair təbli bir ziyalı idi. Bu isə heç də atasının xoşuna gəlmirmiş. Deyirlər, bu şeri o, anasına atasından giley kimi yazmış və onun bir zaman peşman olacağına eyham vurmuşdur.

Əslində isə təbiət Zəngilandan öz səxavətini əsirgəməmişdir. Bura sürgün yeri deyil, Zəngəzurda rahat yaşamaq üçün dağlı-aranlı, hər təbii şəraitə, maddi nemətlər mənbəyinə malik bölgədir.

Onun ərazisindən keçən Araz, Oxçu, Həkəri, Bəsit çaylarının vadiləri boyunca uzanıb gedən münbit torpaqlar, Ağ oyuq, Qara yazı, Gəyən kimi göz işlədikcə uzanan düzənliklər, qoynu əfsanəvi cənnət timsallı hər cür ağac, çöl heyvanları, quşları ilə zəngin olan Süsən, Əsgülüm, Leşkər, Top meşələri, dünyada ikinci, Avropada birinci olan 117 hektarlıq təbii çinarlıq, tut, meyvə bağları, mal-qara otlaqları, tükənməz yerüstü və yeraltı sərvətlər...

1930-cu ildən inzibati rayon kimi formalaşan Zəngilan əllinci illərdən sonra öz simasını elə sürətlə dəyişməyə başlamışdı ki, onun qırxıncı illərə qədərki görkəmi ilə müqayisə etməyə heç bir şeyi qalma-mışdı.

Geniş üzüm, tütün plantasiyaları salınmış, əkinçilik, heyvandarlıq sahələrində xeyli irəliləyiş əldə edilmişdi. Həkəri çayından Ağ oyuq düzünə su çıxarmaq arzusu həyata keçirilmiş, 3500 hektardan çox sahəni suvarmağa imkan verən güclü hidrokompleks tikilmişdi.

Elə kənd yox idi ki, ora yenidən qurulmasın. Bütün kəndlər təhsil, səhiyyə, mədəniyyət, iaşə, ticarət, nəqliyyat xidməti ilə əhatə olunmuş, elektrikləşdirilmiş, radiolaşdırılmış və telefonlaşdırılmışdı. Xudafərin hidrokompleksinin tikintisi ilə əlaqədar olaraq Tehrandan gələn nümayəndə heyəti Zəngilanda su altında qalmalı olan kəndləri gəzərkən bu kəndlərin abadlığına, gözəlliyinə qibtə edir və bunların su altında qalacağına heyifsilənirdi. Nümayəndələrin kəndlərimizin abadlığı haqqında dedikləri buranın sakini kimi qəlbimdə dərin iftixar doğururdu. Bütün bunlar indi ancaq bizim təsəvvürümüzdə və yazılı mənbələrdə qalmışdır. Düz bir ildir ki, bu yerlər düşmən işğalı altında talan qarət olunub yer ilə yeksan edilmişdir.

Deyirlər ki, insan malik olduğunun qədir-qiymətini onu itirəndə dərk edir. Bu gün respublikamızın müxtəlif guşələrinə səpələnmiş qaçqınlar kimi zəngilanlılar da düçar olduqları bu faciəni sonsuz bir ürək ağrısı ilə yaşayırlar. Çünki onlar on illər ərzində qazandıqları, qurub-yaratdıqları nə varsa, hamısından məhrum olublar.

Cənubi Azərbaycandan olan mühacir Yaqub Zürufçunun oxuduğu «Aman ayrılıq» mahnısını bir sıra azərbaycanlı müğənnilərinin ifasında az eşitməmişəm. Ancaq heç birisi Yaqubun səsindəki təsiri bağışlamır. Mən Arazdan İrana keçib bircə dəqiqə ayrıldığım doğma Zəngilanı sağ sahildən seyr edərkən dərk etdim ki, nə üçün Yaqubun səsi bu qədər qüssəlidir. Xudaya! Görəsən, Vətən dərdindən ağır dərd varmı? Qəlbimdə baş qaldıran bu suala var səsimlə milyon dəfə demək istəyirəm: Yox! Yox! Yox!...

Zəngilanın süqutu haqqında geniş söhbət açmaq istəmirəm. Bu barədə az yazılmamışdır. 1993-cü il martın sonunda Kəlbəcərdən ermənilərin götürdükləri start Ağdamın, Füzulinin, Cəbrayıl və Qubadlının işğal olunması ssenarisinə uyğun olaraq oktyabrın 30-da Zəngilanda başa çatdırıldı. Zəngilan isə qədim Zəngəzurun sonuncu bölgəsi idi. Onun Qarabağla bir qarış da sərhədi yox idi. Ancaq buranı da işğal etməklə ermənilər Qarabağı Zəngəzurla birlikdə Azərbaycanın İranla olan təxminən 110 kilometrlik sərhədini Horadiz-Mincivan-Qafan dəmir yolunu nəzarət altına almaqla başa çatdırmış oldular. Kəlbəcər işğal olunanda (yeni hücum startında) Ermənistanın prezidenti Ter Petrosyan Moskvada, Zəngilan işğal olunanda (finiş mərhələsində) isə Fransada idi. Bununla da o, dünya ictimaiyyətinin diqqətini yayındırmaq istəyirdi ki, guya bu təcavüz deyil, Qarabağ silahlı qüvvələrinin milli-azadlıq işidir.

Görəsən, nə qədər məkrli bir siyasətçi olmalısan ki, dünya ictimaiyyətini aldatmağa belə cəsarət göstərəsən və beynəlxalq miqyaslı siyasətçi kimi nə qədər sadəlövh olmalısan ki, bu boyda ağ yalana inanıb bir dövlətin digər dövlətə qarşı təcavüzünə etinasızlıq göstərib susasan, hətta onu müdafiə də edəsən?! Bu yerdə istər-istəməz belə bir el misalı yada düşür: «Arxalı köpək qurd basar...»

Kəlbəcər işğal olunandan sonra «Komsomolskaya pravda» qəzeti yazmışdı ki, ermənilər Horadizdən yolu kəsib Azərbaycanın cənub-qərbdə yerləşən rayonlarının əhalisinin İrana keçmək zərurətini ortaya çıxarmaqla İrana yeni problemlər yaratmaq niyyətindədirlər.

Həmin vaxtda Tehranda çıxan qəzetlərin birinin siyasi icmalçısı «Qarabağ Tehranın gözü ilə» adlı məqaləsində («Ayna» qəzetinin aprel nömrəsində) bəzi mətləblərə eyhamlar vurur və qonşu ölkələrin siyasi dairələrinin nəzərinə çatdırır ki, ermənilər regionda çox məkrli bir siyasi oyun oynamaqdadır. Elə həmin dövrdə Suriyada Keşişyan adlı bir daşnaq fəalı çıxış edib demişdir ki, yaxın illərdə Ermənistan üçün ərazi problemi olmayacaqdır.

Ermənistanın Azərbaycana qarşı təcavüzkarlığını sübut etməyə onlarla təkzibedilməz fakt vardır. Qarabağ bəhanədir. Ermənistanın uzun illərdən bəri həyata keçirmək üçün hazırladığı planı və ona kömək edən qüvvələrin səylərini heç bir diplomatik ziqzaqla ört-basdır etmək olmaz.

Qafan və Mehri kimi böyük sənaye potensialına malik 2 rayonun əhatəsində olan Zəngilan kimi kiçik bir rayonun ağır silahların atəşi altında altı il davam gətirməsi çox da asan iş deyildi. Bu müddət ərzində Zəngilanın özündə 160 nəfər şəhid olmuş, 28 nəfər dinc sakin qətlə yetirilmiş, 32 nəfər itkin düşmüşdür.

Zəngilan əhalisi Qubadlı rayonu işğal olunan, hətta ay yarım ondan sonraya kimi inamını itirməyərək doğma yurdunu tərk etmədi. Yalnüz Horadiz yolu kəsilib tam mühasirəyə düşdükdən sonra rayonu tərk etmək məcburiyyətində qaldı, yeganə xilas yolu olan Arazdan İran sərhədini keçdi. Bu mənzərənin dəhşətlərini təsvir etmək çətindir. Qocaların, qadınların, xəstələrin Arazdan necə piyada keçmələrini, oktyabrın soyuğunda Araz sahilində şiddətli külək və yağış altında, açıq havada necə gecələdiklərini, körpə uşaqların necə dözülməz vəziyyətə düşdüklərini xatırladıqca az qalır adamın ürəyi döyünməkdən qalsın. Bəli, bu inana-inana aldanmağın və aldana-aldana inanmağın nəticəsi idi.

Budur, indi bir ildir ki, digər rayonlardan olan qaçqınlar kimi zəngilanlı qaçqınlar da isti ocaqlarından kənarda olmazın əziyyətlərlə üzləşməli, ən ağır sınaqlara davam gətirməli olublar. Zəngilanlılar doğma yurdlarından ayrı düşdükləri günü ömürlərinin ən qara günü kimi sonsuz kədərlə yada salırlar. (Onun heç yaddan çıxan vaxtı varmı?) Respublikamızın rayonlarında, Bakı şəhərində və onun kəndlərində məskunlaşan zəngilanlılar faciəli

bir həyat keçirirlər. Neçə-neçə adamlar ağır məişət şəraitinə, yurd həsrətinə dözməyib dünyasını dəyişmişdir.

Bakının rayonlarında, Sumqayıt şəhərində üstü hələ örtülməmiş yarımçıq tikintilərdə, yataqxanalarda, məktəb və bağçalarda, «Çadır şəhərciklərində» dözülməz dərəcədə - ağır bir vəziyyətdə yaşayırlar. Bu gün hər bir zəngilanlının qəlbi vətən həsrəti ilə döyünür, respublikanın rəhbərliyi tərəfindən torpaqların geri qaytarılması istiqamətində görülən tədbirləri böyük ümidlə izləyirlər.

**«Sərhəd» Qəzeti, 16 noyabr 1994-cü il**

## QƏLBİMİZDƏ ƏBƏDİ YAŞAYACAQDIR

Altı il gecə-gündüz düşmən əhatəsində, mərmi yağışı altında, toyların mağarları qurulub, xonçaları açılmamış, bəy otaqları bəzəkli qala-qala, ürəklərdə nifrət-qəzəb, əldə silah, dillərdə müqəddəs rəhim Allah – bax beləcə döyüşüb, yaşayıb Zəngilan!

Mühasirə əzabı görüb, Şuşa, Laçın, Kəlbəcər, Ağdam, Füzuli, Cəbrayıl, Qubadlı kimi talan olub, yüzlərlə şəhid verib Zəngilan!

Bu böyük siyasi «Qarabağ oyunu» erməni təcavüzünün Azərbaycan üçün törətdiyi faciənin bir anı gərək onun yaradılacaq salnaməsindən kənarda qalmasın. Bu, bir çox cəhətdən nəinki zəruri, həm də bu salnamənin yaranmasına hər kəs əlindən gələn köməyi göstərməlidir. Bu baxımdan «Zəngilan şəhidləri», «İşğal» kitabının müəllifi jurnalist Akif Kərimlinin təşəbbüskarlığı təqdirəlayiqdir.

Bu kitablarda Zəngilanın işğalı, Zəngilan və digər cəbhələrdə şəhid olmuş zəngilanlıların, Bakı, Sumqayıt, Gəncə şəhərlərində, İmişli, Ağstafa, Salyan, Quba, Zaqatala, Qarabağ, Saatlı, Neftçala, Lerik, Ağdərə, Astara, Ucar və digər bölgələrdən Zəngilana gəlib vuruşmalarda həlak olanların portreti, tərcümeyi-halı, döyüş rəşadətləri və həlakolma məqamları haqqında məlumatlar toplanmışdır.

Onların çoxlarının dəfn mərasimlərində bir həmyerli kimi iştirak etmişəm. Kitabı oxuyarkən sanki həmin mərasimləri bir də

yaşadım. Nənələrin, qız-gəlinlərin ah-nalələri qulaqlarımda yenidən səsləndi.

«Zəngilan şəhidləri» kitabının ilk səhifələri Zəngilanın ilk şəhidləri 1990-cı il martın 18-də Mincivan-Meqri dəmiryolu marşrutunda ermənilər tərəfindən qətlə yetirilmiş maşinist İsmayıl Allahverdiyev, maşinist köməkçisi Elman Qurbanov, 1991-ci ilin noyabrın 19-da ermənilər tərəfindən vurulmuş vertolyotda həlak olmuş general M.Əsədov, Yevlax Mülki Aviasiya İdarəsinin «AN» təyyarəsinin pilotu Goranboya enərkən ermənilər tərəfindən vurulmuş və Azərbaycanın Milli Qəhrəmanı fəxri adına layiq görülmüş Əsəd Əsədovun həyat və fəaliyyətinə həsr olunmuşdur.

1992-ci il dekabrın 10-da Zəngilanda ən qanlı döyüşlər getmişdir. Ermənilər 15 kilometr sərhədi keçərək 10 kəndə soxulmuş və bu kəndləri yandırmışlar. Bu basqın nəticəsində 42 nəfər yaralanmış, girov götürülmüş, 26 nəfər mülki şəxs və bir neçə döyüşçü qətlə yetirilmişdir.

Həmin döyüşlərdə rota komandiri Adil Rüstəmov müstəsna şücaət göstərmişdir. Yenicə ailə ocağı yandıran Adilin qəhrəmancasına həlak olması onu tanıyanların qəlbinə dağ çəkdi. Anası Gilas xanımın qəlbi isə bu dağa dözməyib elə onun qəbrinin üstündə əbədi susmuşdur.

Rayon rabitə şöbəsinin işçiləri Sücaət İsgəndərova və Alik Aslanov Qazançı kəndində olan döyüşçülərə ərzaq aparırdılar. Onlar bununla da cəbhəyə öz köməklərini göstərmək istəyirdilər. Lakin onlar da düşmən gülləsindən şəhid oldular. Sücaətin yeganə övladı yetim, Alikin isə on gündən sonra olacaq toyunun mağarı qurulub, bəy otağı isə bəzəkli qaldı.

Mincivan dəmiryol mühəndisi Nadir Feyziyev orduda «Qrad» üzrə bacarıqlı mütəxəssis kimi rotaya komandirlik edirdi. Rayonda onu elə «Qrad Nadir» deyə çağırırdılar. Ermənilər onun sərrast atəşlərinin gücünü dönə-dönə görmüşdülər. Buna görə ondan qisas almağa çalışdılar. Döyüşlərin birində belə məqam düşdü. Düşmənlər onu mərmi yağışı ilə susdurdular. Onun dörd bacısı qardaşsız, iki qızı atasız, ata və anası isə ahıl vaxtlarında oğulsuz qaldı.

Kitabda həyatı yarımçıq qalan, qönçə ikən solan, neçə-neçə belə şəhidlərin qəmli hekayəsi toplanmışdır.

Kitaba müqəddimə yazan İmamverdi İsmayılov jurnalist həmkarımız Akifin Ermənistan-Azərbaycan münaqişəsi başlanan gündən bəri Zəngilandan olan şəhidlərin xatirəsini yaşatmaq üçün çox zəhmət çəkməsini razılıq hissi ilə qeyd edir. Mən də Zəngilan rayon qəzeti jurnalist kollektivi adından onun öz yetişdirməsi olan Akif Kərimlinin gördüyü bu nəcib işə öz razılığımı bildirirəm.

**N- 8, 09.10.1994. «Demokratiya» qəzeti**

# ŞƏHİD ATASI DEYİR:
***Oğul əzizdir, yurd ondan daha əziz***

Zakir Quliyev 1968-ci ildə Zəngilanın Aşağı Yeməzli kəndində baytar texniki İsmayıl İbad oğlunun ailəsində göz açmışdır. O, ailənin səkkiz uşağından biri idi.

Orta məktəbi qurtarandan sonra 2 il əsgəri xidmətdə olmuş, tərxis olunduqdan sonra isə bir müddət təsərrüfatda çalışmışdır. Arzusu hüquq təhsili almaq idi. Ancaq getdikcə şiddətlənən erməni təcavüzü onu 1992-ci ilin aprelində könüllü olaraq rayonun xüsusi təyinatlı polis bölməsində xidmət etmək zərurəti qarşısında qoydu. Bu dövrdə Zəngilan Meqri və Qafan rayonu istiqamətindən tez-tez hücuma məruz qalırdı. Bu hücumların dəf olunmasında Zakir də iştirak etmiş və az igidlik göstərməmişdir. Rayon polis bölməsi ilə hərbi batalyonun Rəzdərə–Kollu kənd istiqamətində ermənilərin hücumuna qarşı keçirdiyi döyüş əməliyyatında bir sıra həmkarları ilə birlikdə Zakir də diqqətəlayiq döyüşçü məharəti göstərmişdir. Bu döyüşdə o mühasirəyə düşmək təhlükəsini hiss edərək sərrast tulladığı qumbara ilə bir neçə erməni silahlısını susdurmuş və xilas olmuşdur.

1993-cü ilin iyun ayından sonra Ağdamın, Qubadlının və Cəbrayılın zəbt olunması Zəngilan üçün də real təhlükə yaradırdı. Bu gərgin vaxtlarda bütün polis işçiləri ilə bərabər, Zakir də sərhədlə-

rimizi qorumaq üçün gecə-gündüz postlarda dururdu. O, rayonun işğalının son gü-nündə, əhalinin Arazdan İrana keçməsinə imkan yaratmaq məqsədi ilə ermənilərin hücumunu ləngitmək üçün keçirilən bütün əməliyyatların fəal iştirakçısı olmuşdur. Sonra isə rayon polis bölməsinin tərkibində xidmətini cəbhə xəttində davam etdirmişdir. İşğal olunmuş doğma rayonu, kəndi, didərgin düşmüş el-obasını xatırladıqca Zakirin erməni işğalçılarına qarşı qəzəb və intiqam hissi daha da artırdı. Ona görə də 1993-cü ilin noyabrından Füzuli istiqamətində keçirilən bütün əməliyyatlarda fəal iştirak edirdi. Təcrübəli döyüşçü kimi Zakir kəşfiyyat əməliyyatlarında daha çox olurdu. O, 1994-cü il aprelin 4-də Füzulinin Seyidəhmədli kəndində keçirilən kəşfiyyat əməliyyatlarının birində gözlənilmədən minaya düşmüş və həlak olmuşdur.

Bəli, 26 yaşlı Zakirin gizli məhəbbəti, hüquqi təhsil almaq arzusu və bütün şəxsi istəyi ürəyində qaldı. Ancaq o, vətənin müstəqilliyi uğ-runda həyatını qurban verib, şəhidlik zirvəsinə ucaldı.

Onun Sumqayıtdakı yas mərasimini həyəcansız keçirmək mümkün deyildi. Didərgin düşmüş zəngilanlılar soraqlaşa-soraqlaşa onun dəfn ünvanını güclə tapıb, şəhid balasına son borclarını verməyə gəlmişdilər. Ana-bacıların bayatı və ağıları adamın qəlbini yandırıb-yaxırdı. Ancaq onda təskinlik tapılırdı ki, əbədiyyətə qovuşan başqa şəhidlərimizlə bərabər, Zakir də Vətən uğrunda həlak olmuşdur. Bu isə ən şərəfli ölümdür.

Şair demişkən, Vətən uğrunda ölsə də,insan yaşayır!

Ömrünün 7-ci onilliyini başa vurmaqda olan İsmayıl İbad oğlu təskinlik verənlərə öz minnətdarlığını bildirməklə deyir:

- Valideyn üçün övladdan əziz heç nə yoxdur.Ancaq Vətən ondan daha əzizdir. Ən böyük dərd odur ki, biz doğma yurdumuzdan məhrum olmuşuq. Bizim yaramız o zaman sağala bilər ki, torpaqlarımızı geri alıb, qeyrətsizlik töhmətindən, didərginlik möhnətindən xilas olaq!

Bu, bir milyondan çox didərginin ürək sözü, ən böyük arzu və istəyidir.

**N- 5, 19.05.1994.** «Mənlik» qəzeti

# QURULU MAĞARLAR, AÇILMAMIŞ XONÇALAR...

İsmayıl Abbasovu təkcə yaşadığı Genlik kəndində deyil, bütün Zəngilanda zəhmətkeş bir ailə başçısı, usta əkinçi-mexanizator, xeyirxah adam kimi tanıyırlar. Böyütdüyü yeddi övladı - beş qızı, iki oğlu əmək sevərlikləri, ədəb-ərkanı ilə seçilirlər. Əbəs deməyiblər ki, valideyn üçün fərli övladdan əziz heç nə yoxdur.

1987-ci ildə ailənin yeni qayğıları başlandı. Elçilər bir-bir qapını döyür, sonra isə qızlar gəlin köçürdülər. Hər dəfə də Firuzə ana fərəhlə oğlu Səhyəddinə eyham vurub deyərdi:

- Görəsən, bu nə vaxt bizi kiminsə qapısına göndərəcək?!

Onda hələ Səhyəddinin on səkkiz yaşı vardı. Qarşıda növbəti hərbi xidmət borcu dururdu. O, 1986-cı ildə əsgərliyə çağrılıb hərbi xidmətini Əfqanıstanda keçirməli oldu. 1988-ci ildə Vətənə qayıtdı. Ancaq onun xəyalına belə gəlməzdi ki, relyefi Əfqanıstanı xatırladan Zəngəzur dağ silsiləsi ətəklərində yerləşən doğma Zəngilanda da vuruşmalı olacaqmış...

Səhyəddin ordudan tərxis olunandan sonra Bakıda İnşaat Mühəndisləri Texnikumuna daxil olub oranı bitirsə də, istehsalatda işləməyə macal tapmadı. Çünki erməni təcavüzü gündən-günə şiddətlənirdi. Buna görə də 1992-ci ilin oktyabrında könüllü olaraq milli əsgər libası geyinib, Zəngilan batalyonunda bölmə komandiri kimi fəaliyyətə başladı. «Əfqani» ləqəbi ilə təcrübəli döyüşçü kimi nüfuz qazandı.

Bu dövrdə rayonun bir sıra sərhəd kəndlərində ermənilərin etdikləri hücum əməliyyatlarının qarşısının alınmasında xüsusi fəallıq göstərmişdi.

25 yaşı tamam olmuş Səhyəddin, nəhayət, 1993-cü ilin sonlarında anasına, bacılarına kimin qapısına elçi getmək haqqında da arzusunu bildirdi. Gözü tutduğu qız həmkəndlisi Afət müəllimə idi. Ailələr noyabrda Bakıda birtəhər məskunlaşandan sonra İqtisadiyyat İnstitutunun Dərnəgüldəki yataqxanasındakı bir tələbə otağında yığcam bir nigah məclisi oldu. Bir neçə gündən sonra Səhyəddin yenidən öz batalyonuna - cəbhə xəttinə qayıtdı.

Ailə həyatının fərəhini yenicə duyan gənc üçün bu ayrılıq nə qədər üzüntülü olsa da, Vətənin taleyinin həll olunduğu bu ağır məqamlarda ona dözməyin zəruriliyini Səhyəddin artıq dərindən dərk etmişdi. Çox təəssüf ki, bu ayrılıq əbədi oldu. Bu ilin aprelin onunda Tərtər cəbhəsində Talış kəndi uğrunda gedən gərgin döyüşlərdə Səhyəddin igidliklə həlak oldu.

İndi anası Firuzənin, atası İsmayılın, bacıları Bənövşənin, Töhrənin, Bağdagülün, İrşadın, Məleykənin, toyu yasa dönmüş Afətin və başqa qohum-qonşuların ayaqları Bakı Şəhidlər Xiyabanından üzül-mür. Bura onlar üçün ən müqəddəs and yeri olmuşdur.

Ancaq onlar nə qədər ağlasalar, sızlasalar da bircə ondan təskinlik tapırlar ki, burada uyuyanlar kimi, onların əzizləri Səhyəddin də Vətən uğrunda əbədiyyətə qovuşmuşdu. Bu müqəddəs yeri ziyarət etməyə gələnlərin hamısı kimi, onlar da xiyabanda bircə arzu - şəhidlərin qisasını almaq, işğal edilmiş torpaqlarımızın azad olunması arzusu ilə geri dönürlər.

**N- 9, 05.08.1994.** «Mənlik» qəzeti

## ƏBƏDİYYƏTƏ QOVUŞAN ŞƏHİD NEFTÇİ

Dahilər körpə qığıltısını ən təntənəli himn adlandırmışlar. Bu himn ana laylası, ana oxşaması, ana nazlaması ilə rövnəqlənir. Bu laylaların çalarları ananın övlad haqqındakı arzu və istəkləri ilə köklənir... «Qızıl gülün içində, şirin yuxu tapasan... Tanrı səni saxlasın, çiçəkdən qızılcadan... Tanrıdan əhdim budur, toyunu görüm, bala...».

Zeynəb xanım da öz sonbeşiyi Nazimi bu arzularla böyüdürdü. Çox təəssüf ki, amansız ölüm gənc yaşlarında ananın bu arzusunu gözündə qoydu.

Nazim Bakıxanov qəsəbəsindəki 80 nömrəli orta məktəbi müvəffəqiyyətlə qurtarıb növbəti hərbi xidmətə getdi və ikiillik xidmətini başa vurub Azərbaycan Neft və Kimya İnstitutunun neft-qaz-mə’dən fakültəsinə daxil oldu. Oranı bitirdikdən sonra

1985-ci ildə mühəndis kimi müstəqil fəaliyyətə başladı. O, Suraxanı NQÇİ-də sahə ustası idi. Burada işlədiyi illərdə özünü işgüzar neftçi mühəndis kimi tanıtdı.

Erməni fitnəkarlığı baş qaldırandan sonra bütün Azərbaycan ailələri kimi, bu ailənin də rahatlığı pozuldu. Hər gün cəbhələrdən gələn kədərli xəbərlərə tab gətirməyən ahıllaşmış atanı iflic vurdu. Nazim isə könüllü surətdə orduya getmək inadından dönmürdü. Atasının yataq xəstəsi olduğuna, ailənin ümumi vəziyyətinə görə, onun orduya getməsinə güzəşt düşürdü. Bununla belə, Nazim öz qərarından dönmürdü. Nəhayət, o anadan olduğunun 34-cü ili tamam olandan bircə gün sonra 1993-cü ilin oktyabrın 31-də Sabunçu rayonu könüllü batalyonu tərkibində cəbhəyə getdi.

Onun belə qətiyyətli hərəkət etməsi təsadüfi deyildi. Ata vətəni-Qubadlı, Zəngilan... işğal olunmuşdu. Respublikamıza ermənilərin hücumu davam edirdi. Qeyrət hissi onu rahat buraxmırdı. Bu böhranlı günlərdə respublika prezidentinin çağırışı ona xüsusilə tə’sir etmişdi. Vaxtilə orduda xidmət etmiş, yaxşı hərbi tə’lim görmüş bir adam kimi Vətənin belə ağır günündə cəbhəyə getməməsi onu daim narahat edir. Onu qanuni güzəşt imtiyazından istifadə edib orduya getməyə təhrik edən bə’zi qohumlarına deyərdi:

-Mən dayılarımdan artıq deyiləm ki!

Onun öz dayılarına istinad etməsi də təsadüfi deyildi. Nazimin 4 dayısı 1941-45-ci il müharibəsinin ilk ayında səfərbərliyə alınmışdı. Onların ikisindən «qara kağız» gəlmiş, ikisi isə ağır yara alıb tərxis olunandan sonra həmin yaraların fəsadından vəfat etmişdi. Bu yerdə istər-istəməz ataların bu sözü yada düşür: ər oğul dayısına oxşar...

Bəli, Nazim tərəddüd etmədən Milli Orduya getdi və rota komandiri kimi Ağdam cəbhəsində gedən qızğın döyüşlərdə iştirak etdi. Bu döyüşlərin ən gərgini dekabrın 27-də oldu. Onun rotası nəinki hücumun qarşısını aldı, həm də öz mövqeyini möhkəmləndirib Sofulu, Boyəhmədli, Mollalar və daha 3 yüksəkliyi düşməndən geri aldı.

Bundan daha ağır bir döyüşdə - on saat davam edən bu döyüşdə düşmən geri oturduldu, onun 8 tankı, 1 BMP-si və xeyli canlı

qüvvəsi məhv edildi. Çox təəssüf ki, rota komandiri Nazimin özü də snayper gülləsinin qurbanı oldu...

Bu epizodu mən Sabunçu könüllü batalyonunun şəxsi hey’ət üzrə komandir müavini, Nazimin iş yoldaşı baş leytenant Qələndər Həsənovun dəfn mərasimi zamanı etdiyi çıxışdan qeydə almışam. O, təəssüratında Nazimin komandir kimi hücum və müdafiə əməliyyatlarının hazırlanıb həyata keçirilməsi sahəsində necə səriştə göstərməsi haqqında maraqlı epizodlar da danışdı.

Bu günlərdə əzizləri onun anadan olmasının 35 illiyini Bakıxanov qəsəbəsindəki mağaranın yaxınlığında salınmış şəhidlər xiyabanındakı məzarın başında qeyd etdilər. Bir zamanlar ne’mətlərlə dolu olan süfrə başında, xoş arzu və istəklərlə müşayiət edilən sağlıq tostlarını indi könülləri yandırıb-yaxan ağılar əvəz edirdi: «Bir ayrılıq, bir ölüm, heç biri olmayaydı... Gül əkdim, vay dərdim...»

İsmayılov Nazim Ağakişi oğlunun ömrü bütün şəhidlərimiz kimi, Vətənin müstəqilliyi uğrunda yarımçıq qalan bir ömürdür. Ancaq belə oğullar öz ömürləri ilə ölməzliyə qovuşur, bütün zamanlarda onlara xalqın qəlbində yaşamaq şərəfi nəsib olur.

**N- 28, 07.12.1994.** «İki Sahil»

## KƏNDİN FƏXRİ

Allahverdi yeni anadan olduğu sonuncu oğlunun muştuluq xəbərini qızmar bir gündə tarlada traktor sükanı arxasında aldı. Ata kimi qəlbində xoş duyğular oyandı. O, əvvəllər anadan olan uşaqları üçün nə qədər xoş hisslər keçirmiş olsa da, bu xəbərdən də az sevinmədi. Bu təbii idi. El arasında deyildiyi kimi, son beşik istəkli olar. Cəmil də şən, zirək, üzüyola, ehtiramlı, şirin-şəkər bir bala idi.

İllər keçdikcə o da hiss olunmadan yavaş-yavaş böyüyürdü. Uşaqlıqdan isə atasının mexanizatorluq peşəsinə çox böyük maraq göstərirdi. Sən demə bu, ötəri uşaq marağı deyil, sonralar onun peşəyönümü olacaqmış. Məktəbdə oxuduğu illərdə nəinki

traktorların markalarını yaxşı tanıyırdı, hətta onları idarə etməyi də bacarırdı. Məhz buna görə də 1983-cü ildə orta məktəbi qurtaran kimi kolxozda traktorçu işləməyə başladı. Bir il sonra isə növbəti hərbi xidmətə çağrıldı və ikiillik xidmətini Almaniyada keçirməli oldu.

Cəmil hələ orta məktəbdə oxuyarkən 1941–1945-ci il müharibəsi haqqında az oxuyub eşitməmişdi. Doğulduğu Sarallı Xəştab kəndindən isə 30 nəfər cəbhəyə getmiş, onların isə yarısı geri dönməmişdi. Bu, onun qəlbində müharibəyə qarşı sonsuz bir nifrət doğurmuşdu. Cəmilin heç xəyalına da gəlməzdi ki, o da nə vaxtsa müharibə görə bilər. Bu, dörd il sonra baş verdi.

Cəmil öz yaşının elə bir vaxtında idi ki, gələcək həyat yolunun ilk cizgilərini cızırdı. Lakin 1988-ci ildə başlanmış erməni fitnəkarlığı onu da mülki işdən imtina edib könüllü surətdə Milli Orduya yazılmağa vadar etdi. Həmin gündən başlayaraq kəndin bütün gəncləri ilə bərabər, Zəngilan işğad olunana qədər gecə-gündüz rayonun Ermənistanla sərhəd olan 70-75 kilometrlik ən mürəkkəb relyefli zonasında ermənilərdən müdafiə edən bölmənin tərkibində vuruşmalı oldu. Vaxtilə orduda xidmət edərkən keçdiyi hərbi təlim onu mətinləşdirmişdi. Buna görə də onun cəsarəti bölmədəki yoldaşlarını da döyüşə ruhlandırırdı. Bölmə yoldaşları onu böyük məhəbbətlə sevirdilər.

Rayon işğal olunandan sonra Cəmil dekabr ayında Füzuli rayonu istiqamətində cəbhəyə göndərildi. O, iki ay fasiləsiz burada gedən döyüşlərdə iştirak etdi. Ancaq Əbdülrəhmanlı kəndi uğrunda gedən döyüşlər zamanı 1994-cü ilin yanvarın 26-da ömrünün bahar çağında, arzularının çiçək açmağa, məhəbbətinin qığılcım saçmağa başladığı bir vaxtda düşmən gülləsi onun ömrünü yarımçıq qoydu.

Kalbalıyev Cəmil Allahverdi oğlu Sumqayıt Şəhidlər Xiyabanında bir çox şəhid yaşıdları ilə bərabər əbədi uyumaqdadır. Onun məzarı təkcə qohum-əqrəbanın deyil, bütün sumqayıtlıların ziyarətgahına çevrilmişdir**.**

**N- 21, 21.05.1995.** «Şəhriyar» qəzeti

# NAĞILLAŞAN İLLƏR, ƏFSANƏLƏŞƏN OĞULLAR

***Ötüb getməz tarixlərdən göstərilən böyük hünər,***
***O hünəri öz alnına ulduzlarla yazar göylər!***
**Səməd Vurğun.**

Təqvimdə elə günlər var ki, bizdən dəqiqəbədəqiqə uzaqlaşdığı illərin axarında əlamətdarlığı, həyəcan-iztirabları ilə unudulmazdır. Bunu 1941-ci il 21 iyun, 1945-ci il 9 May günləri timsalında görmək olar.

1941-45-ci il müharibəsində Azərbaycanın 700 min nəfərdən çox oğlu və qızı iştirak etmişdir. Onların 300 mini döyüş meydanlarındaca əbədiyyətə qovuşmuşdur.

1942-ci ildən milli diviziyaların təşkilinə başlandı. Bu dövrdə 223, 416, 402, 77-ci Azərbaycan diviziyaları yaradıldı. Bu, Azərbaycan xalqının öz igidliyini döyüşlərdə nümayiş etdirməsinə imkan verdi. Bu və digər diviziyaların tərkibində döyüşən Azərbaycan vətəndaşlarından 130 nəfər (43 nəfəri azərbaycanlıdı-Ə.S) Sovet İttifaqı Qəhrəmanı adına layiq görüldü. O cümlədən general-mayor H.Aslanova bu ad iki dəfə verildi. On mindən çox döyüşçü isə orden və medallarla təltif edildi.

Bu kütləvi qəhrəmanlığı Azərbaycanın bütün bölgələri ilə bərabər, bizim Zəngilanın da timsalında görmək olar. Bu balaca dağlıq rayonudan cəbhəyə 3 minə yaxın adam getmiş, onun yarısına doğma diyara dönmək nəsib olmamışdır. Sağ qalanların əksəriyyəti isə döyüş şöhrəti rəmzləri olan müxtəlif orden və medallarla geri dönmüşdür.

416-cı «Taqanroq» diviziyasında xidmət etmiş bir sıra zəngilanlıların adı diviziyanın döyüş salnaməsinə əbədi yazılmışdır. Onlardan biri 1386-cı polkun ikinci batalyonunun komandir müavini kapitan İsmayıl Sayılovdur. O, Taqanroq, Melitopol uğrunda gedən döyüşlərdə böyük şücaət göstərmişdir. Əməliyyatların birində isə mühasirəyə düşüb yoldaşları ilə bərabər mərdliklə

döyüşüb həlak olsa da, Melitopolun alınmasına böyük kömək göstərmişdir. O, Qoqol parkının önündə ehtiramla dəfn edilmişdir. Ölümündən sonra isə «Vətən müharibəsi» döyüş ordeninin birinci dərəcəsi ilə təltif olunmuşdur. Döyüş yoldaşları onun qisasını almaq haqqında içdikləri anda Reyxstaq qarşısında açdıqları yaylım atəşi ilə əməl etdiklərini bildirmişlər.

Həmin batalyonun xüsusi şöbəsinin zabiti kapitan Məhəmməd Heydərov iki döyüş ordeni və bir neçə medalla təltif olunmuşdur. Tərxis olunandan sonra rayonda bərpa və quruculuq işlərində diqqətəlayiq təşkilatçılıq göstərmişdir.

Belorusiya partizan dəstələrində xidmət etmiş İslam Qocayev çox uğurlu partizan əməliyyatları aparmaqda dəfələrlə şücaət göstərmişdir. Belorusiya partizan hərəkatının rəhbərlərindən biri Maşerov onun Belorusiya partizan hərəkatındakı fəaliyyətini dönə-dönə razılıq hissi ilə qeyd etmişdir.

Marşal Qavrov isə Vejnəli kəndindən olan Şaban Qocayevin bacarıqlı snayperçi kimi döyüşlərdə 20 faşisti öz silahının patronuna, necə deyərlər, «qonaq» etdiyindən öz çıxışında iftixarla söz açmışdır. Şaban kişi tərxis olunandan sonra Vejnəli Mədən Axtarış Kəşfiyyat İdarəsində çox səmərəli fəaliyyət göstərmişdir.

Respublikamız üzrə «Şöhrət» ordeninin üç dərəcəsi üzrə 25 nəfər təltif olunmuşdu. Onun biri də Müşlan kəndindən olan Vəli Quliyevdir. Bu üç dərəcə «Şöhrət» ordeni almaq Sovet İttifaqı Qəhrəmanı fəxri adına layiq görülməyə bərabər tutulur. Ehtiram əlaməti olaraq Latviyada bir məktəbə onun adının verilməsi də məhz bununla əlaqədardır.

Həmin ordenin iki dərəcəsi üzrə müəllim Nəriman Ağayev, bir dərəcəsi üzrə Vəli Mustafayev, İdris Şıxəliyev, Soltan Qardaşov, Həsən Məmmədov (Ə.S) və başqaları təltif olunmuşlar.

Mincivan qəsəbə gənclərindən biri olan Musa Cəfərov növbəti 3 illik hərbi xidmətini başa vurub tərxis haqqında fərman gözləyirdi. O zaman Dunay sahillərində idi. Ancaq bir yay səhərini müharibənin başlanması xəbəri ilə açdı. 21 yaşlı gənc öz yaşıdları ilə buradan cəbhəyə yollandı. O, topçu batereyası komandiri kimi Berlinədək uzun bir döyüş yolu keçdi, yalnız 1946-cı ildə tərxis

olundu. Döyüş şücaətinə görə «Qırmızı Ulduz», «Qırmızı Əmək Bayrağı», «Vətən müharibəsi» ordenlərinə, habelə bir sıra şəhərlərin azad edilməsinə görə medallara və təşəkkürlərə layiq görülmüşdür. Tərxis olunandan sonra Mincivan dəmir yolunda işləmiş, «Qabaqcıl dəmiryolçu» fəxri adını almışdır. Qəsəbə elektrik şəbəkəsinin rəisi və qəsəbə sovetinin sədri işlərkən xidmətlərinə görə «Şərəf nişanı» ordeni və «Əməkdar igidliyə görə» medalı ilə təltif olunmuşdur. O, qaçqın kimi Bakının Pirşağı qəsəbəsində məskunlaşmış və Vətən itkisi dərdinə dözməyərək 1994-cü ildə dünyasını dəyişmişdir.

Baharlı kəndindən olan Ataş Rəsulov Berlinədək gedən döyüşlərdən «Qızıl Ulduz» ordeni ilə qayıtdı. Hazırda İnşaat Mühəndisləri Universitetinin dosentidir.

Müxtəlif cəbhələrdə fədakarlıqla döyüşən Allahverən Həsənov döyüş şöhrəti ordenləri sırasına Sosialist Əməyi Qəhrəmanı adının rəmzlərini də taxdı.

Məmmədxan Mustafayev texnikumu yenicə bitirib müəllimliyə başlamışdı ki, ilk səfərbərliyə alınanlardan biri oldu. Şiddətli döyüşlərin birində sağ əlindən ağır yara aldı. Məmmədxan öz peşəsindən ayrılmasını heç cür təsəvvür edə bilmirdi. Tərxis olunduqdan sonra özündə qüvvə tapıb sol əllə yazmağı öyrəndi. Hətta sağ əllə yazanlar belə onun hüsnxəttinə heyran qalırdı. O, 52 ildir ki, müəllimlik edir.

Bu gün bütün bunları ona görə xatırlamaq zəruridir ki, bu fonda nankor qonşularımız ermənilər tərəfindən məruz qaldığımız təcavüzün mahiyyətini daha dərindən dərk edək,işğal olunmuş torpaqlarımızın azad edilməsi uğrunda mübarizədə xalqımızın göstərdiyi şücaətdən ilham alıb nümunə götürək.

4-cü ilə qədəm qoyuruq ki, bir sıra rayonlarla bərabər, Zəngilan rayonu da işğal olunmuş, əhali müxtəlif yerlərdə məskunlaşmışdır. Ancaq kimin harada yaşamasından asılı olmayaraq hamı eyni arzu - torpaqlarımızın azad edilməsi və doğma yurda qayıtmaq inamı ilə yaşayır. Rayonun müharibə və əmək veteranları şurası onları öz səylərini dövlətçiliyimizin möhkəmlənməsi yolunda daha da birləşdirməyə, gənclərimizi Azərbaycan Ordusu sı-

ralarında nümunəvi xidmət etməyə, yaşlı nəsillərin döyüş şöhrəti ənənələrindən daim nümunə götürməyə çağırır.

**N-34, 08.05.1997.** «Azərbaycan müəllimi» qəzeti

## ŞUŞA HƏSRƏTİ

Azərbaycanın hər bölgəsinin özünə məxsus gözəlliyi var. Hər bölgə özünün bu və ya digər bir fərqli xüsusiyyəti ilə məşhurdur. Şuşa təbiətinin təkrarsız füsünkarlığı ilə deyil, həm də təməl daşı qoyulduğu gündən burada yaşayıb yaratmış istedadlı şəxsiyyətləri, əyan nəsilləri ilə məşurdur. Şuşanı heç kəsə təqdim etməyə ehtiyac yoxdur. Atalar demişkən, görünən dağa nə bələdci! Ancaq bu yeri özünə mərkəz secənlərin ağıl-kamalına, dünyagörüşünə qibtə etməmək olmur.

Bir necə dəfə, həm də hər fəsildə Şuşada olmuş, Zəngilan rayonlararası qəzetdə redaktor işləyərkən 1964–cü ilin dekabrında isə məzuniyyətimi buradakı sanatoriyada keçirmişəm.

Onun haqqında eşitdiklərim, gəzib gördüklərim məndə elə təəssurat yaratmışdır ki, onları xatırlayarkan ovqatım çox xoş olur. Buna gorə bu xatirələri ömrümə bəzək hesab edir və öz–özümə düşünürəm ki, nə yaxşı Azərbaycanın gözəllik mücəssəməsi olan bu günəşi görüb orada xoş ovqatlı günlər keçirmişəm.

İstirahət evində jurnalist həmkarım «Brilyant məsələsi» romanının müəllifi Cəmşid Əmirovla birgə dincəlməli olduq. O zaman bu detektiv roman kimi çox maraqla oxunurdu. Cəmşid müəllim burada yeni bir roman «Qara Volqa» üzərində işləyirdi. Onun bir sıra fəsillərin burada yazmışdı. Makinadan cıxan bəzi fəsillərini öz xahişi ilə redaktə işində ona kömək etmişdim. Hər dəfə yazılan fəsillər barədə fikir mübadiləsi edərdik.

Boş vaxtlarımızda Şuşanın tarixi yerlərini gəzir, baş verən əhvalatlar haqqında yerli sakinlərdən söhbətlər eşidirdik. Çıdır düzünə gedəndə isə buradan şəhərin ətraf panaramını seyr etməkdən doymazdıq. Burada dəfn olunan Vaqif, Nəvvab kimi şəxsiyyətlərin məzarlarını ziyarət edərdik.

Dekabr ayı olmasına baxmayaraq hava çox mülayim keçirdi. Buna görə hərdən İsa bulağına, Turş suya gedərdik. Hər dəfə keçib gələndə onların vəsfinə aid eşitdiyimiz mahnıları yazanların zövqünə, duyumuna heyran qalırdıq.

Bir dəfə İsa bulağına gedəndə quzu sürüsünə rast gəldik. Cəmşid müəllim quzulardan birini quçağına alıb şəklini çəkməyi xahiş etdi. Mən onun şəklini çəkdim. Cox keyfiyyətli cıxmışdı, şəkli verərkən dedi:

- Mən cox yerdə, müxtəlif formada şəkil çəkdirmişəm. Ancaq belə şəkildən olmaz. Bu şəkil Şuşadan məndə qalan ən dəyərli yadigar olacaqdır. Sonra həmişə sevdiyi bir ifadəni təkrar etdi – Mürsəl müəllimə eşq olsun!

1994-cü ildə didərgin kimi Bakıda məskünlaşdıqdan sonra Cəmşid müəllimin ikinci dəfə çapdan çıxan «Qara Volqa» romanı ilə əlaqədər olaraq rəy yazmaq istərkən Ədəbiyyat arxivinə gedib onun sənədlərinə baxarkən həmin şəkili və birlikdə çəkdirdiyimiz başqa xatirə şəkillərini də görüb mühafizə edilməsinə cox sevindim.

Şəhərin mədəniyyət ocaqlarında keçirilən kütləvi tədbirlərə də gedərdik. İştirak etdiyimiz maraqlı tədbirlərdən biri Üzeyir Hacıbəyovun yubieyinə həsr edilmiş təntənəli yığıncaq oldu. Burada Respublikanın incəsənət xadimlərinin böyük bir dəstəsi iştirak edirdi. Onların arasında «Koroğlu» operasında Nigarı ifa edən Titarenko, bəstəkar Arif Məlikov və adlarını unutduğum başqa incəsənət xadimləri iştirak edirdilər. Həmin tədbirdə çəkdirdiyimiz xatirə şəklini də indiyədək saxlayıram.

Bu gün Şuşada müxtəlif vaxtlarda olduğum zaman, həmçinin Cəmşid müəllimlə keçirdiyim günləri xatırlayanda kövrəlməyə bilmirəm. Şuşada çəkdiyim və çəkdirdiyim şəkillərdən başqa məndə cox qiymətli yadigar da vardır. Bu da «Qara Volqa» cap olunduqdan sonra Şuşada keçirdiyimiz günləri xatırladan bir avtoqrafla mənə göndərdiyikitabın  ilk nüsxəsi idi.

Şuşa cox başı bəlalı şəhərdir. Qarabağın gözü olan bu şəhərdə kimlərin gözü olmamışdır? İran şahının 2 dəfə onun üzərinə coxminlik ordu ilə hücüm etməsi, 1905-1918-20 illərdə baş ver-

miş erməni-müsəlman qırğını v. s. faciələri yaşamış şuşalılar bu faciələrə mərdliklə dözüb öz şəhərlərini qorumağa nail olmuşlar. Ancaq şuşalılar yaşanmış bu faciələrdən daha betər, müqayisə edilməsi mümkün olmayan bir faciə ilə nə vaxtsa üzləşə biləcəklərini heç ehtimal da edə bilməzdilər. Ancaq 1992–ci il mayın 08–09 da tarixi bir gündə – faşizm üzərində qələbə çalındığı bir gündə belə bir faciə baş verdi. Ermənilər Şuşanı işğal edib həmin günü öz qələbə gününə çevirdilər.

Şuşalılar şəhəri tərk edib Lacın–Qubadlı–Akara magistral maşın yolu ilə Horadiz istiqamətinə gedərkən onların köçünə Akarada şahid olmuşam. Bu mənzərə adamı dəhşətə qətirirdi. İstər–istəməz erməni–müsəlman məhəlləsinin xarabalıqları xatirimdə canlandı. Onda Şuşalılar ermənilərə layiq olduqları cəzanı vermişdilər. İndi bu qacqın köçünə baxanda adamın qəlbini müəmmalı bir sual çulğayırdı: necə oldu ki, cox minlik İran ordusunu məğlub edib şahını qətlə yetirən Şuşalılar indi belə faciəyə düçar oldular?

Əlbəttə bu həqiqət cavabını gələcəkdə tapacaq bir sualdır. Ancaq «böyük Ermənistan» xülyacı neçə yüz illərdi ki, erməniləri elə məst etmişdir ki, onlar hər iş görəndə bunu heç zaman unutmurlar. Bunu bir fakt timsalında da da körmək olar.

Şuşa şəhərinin azərbaycanlılar yaşayan məhəlləsinin ərazisi ermənilər (haylar-Ə.S.) yaşayan məhəlləsindən xeyli çoxdur. Lakin müsəlman yaşayan sahədə cəmi bir Məscid, ermənilər (haylar-Ə.S.) yaşayan sahədə isə bir–birindən 350–400 metr məsafədə yerləşən 3 böyük kilsə var. Onun biri xüsusi ilə çox böyük və yüksək arxitektura ilə inşa edilmişdi. Onun həyətində bir neçə qəbir var idi. Biri isə Şuşaya ilk su kəməri çəkmiş erməniyə (haya-Ə.S.) məxsus idi. Ermənilər (haylar-Ə.S.) özlərinin «böyük Ermənistan» ideyasına əsasən belə etmişlər ki, qoy Şuşada erməni nişanəsi daha çox olsun. Bu, onları gələcəkdə buranın qədim erməni (hay-Ə.S.) məskəni olduğunu iddia üçün əsas olsun.

Bu sətirləri yazarkən Şuşalı günlərimin xoş təəssüratı ilə gördüyüm köç faciəsinin təəssüratı sanki üz–zə gəlib toqquşdu. Bir sarsıntı keçirdim ki, elə bil məni ildırım vurdu…

Öz–özümə düşündüm ki, Xudaya niyə belə bir faciə baş verdi, görən bu köç nə vax geri qayıdacaq!?

Elə indi də eyni hissləri keçirir, eyni sual haqqında düşünürəm. Ancaq bu köçun geri dönəcəyi günə olan ümid və inam heç kəsi, heç zaman tərk edə bilməz. Azərbaycanı Şuşasız təsəvvür etmək mümkün olmadığı kimi!

**May 2002-ci il.** «İki Sahil»

## XAN ÇİNAR

***Bizdə təbiətə zülm edənlərin***
***Nə insan duyğusu, nə də haqqı var***
**(S. Vurğun)**

Belə rəvayət edirlər ki, qızmar yay günündə bir karvan səhradan keçməli olur. Nə qədər yol gedirsə, nə suya, nə də bir ağaca rast gəlir. Ancaq karvan sərin su və kölgəlik tapıb dincəlmək ümidi ilə yolunu davam etdirir. Nəhayət, sarvan uzaqda bir ağac görür ki, burada dibindən kəhriz axan çox qocaman bir çinar var. Karvan gərgin səfərdən sonra dayanıb burada yaxşıca dincəlir, sonra zəvvarlar yaradana üz tutub min şükürlər edirlər ki, nə yaxşı onların qarşısına belə bir qalın kölgəli çinar və sərin sulu kəhriz çıxartdı.

Karvan yola düşəndə sarvan çinarların budaqlarından bir dəstə kəsib özü ilə götürür və harada su görürsə, çubuqları orada yerə basdırır. Bu rəvayət istər–istəməz S. Vurğunun həmişəyaşar misralarını xatırladır:

***Qoca çinar! Bir sığallan kəhriz başında,...***
***Göy çəmənə xalı kimi öz kölgəni sər!***
***Təbiətin çiçək açmış bahar yaşında***
***Qoy hüsnünə salam versin müqəddəs səhər.***

Bu gün Azərbaycanın müxtəlif rayonlarında rast gəldiyimiz çoxömürlü tək və qoşa çinarlar bəlkə də, rəvayətdəki sarvanın yadigarlarıdır. Zəngilanın Bəsitçay vadisində mövcud olan 117 hektarlıq Rəzdərə təbii çinarlığı isə təbiətin əsl möcüzəsidir.

Öz mənbələrini Zəngəzur dağlarından götürən Bəsitçayının sahilləri boyu sıralanan minlərlə qamətli çinarlara baxarkən, adam bu gözəllikdən aldığı zövqü vəsf etməyə söz tapmır. Onu gərək özün gözlərinlə görüb, varlığınla duyasan. Burada elə nəhəng çinarlar var ki, gövdəsinə, necə deyərlər, örkən dolaşmaz, boynuna sicim çatmaz. Çətiri altında isə böyük bir qoyun sürüsü yatar.

Baharda çinar yarpaqlarının pıçıltısı, çayın zümzüməsi, meşə quşlarının çıxartdığı səslər birləşib elə bir simfoniya yaradır ki, təbiətin möcüzəsinə heyran qalmaya bilmirsən.

Bəsitçayı daşanda qocaman çinarlar daşqının qarşısında mərdliklə dayanırlar. Ancaq yeni bitən pöhrələr üçün bu çox qorxulu olur. Təbiətin möcüzəsinə bax ki, sel nə qədər ziyan versə də çinar özü–özünü bərpa edir, yeni–yeni kollar bitirib, şaxələnir. Əgər sel ağacı kökündən çıxarıb yıxsa belə, həmin kökdən onlarla yeni–yeni cavan çinarlar bitir.

Təbiətin özünün bərpa qanunu bu çinarlıqda özünü xüsusilə nəzərə çapdırır. Məhz bunun nəticəsidir ki, bu təbii çinarlığın nə yaşı bilinir, nə də sahəsi kiçilir. Təsadüfi deyil ki, bura dünyada iknici, Avropada isə birinci təbii çinarlıq kimi dünya nəbatatı kitabına daxil edilmişdir.

Payızda yarpaqları qızıla çalan çinarların aldığı görkəm daha füsünkardır. Vadinin sol sahilindəki meşələrdə alça, armud, alma, fındıq, qoz, qaragilə, yemişan, qarağat, itburnu, böyürtkən və başqa giləmeyvələr yetişir. Bunların hər biri neçə-neçə dərdin dərmanıdır.

Adamlar itirdikləri şeylərin qədrini sonradan daha dərindən dərk edir, ürək sızıltısı ilə yanıb–yaxılırlar. Bizim kimi. İndi təbiətin bu möcüzəsi haqqında danışdığımız xəyala çevrilib. Bir ildir ki, bu yerlər nankor qonşularımızın işğalı altındadır. Ayrılığına bircə gün dözmədiyimiz yerlərdən indi aylarala, illərlə ayrılası olmuşuq. Xanın səsi, Qarabağın şikəstəsi havalanan qocaman

çinarların gölgəsində indi kim bilir erməni dığaları nə oyunlar çıxarırlar. Əsrin keşməkeşlərini görən bu xan çinarlar bu bir ildə, görəsən, daha nələrə şahid olublar. Bəlkə də, onların bir çoxu düşmən baltasının qurbanı olub. Neçə–neçə ceyran, cüyür, çöl qabanı, meşənin bəzəyi qırqovul dığa gülləsinə düçar olub, əti elə buradaca şişə çəkilib.

Bütün bunları xatırladıqca adamın bağrının başına elə bil köz yapışır. Qəzəbdən, həsrətdən az qalır ürəyi döyünməkdən qalsın.

Birillik işğal müddətində onu görmək həsrəti ilə neçə–neçə zəngilanlı öz dünyasını dəyişib, kim bilir, hələ neçəsi də bu həsrətlə əbədiyyətə qovuşacaqdır. Bununla belə, zəngilanlılar təbiətin bu nadir incisini görmək, necə deyərlər, onun torpağına üz qoymaq ümidini heç vaxt itirmirlər. Ekoloji baxımdan bura respublikamızın əvəzsiz sərvətidir. Heç şübhəsiz, əzəli Azərbaycanın olan bu diyar əbədi də Azərbaycanın olacaqdır. Ancaq onun təbiətinə, erməni işğalçılarının vurduğu ziyanı beynəlxalq təşkilatların diqqətinə çatdırmaq üçün ekoloji mütəxəssislərimiz daima həyəcan təbilin çalmalıdır.

**27 dekabr 1994-cü il.** «Ekologiya» qəzeti

## XİDMƏT PİLLƏLƏRİ, SINAQ İLLƏRİ

**Nəzir Kərimovdan**

Yollar hamar olmur. Onun sərt yoxuşu da olur, enişi də. Yoxuşdan çıxmaq adamdan dözüm, inad və qüvvət tələb edir. Enişdən isə gərək təmkinli olub müvazinətini saxlamağı bacarasan. Ömür yolları da belədir. İnsan illərin min cür sınağından, qınağından keçməli olur. Ömür zirvəsinə alnı açıq, üzü ağ çıxmaq üçün gərək bu sınaqlara dözəsən. Ucalanda coşub, aşağı düşəndə çaşmayasan. Təsadüfi deyil ki, ata–babalarımız ağsaqqallıq haqqında saysız–hesabsız hikmətlər, ibrətamiz rəvayətlər söyləmişlər.

Nəsillərin estafetinin ötürücüsü kimi ahıllarımızın müdrikliyinə həmişə ehtiyac olubdur, var və olacaqdır. Buna görədir ki, ehtiram rəmzi kimi YUNESKO əsrimizin sonuncu ilini Bey-

nəlxalq ahıllar ili e'lan etmişdir. Axı onların keçdiyi ömür yolu nəsillər üçün çox ibrətamizdir.

Yeni açdığımız bu rubrikada ilk söhbət rayonumuzun belə ahıllarından biri haqqındadır.

Əsrimizin ikinci on illiyinin sonunda ucqar bir dağ kəndində, sadə bir əkinçi ailəsində dünyaya göz açmış, pioner drujina rəhbərindən, komsomol katibliyindən RİK–in ikinci katibliyinə, RİK sədrliyinə, sonra isə RİK–in birinci katibi vəzifəsinə yüksəlmiş, Azərbaycan AS–nə deputat seçilmiş, yarım əsrə qədər əmək yolu keçmiş, 70 yaşlı möhtərəm bir ahılımızdan söhbət açmağı özümə mə'nəvi bir borc hesab edirəm.

Doğrudur, ictimai quruluşun dəyişməsi ilə əlaqədar olaraq özünü «demokrat» kimi qələmə verən bə'zi çılğınlar belələrinə «partokrat», «avtoritar» kimi ayamalar verməklə gördükləri geniş miqyaslı işləri az qala heçə endirib onlara ağız da büzürlər. Ancaq bunu nəzərə almaq istəmirlər ki, bu gün malik olduğumuz potensialı yaratmaqda onların nə qədər böyük əməyi olmuşdur!

Belə adamlardan söhbət açmaq indi dəbdə olmasa da, ədalət naminə onların haqqını danmaq böyük insafsızlıq, keçmişinə dönüklük olardı.

Əmək yoluna eyham vurduğum ahılımızın hələ adını çəkməsəm də, çoxlarınız onun kim olduğunu yəqin ki, eyninizə gətirdiniz.

Bir jurnalist kimi onun bütün xidmət pillələrini diqqətlə izləyib fəaliyyətinin şahidi olmuşam. Həmin illərə indi xəyalən nəzər salanda Nazir Kərimovun rayon əhalisi arasında qazandığı ehtiramın səbəbini dolğunluğu ilə bir daha yenidən dərk edirəm.

Nazir Qibləli oğlu Ali partiya məktəbini qurtardıqda əvvəlcə RİK–in şö'bə müdiri, sonra ikinci katibi vəzifəsinə tə'yin ediləndə ictimaiyyət onun gələcəkdə rayonun işgüzar kadrlarından biri olacağına dərindən inanırdı.

1962–ci ildə (1963-Ə. S) Zəngilan və Qubadlı rayonları bir istehsal idarəsində birləşəndə onun RİK sədri tə'yin olunması bu inamı doğrultdu. İdarəetmə işlərinin, həll edilməli olan problemlərin miqyası, qarşıya çıxan bir çox çətinliklər İcraiyyə Komitə-

sindən gərgin fəaliyyət tələb edirdi. Rayonların ayrılmasına qədər davam edən üçillik bu gərgin dövr RİK sədri kimi N. Kərimova əsl sınaq oldu. O, bu sınaqda təşkilatçılıq qabiliyyətini bacarıqla nümayiş etdirə bildi.

1965–ci ilin sonunda istehsal idarəsi ləğv olunduqdan sonra rayonun həyatı ilə daha çox məşğul olmaq imkanı tapdı. O, əllinci illərdə hazırlanmış gen planını nəzərdən keçirib ona tikilməsi zəruri olan bir sıra yeni obyektlər saldırdı, kəndlərə gedən yolları abadlaşdırmaq, avtobus marşrutları açdırmaq, rayon mərkəzində Oxçu çayının üstündən körpü saldırmaq üçün tədbirlər həyata keçirməyə başladı və bunların bir çoxunun 3–4 il müddətində icra olunmasını təşkil etdi.

Onun bu dövrdə ən yadda qalan xidmətlərindən biri rayon mərkəzinə 1967–ci ilin sentyabrında şəhər statusu verilməsinə nail olmasıdır. Bu, şəhərin inkişaf etdirilməsi üçün respublika büdcəsindən daha çox vəsait, maddi ehtiyatlar ayrılmasına, yeni tikinti idarələri təşkil olunmasına imkan verdi.

Bəs Dağ üstü park! Bunu N. Kərimovun mədəni quruculuq işində, necə deyərlər, şah əsəri adlandırmaq olar. 27 hektarlıq sahədə təpələr hamarlanıb geniş əyləncə meydançasına çevrilmiş, yamaclarda kilometrlərlə terraslar çəkilib, yüz minlərlə meyvə, həmişəyaşıl bəzək ağacları, gül kolları əkilmiş, 5–6 kilometrlik su kəməri çəkilmişdir.

Parkın salındığı altmışıncı illəri xatırlayarkən adam öz–özünə düşünür: iqtisadi cəhətdən zəif, saysız–hesabsız iqtisadi qayğıları olan dağlıq bir rayonda dəmiyə yamaclarda, təpələrdə belə bir park salmaq onun xəyalına necə gəlmişdi?!

Bax təşəbbüskarlıq, yaradıcı, qurucu gələcəyi görmək buna deyərlər!

Kərimov el-obanın kütləvi məişət mərasimlərində, xüsusən yaslarda müntəzəm iştirak edərdi. 1960–cı illərdə qəsəbə qəbiristanlığının dözülməz vəziyyəti onu necə narahat etdiyinə dəfələrlə şahid olmuşam. Bura mal-qaranın otlağına çevrilmişdi.

Yaxşı xatırlayıram, bir gün nüfuzlu ağsaqqalların bir dəstəsini və qəsəbə sovetini, kommunal təsərrüfat şö'bəsinin rəhbərlə-

rini yanına çağırıb qəbiristanlığın abad edilməsi haqqında fikir mübadiləsi etdi. Bu təşəbbüs çox razılıqla qarşılandı, müzakirədə iştirak edənlər öz məsləhətlərini verdilər. Müzakirədən sonra qəbiristanlıq üçün 2 hektar yeni sahə ayırdı. Onu mişar daşı ilə barıya almaq, bura su kəməri çəkmək, daimi gözətçi təyin etmək və s. tədbirlər müəyyənləşdirildi. Qəsəbə sakinlərinin köməyi ilə tezliklə bu işlərin görülməsinə başlandı. 2–3 il ərzində elə sözün həqiqi mə’nasında bura əsil ziyarətgaha çevrildi. Dəfnə, öz mərhumlarını ziyarətə gələnlər birinci növbədə bu abadlaşdırmanın təşəbbüskarı N. Kərimova xoş arzularla dua edirdilər. Doğrudan da, o savab işi görmüşdü. Camaat çox razılıq hissilə deyirdi ki, əgər heç bir iş görmüş olmasa belə, təkcə bu işə görə o, el ehtiramına layiqdir.

1968-ci ildə N. Kərimovun birinci katib seçilməsi rayon sakinlərinin ürəyindən oldu. Rayonun həyatında həmin vəzifədə seçilmiş ikinci yerli adam idi.

Bu etimadı doğrultmaq üçün yeni vəzifə pilləsində on il gərgin fəaliyyət göstərməli oldu.

Pambıqçılıqdan imtina edilib tütünçülük və üzümçülük üzrə ixtisaslaşma aparıldı. Heyvandarlığı, baramaçılığı, yemçiliyi inkişaf etdirmək üçün bir sıra tədbirlər görüldü. Abadlıq, tikinti işləri daha geniş vüsət aldı. Müasir tələblərə uyğun neçə–neçə orta məktəb, uşaq bağçaları, kənd xəstəxanaları, iaşə, ticarət müəssisələri, rayon mərkəzində univermaq, ikimərtəbəli ticarət mərkəzi, maddi–material bazaları tikildi. Bəsit çaydan şəhərə əlavə su kəməri çəkildi. Hər biri 20–30 min tonluq 2 üzüm e’malı, milyon şərti bankalıq konserv, sutkalıq gücü 35 tonluq çörək zavodları, heyvandarlıq kompleksi, nümunəvi ferma şəhərcikləri, Bartaz kəndində hidroqurğu, dolu əleyhinə mübarizə stansiyası və bir çox obyektlər onun təşəbbüskarlığı ilə inşa edildi.

«Ağ oyuq» deyilən böyük düzə Həkəri çayından su çıxarmaq rayon əməkçilərinin əsrlərdən bəri ən böyük arzusu olmuşdur. Hər il bu məsələ respublika rəhbərliyi qarşısında qaldırılırdı. Təəssüf ki, bu cəhdlər ittifaq büdcəsindən vəsait almaq mümkün olmaması səbəbi ilə öz həllini tapmırdı.

Bu arzunun reallaşması üçün N. Kərimovun nə qədər gərgin əmək sərf etdiyinin şahidi olanlar yəqin ki, xatırlayırlar. O, vəzifə imkanlarından, deputatlıq hüququndan istifadə edərək illərlə səlahiyyətli orqanlarda, necə deyərlər, açmamış qapı qoymadı. Nəhayət, hidrokompleksin tikintisinin 1976–80–ci ilin planına salınmasına nail oldu.

3200 hektar dəmiyə torpağı suvarmaq üçün nəzərdə tutulan bu hidro–kompleks rayonun iqtisadiyyatını əsaslı surətdə yüksəltməyə imkan verəcək bir tədbir idi. Müqayisə üçün xatırladım ki, həmin illərdə rayonun bütün suvarılan torpağının sahəsi cəmi 2500 hektar olmuşdur.

Rayon əməkçilərinin çox əsrlik arzusunun reallaşdırılması bununla əlaqədar olaraq şəhərin şimal–qərbində melioratorlar üçün mikrorayon, Yazı düzündə hər cür sosial xidmət obyektləri olan 1500 nəfərlik üzümçülər qəsəbəsi salınması N. Kərimovun müstəsna xidmətlərindən biri idi.

Əlbəttə, bütün bü tədbirləri rayon əməkçilərinin gücü ilə həyata keçirirdi. Atalar çox yerində demişdir ki, yüz vuranla bir vur deyən bərabərdir. Ancaq «vur» deməyə də gərək adamda ağıl, təpər, qətiyyət və qabiliyyət ola!

Çoxlarımız rəhbər işlərdə çalışmış adamların vəzifədən çıxandan sonra camaat arasında mövqeyinə şahid olmuşuq. Elə adamlar görmüşük ki, onun vəzifədəki «hörmətindən» əsər–əlamət qalmır. Elələri də olur ki, əksinə, camaat ona vəzifədə olduğundan artıq ehtiram bəsləyir. Nazir müəllim kimi 1979–cu ilin sonunda birinci katiblikdən çıxandan indiyə kimi 19 ildir ki, rayon maliyyə şöbəsinin müdiri işləyir, ancaq elə əvvəlki ağsaqqallığa layiq nüfuzunu saxlamaqdadır.

Min təəssüflər olsun ki, illərdən bəri həvəslə qurub yaratdıqları ona sevinc mənbəyi əvəzinə göz dağına çevrilmişdir. Doğma yurdun 1993–cü ilin oktyabrından düşmən tapdağı altında tarmar olmasını xəyalına gətirəndə rayonun bütün sakinləri kimi onun da qəlbi, necə deyərlər, soğan kimi soyulur, üstünə duz basılmış yara kimi göynəyir.

Ancaq inanır ki, su gələn arxdan bir də gələr, rayon gec–tez işğaldan azad ediləcək, bütün bu dağıntıları bərpa edən oğullar tapılacaqdır. Hələlik isə ondan təsəlli tapır ki, ahıllığı üçün eldən hörmət və inam qazanmışdır.

Buna görə rayonun sakinləri adından biz də ona deyirik:

– Nazir müəllim, mübarək ahıllığın uğurlu, imanın kamil və nurlu, arzuların isə çin olsun!

**Yanvar 1999-cu il.** «Zəngilanın səsi»

## Xatirələr Ömrə Bəzək...

Bəxtiyarlı illəri onsuz keçiləcək illər əvəz etməkdədir. Hələlik isə bu ilk ilin 40 günlük təziyə günləridir. Bu görkəmli sənətkarımız xalqımıza elə zəngin bir əbədi irs qoymuşdur ki, onu şərh etmək üçün neçə - neçə elmi əsərlər yazılmalı olacaqdır. Rəsmi, qeyri-rəsmi, lap elə ötəri görüşlər belə adamların qəlbində elə unudulmaz xatirələrə dönüb ki, həmişə kövrəkliklə, ehtiramla xatırlanacaqdır. Bax bu gün mən xatırladığım kimi...

Bəxtiyar müəllimlə təxminən bir il fərqlə həmyaşıdıq. Ali təhsil illərimiz də eyni dövrə düşmüşdür. Mən APU- nun dil - ədəbiyyat, Bəxtiyar isə ADU-nun filologiya fakültəsində (1944-1948-ci illər) təhsil almışıq. Nədənsə görüşüb tanış olmaq mənə nəsib olmamışdır. Ancaq bizimlə oxuyan Qabil həmyaşıdı olan poeziya həvəskarlarının qəzetlərdə dərc olunan şeirləri ilə bizi tanış edərdi. Bəxtiyar müəllimin şeirləri haqqında ilk təəssüratı da ondan almışdım.

Ali təhsilimizi başa vurduqdan sonra hərəmiz bir yerə işləməyə getdik. Mən Qubadlı rayonunun Qubadlı orta məktəbinə təyinat almışdım.

1955-ci ildən sonra isə məni RPK-də ideoloji şöbəyə, sonra isə rayon qəzetinin redaktoru vəzifəsinə irəli çəkdilər. Beləliklə, jurnalist fəaliyyəti ilə əlaqədar olaraq müəyyən vaxtlarda Bakıya ezamiyyətə gələrdim. Bu zaman «Gənc şairlərin kitabxanası» rubrikası adı altında kitablar nəşr edilirdi. Mən bu seriyadan olan kitabların birində «Göz yaşları» adlı bir şeir oxudum. Şeir Ba-

bayev Cavanşir adlı bir həkimə ithaf olunmuşdu. Bu ad- soyad mənə çox tanış gəldi. Sonra öz-özümə düşündüm ki, axı belə uyğunluqlar az olmur. Ancaq telefonla danışıb öyrəndikdən sonra gördüm ki, zənnimdə yanılmamışam.

Həkimi bacanaq kimi 1950-ci ildən tanıyırdım.

1914-cü ildə Karyagində anadan olmuş, 1938-ci ildə Tibb İnstitutunu bitirmiş, üç il Naxçıvanda həkim işləmişdir, 1941-ci ildə hərbi həkim kimi ordu sıralarında İrana göndərilmişdir. Bir müddətdən sonra Mərdəkan hərbi xəstəxanasına baş həkim təyin olunmuşdur.

Müharibədən sonra Fuad Əfəndiyev adma 4 nömrəli xəstəxanada işləmişdir. Tibb elmləri doktoru M. Nəzirovun elmi rəhbərliyi ilə «Brüsselyoz və onun qlinikası» mövzusunda dissertasiya müdafiə edib, alimlik dərəcəsi almışdır. Respublika xəstəxanasında işləməklə bərabər Ə.Əliyev adma Tropik Təbabət İnstitutunda tibbi - pedaqoji fəaliyyət göstərmişdir. Təkcə Azərbaycan həkimləri deyil, müttəfiq respublikaların bir çox həkimləri öz ixtisaslarını burada artırırdı.

Cavanşir Babayev yarım əsrə qədər respublikada xalq səhiyyəsinin inkişafına fədakarcasma xidmət etmişdir.

Bəxtiyar müəllimin həkimlə tanışlığının hansı təsadüfün nəticəsində baş verdiyini bilmirəm. Ancaq buna şahidəm ki, həkim onun şeirlərinə əllinci illərdən pərəstiş edirdi. Bəxtiyar müəllim isə ona təkcə yaxşı həkim kimi deyil, həm də milli qürurlu, geniş dünyagörüşlü, sağlam məişətli, yüksək mənəviyyatlı, ədəbiyyata çox maraqlı işıqlı bir ziyalı kimi ehtiram bəsləyirdi. «Şah və bülbül» əfsanəsi əsasında həkimə ithaf etdiyi «Göz yaşları» şeirində bu rəğbət öz əksini tapmışdır.

Füzulinin anadan olması yubileyi ilə əlaqədar olaraq yazdığı «Şəbi Hicran» poeması dərc olunan kitaba yazdığı avtoqraf da bu rəğbətə konkret nümunə ola bilər. «Bu əsərin yaradılmasında mənə qardaşlıq köməyi göstərən əziz dostum, həmkarım, sirdaşım, istinadgahım Cavanşirə - müəllifdən» Bəxtiyar 8 yanvar 1960-cı il.

1961-cı ilin ilk ayları idi. Bakıya ezamiyyətə gəlmişdim. Həkimə təzə ev verilmişdi. Yeni evə köçməyə mən də kömək etməli

oldum. Şeyləri bir Volqa maşını ilə daşıyırdıq. Öyrəndim ki, bu maşın Bəxtiyar müəllimin şəxsi maşınıdır. Köməyə göndərmişdi. Həkimə gözlədiyi vaxtdan çox tez ev verilməsinin tarixçəsi ilə maraqlandım. Bu işdə Bəxtiyar müəllimin də köməyi az olmamışdır. Onlar müxtəlif məsələlərə dair çox söhbət etdilər. Onların müsahibələrini diqqətlə dinləyirdim. Söhbətlərindən çox aydın nəzərə çarpırdı ki, onlar bir - birinə necə ehtiram bəsləyir və fikirləri necə üst - üstə düşürdü. Jurnalist marağı ilə onların bu söhbət məqamını fotokameramın lentinə köçürdüm. Ancaq xəyalıma gəlməzdi ki, bir zaman Cavanşir həkim Bəxtiyar müəllimin hansı bir əsərininsə baş qəhrəmanının prototipi olacaqmış! Bu şəkil isə şairin yaratdığı obrazla görüş məqamını xatırlatmağa imkan verən qiymətli yadigara çeviriləcəkdir.

«Şəbu Hicran» dan sonra B.Vahabzadənin yazdığı irihəcmli “Etiraf” poemasını oxucular çox böyük maraqla qarşıladılar. Mən poemanı oxuyarkən istər-istəməz Bəxtiyar müəllimlə həkimin görüşünü və bu məqamda çəkdiyim şəkli xatırladım. Çünki poemadakı Cahangir surətinin bütün mənəvi keyfiyyətləri həkim Cavanşiri xatırladırdı.

Mən Bakıya ezamiyyətə gələrkən həkimdə Bəxtiyar müəllimin üstündə «Əziz dostum, qardaşım Cavanşirə- «Etirafın qəhrəmanı Cahangirə» Bəxtiyar 10 iyun 1962. avtoqraf yazdığı kitabını görəndə zənnimdə yanılmadığıma sevindim. Bəli, şair həkim Cavanşir Babayevin prototipi nümunəsində öz yüksək mənəviyyatı, xeyirxah, səmimi etiraf hərəkəti ilə təkəbbürlü, eqoist Bahadur kimi prokuroru alçaldıb onu doğru yola dəvət etməyə nail olan Cahangir kimi ümumiləşdirilmiş ibrətamiz bir obraz yaratmışdır. Elə bir obraz ki, bütün dövr üçün o, mənəvi tərbiyə nümunəsi olacaqdır.

İlk şəxsi görüşdən sonra Bəxtiyar müəllimin yaradıcılığına marağım daha da artdı. Onu nəinki müntəzəm oxuyur, təbliğ edir, hətta evdə ailə kitabxanamıza çap olunan şeirləri, kitablan, məqalələrindən ibarət xeyli nüsxələr toplamağa nail olmuş və bunu davam etdirirdim.

Rayonda işləyib yaşadığım üçün Bəxtiyar müəllimlə görüşməyə heç də məqam düşmürdü. 1975-ci ildə həkim C.Babayevin Tibb İnstitutunu bitirib Türkmənistana— Nebitdağa əczaçı

işləməyə getmiş oğlu Eldar avtomobil qəzasında həlak olmuşdu. Təzə evlənmiş və bir qızı olan oğlunun ölümü həkimə çox ağır dərd idi.

Oğlunun arvadı Sürəyya xanımın faciəli həyatı həkimin, necə deyərlər, dərdi üstünə dərd gətirmişdi. Sürəyya Cənubi Azərbaycanda 22 dekabr Milli Azadlıq hərəkatının fəal iştirakçılarından biri olan Allahverdi Ərqəvaninin qızı idi. O həbs edilib dar ağacından asılmış, arvadı isə 1947-ci ildə körpə qızı Sürəyyanı götürüb Bakıya- qohumlarının yanma qaçmışdır. Burada vəfat etdiyi üçün qızı da yetim qalmışdır. Ancaq sonra da qohumlarının köməyilə oxuyub Azərbaycan Tibb İnstitutunun farmakologiya fakültəsini qurtarmışdır.

Həkim, sözün əsil mənasında, ata kimi onun xoşbəxt olmağı üçün böyük himayədarlıq göstərirdi.

Oğlunun faciəli vəfatı onu nə qədər qüssələndirmişdirsə, gənc gəlinin taleyi də o qədər kədərləndirmişdir. Necə deyərlər, elə bil onun sinəsinə iki dağ çəkilmişdi.

Bəxtiyar müəllimlə sonrakı görüşlərim «Etiraf’ poemasının qəhrəmanı Cahangirin prototipi həkim Cavanşir Babayevin oğlunun bu ağır təziyə günlərində olmuşdur. İmkan tapan kimi həyat yoldaşı Dilarə xanımla birlikdə təziyə günlərində gəlib öz dostunun bu ağır dərdinə şərik olduğun bildirir, ona təskinlik verirdi.

Bəxtiyar müəllimlə rayonda görüş keçirmək arzusu məni heç vaxt tərk etmirdi.

1975-ci ilin oktyabrın 15-də tanınmış aktyor Həsənağa Salayevin rəhbərliyi ilə bir qrup incəsənət xadimi Zəngilana qastrola gəlmişdir. İlk tamaşadan sonra H.Salayevdə ürək çatışmazlığı baş vermişdir. Onu mehmanxananın xüsusi qonaq otağında müayinə edirdilər. Həkim Cavanşir mənə zəng vurub Həsənağanın vəziyyəti ilə maraqlandı. Onun müalicəsi ilə həkimlərin çox səylə məşğul olduqlarını bildirdim. Mənə dedi ki, Bəxtiyar müəllim onu yoluxmağa gələcəkdir. Maşınla gəlməyə razı olmadım, çünki sizin yollara bələdəm, ona görə Bakı - Naxçıvan qatarı ilə Mincivana gəlməyi məsləhət gördüm. Qatarda onu qarşılayarsan. Qatar stansiyaya gecə saat 4-də gəlirdi. Bəxtiyar müəllimi onunla birlikdə gəlmiş dostlarından biri olan Yaşar Əliyevlə evə gətirdim. Bir az

yatıb dincələndən və səhər yeməyindən sonra onları H.Salayevin xəstə yatdığı mehmanxanaya apardım. Onların görüşü çox kövrəldici idi. Onları, necə deyərlər, qəhər boğurdu.

Mən RPK-nın 1-ci katibi, RİK sədrini tapıb Bəxtiyar müəllimin gəlişini xəbər vermək, həm də bundan istifadə edib onun rayon fəalları ilə görüşünü keçirmək arzusunda idim.

Rayon mərkəzindən keçən Oxçu çayının üstündə yeni salınmış körpünün yanında təzə tikilmiş ictimai - iaşə pavilyonunda günorta yeməyi zamanı xeyli söhbət etdik. RPK-in sədri Q.Quliyev, RPK- nin 2 -ci katibi A.Kərimov, RPK-nin şöbə müdiri M.Cəfərov, redaktor müavini N.Bəxtiyarov, redaksiyada şöbə müdiri işləyən A.Ağayevlə birlikdə Bəxtiyar müəllimi və onun dostu Yaşar Əliyevlə xatirə şəklini çəkdik. Sonra bu şəklin surətini rayon muzeyində «Rayonun qonaqları» rubrikası altında açılmış guşədə nümayiş etdirməyə verdik. Şəkildə məndə saxlanılan nüsxəsini görürsünüz.

Rayonda görüş keçirmək arzumuz isə baş tutmadı. Çünki Bəxtiyar müəllimin Ağdamda şəxsi işləri var imiş. Onu çox ehtiramla, xoş arzularla yola saldıq. Bizə isə bu görüşdən xoş bir təəssürat qaldı, onu indi də kövrəkliklə xatırlayıram.

Bəxtiyar müəllimin yaradıcılıq yolunda müqavimətlərə də az rast gəlməmişdir. Azərbaycanın Rusiyaya ilhaq edilməsinin 150 illiyinin qeyd edilməsi ərəfəsində onun «Gülüstan» poeması az qala bomba kimi səslənmişdir. Bu, Bəxtiyarı millətçi hesab edən bəzilərinin əlində onu ləkələmək amilinə dönmüşdür. Həmin dövrdə Bəxtiyarı sevənlər təşviş keçirir, repressiya edilməsindən ehtiyat edirdilər. Ancaq xoşbəxtlikdən böyük sənətkar ictimai xadim kimi respublikanın yüksək vəzifəli xadimləri tərəfindən, xüsusən H.Əliyev tərəfindən müdafiə edildi. Bu barədə Bəxtiyar müəllim özünün bir sıra müsahibələrində geniş danışmışdır. Sonralar yazdığı «Leninlə söhbət», «Muğam» poemaları bir sıra səhnə əsərləri ilə öz sənətkarlıq məharətini göstərdiyi üçün dövlət mükafatına —yüksək dərəcəli ordenə layiq görüldü.

Qorbaçovun yenidənqurma islahatları ilə əlaqədar olaraq başlanmış qarma - qarışıqlıq ermənilərin Qarabağ iddiaları ilə əlaqədar olaraq necə gərgin hadisələr baş verdiyini o günləri yaşayanlar

indi də yaxşı xatırlayırlar. Başlanmış özbaşınalıq camaatı sarsıntılı vəziyyətə salmışdı. Bu böhranlı vaxtda həkimin işdən əsassız olaraq çıxarılması, habelə ermənilərin (hay-Ə.S) təcavüzkarlığı həkimi xeyli sarsıtmış və onu infarkt dərəcəsinə çatdırmışdır. 1988-ci il fevralın 21-də həkim dünyasını dəyişdi. «Etiraf' poemasının baş qəhrəmanı Cahangirin prototipi Cavanşir Babayevin vəfatı Bəxtiyar müəllimə son dərəcə ağır təsir göstərdi.

Axı həkim Cavanşir Babayev onun «Etiraf' poemasının xəyali obrazı deyil, ideal dostu, həmfıkri, alim - təbib, milli qeyrətli bir şəxsiyyət idi.

Ancaq şair kimi bundan təskinlik tapmaq haqqı qazanmışdır ki, mənəvi cəhətdən dostluğa layiq olan bir şəxsiyyətin həmişəyaşar ədəbi - bədii obrazını yarada bilmişdi.

Həkimin vəfat etdiyi günlərdə Bəxtiyar müəllim çox gərgin təziyə günlərində iştirak edir və onun ailəsinə təskinlik verirdi.

Təziyə günlərində hər görüşümüz mənim ona qarşı ehtiram hissimi daim artırırdı.

Nəhayət, 1993-cü il oktyabrın 26-da Moskva radiosu Zəngilanın danışıqsız olaraq Ermənistana təslim olması haqqında notası səsləndirildi. Bu xəbər əhalinin ümidinin itməsinə səbəb olmaya bilməzdi. Xocalı kimi faciəyə düçar olmaması üçün əhali Arazdan görünməmiş bir əzabla keçib oradan İmişli zonasına Azərbaycana keçmək zərurəti qarşısında qaldılar. Beləliklə, 1993-cü ilin oktyabrın 30-da Zəngilan işğal olundu.

Bakıda məskunlaşandan sonra 1993-cü ilin dekabr ayında Fəxri xiyabana baxmağa gedən zaman Bəxtiyar müəllimi burada tikilməkdə olan məscidin yanında gördüm. Mənim vəziyyətim haqqında çox sorğu - sual etdi. Müvəqqəti olaraq həkim Cavanşir Babayevin evində məskunlaşdığım üçün xoşhal oldu. O, həkimin ailəsinin vəziyyəti ilə əlaqədar olaraq xeyli sorğu - sual etdi. Xoşhal olduğumuzu bildirib bir - birimizlə xudahafizləşdik.

Münaqişə, mübahisə ilə aşıb - daşan, müxalifət və iqtidarın bir - birini ittiham etdiyi illərdə Bəxtiyar müəllimin gölgəsi- ni qamçılayanlar da tapılırdı. Bəzi qəzetlərdə hətta onu ittiham da edirdilər. Belə hallarda sağlam düşüncəli adamlar öz münasibətini bildirməyə bilmirdi.

XXI əsrin başlanması münasibətilə Bəxtiyar müəllimə göndərdiyim bir məktubda bu barədə öz rəyimi yazmışdım. Bir neçə gündən sonra Əhmədli qəsəbəsində yaşadığım 28 nömrəli bağçaya zəng vurmuşdu. Onu deyim ki, heç xəyalıma gəlməzdi ki, bu gərgin günlərdə o mənə cavab verməyə vaxt tapsın. Ancaq telefonda onun sözlərini eşitmək mənə son dərəcə xoş idi.

Məktub üçün öz təşəkkürünü bildirdikdən sonra dedi:

- Mən hər həftə 14-15 məktub alıram. Ancaq sənin məktubun qədər məni kövrəldəni olmamışdı.- ünvanını, telefon nömrəsini dedikdən sonra əlavə etdi - nə vaxt istəsən mənimlə görüşə bilərsən: Ancan əvvəlcə zəng vursan, çox yaxşı olar.

Bu söhbətdən bir neçə gün sonra zəng vurub məni yeni tamaşaya qoyulacaq «Özümüzü kəsən qılınc» pyesinə baxışa dəvət etdi. Xəstə olduğum üçün gedə bilmədiyimə indi də təəssüf edirəm.

Bəxtiyar müəllimlə son görüşüm 2004- cü ilin fevral ayında min nəfərdən çox şagirdi olan Binəqədi rayonu 183 nömrəli orta məktəbdə onun yaradıcılığına həsr edilmiş tədbirdə oldu. Bəxtiyar müəllimin pərəstişkarı olduğumu yaxşı bilən məktəbin dərs hissə müdiri Yaşar Həmidov məni də dəvət etmişdi. Bəxtiyar müəllimlə bərabər bu görüşə onun ən yaxın dostları olan görkəmli alim Cavad Heyət, Nurəd- din Rzayev və başqaları da gəlmişdilər.

Görüşə geniş hazırlıq görülmüşdü. Proqramda Bəxtiyar müəllimin yaradıcılığını əks etdirən çox maraqlı, rəngarəng səhnəciklər nümayiş etdirilir, şeirləri bəlağətlə oxunur, «Muğam» poemasından muğamlar ifa edilirdi.

Görüşün proqramı onun iştirakçılarına çox xoş təsir bağışladı. Bəxtiyar müəllim tədbir üçün pedaqoji kollektivə dönə - dönə öz razılığına bildirdi.

Neçə - neçə illər keçəcək, ancaq bu görüşün təəssüratı onun iştirakçılarının. qəlbində xatirəyə dönüb yaşayacaqdır.

Bəxtiyar müəllim, məzarın nurla dolsun, Sizə qəni - qəni rəhmət!

Mürsəl Qocayeb. Azərbaycan Jurnalistlət Birliyinin H.B.Zərdabi adına MHİMŞ-in Ustad və Şərəf media mükafatları laueratı.

**Kredo, 04 Aprel 2009-cu il.N-13**

## Fazil Cəbrayılovun "Düşüncələr" kitabından

Müəllim

*(Orta məktəbdə bizə ədəbiyyatdan dərs demiş, hazırda təqaüddə olan gözəl və səmimi insan Mürsəl Qocayevə)*

Nə tez gəlib keçdi omrümuz belə,
Ömrun çoxu gedib, qalanı azdır
Tamarzı qalmışıq obaya, elə,
Elin, obanın da qalanı azdır
O, günlər əbədi qalıb yadımda,
Yaddaş da boy alar əməldən, işdən
Səni görməsəm də Sənin haqqında,
Hal-əhval tuturam tanış-bilişdən
Əllinci illərin ortalarında,
Bizə ədəbiyyat dərsi deyərdin
Ədəbi qəhrəman obrazlarında,
Ədəbi bır həyat dərsi deyərdin
Şerə çevrilərdin, sozə dönərdin,
Az qala quş olub qanadlanardıq,
Elə danışardın, elə dinərdin,
Donub yerimizdə ovsunlanardıq
Misallar çəkərdin dərındən-dərın,
Həmin o, misallar bitməyib hələ
Məni öz sehrinə alan dərslərin,
Daşdı damağımdan getməyib hələ
Gəlir xatirəmə həmin o illər,
Həmin o nəsillər, o müəllimlər
O vaxt var olanlar keçir gözümdən,
Ölənlər, qalanlar keçir gözümdən.
Bilirdin yerini xeyirin-şərin,
Səd sərhəd qoyardın əyriyə-duzə.
Təkcə ədəbiyyat dərsi deməzdin,
Ədalət dərsi də deyərdin bizə.
Səni xatırlayıb sevənlər çox-çox.
Demə tanış üzlər sərin gorunur
Təkcə Qubadlıda, Zəngilanda yox,
Həmişə hər yerdə yerin gorunur.



**Mürsəl Qocayev bacanağı həkim Cavanşir Babayevin ailəsi ilə**



**Soldan sağa Mürsəl Qocayev, İbiş Məmmədov, – ,**
**Oktyabr Rüstəmov, Hürü Mehrəliyeva və İsfəndiyar Gözəlov**



**«Kənd Həyatı» qəzeti redaksiyası əməkdaşları və
ştatdan kənar müxbirlər**



**Mürsəl Qocayev qohumları ilə. Arxada soldan sağa oğlu Tahir və
həyat yoldaşı Xavər xanım.**



**Soldan sağa Mürsəl Qocayev, Balay Fərzəliyev, Yadulla Hacıyev, Ənvər Məmmədyarov və İsfəndiyar Gözəlov**



**Mürsəl Qocayev «Kənd Həyatı» qəzeti redaksiyası əməkdaşları və ştatdan kənar müxbirlərlə birlikdə**



**Soldan sağa Mürsəl Qocayev, Zeyqəm Hüseynov,**
**– – – , Balay Fərzəliyev**



**Mürsəl Qocayev və dayısı Zülfü Əhmədov**



**Xalq yazıçısı Süleyman Rəhimov və Mürsəl Qocayev**



**Mürsəl Qocayev və «Qara Volqa»nın müəllifi Cəmşid Əmirov**



**Soldan sağa Mürsəl Qocayev, baş mürəttib Fərəməz İsmayılov, məsul katib İbiş Məmmədov və şöbə müdüri Ərşad Əzimzadə**



**Xalq şairi Qabil Mürsəl müəllimin qızı Gülşən və oğlu Məzahirlə**



**Xalq şairi Bəxtiyar Vahabzadə və Cavanşir Babayev**
**Mart 1961.**



**Soldan sağa arxada Mürsəl Qocayev, T.Məmmədov, B.Vahabzadə, Q.Quliyev. Öndəkilər Y.Əliyev, A.Kərimov, M.Cəfərov**



**Mürsəl Qocayev, Sona Haşımova(Qubadlı) və digər rayon qazetlərinin redaktorları ilə.**




**Mürsəl Qocayev, «Kənd Həyatı»nın bir qrup əməkdaşı ilə redaksiya binasının qarşısında.**



**Mürsəl Qocayev redaksiya əməkdaşları ilə**



**Sarallı Xəştab kəndinin nümayəndələri Almalıq bulağında**



**Mürsəl Qocayev oğlu Tahir ilə**



**Cəlal Bərgüşad və  Mürsəl Qocayev**



**Mürsəl Qocayev qardaşları Əli və Səmədin ailəsi ilə**




**Xalq şairi Qabil və yoldaşı Mürsəl müəllimin ailəsini ziyarət edir. Öndə soldan sağa birinci icra nümayəndəsi Qüdrət Abdullayev.**




**Sarallı Xəştab kəndinin nümayəndələri.**
**Foto Mürsəl Qocayevindir.**



**Mürsəl Qocayev son tapşırıqlarını verir.**



**Gənc müxbir Mürsəl Qocayev**



**Mürsəl Qocayev dostları ilə birlikdə**



**Mürsəl Qocayev bir qrup ziyalı ilə**



**Soldan sağa Mürsəl Qocayev, qardaşı Vəli, qohumu F.Abdullayev, qardaşı Əli Qocayev və qohumu B.Abdullayev**



**Soldan sağa Hafiz Baxış, İlyas Tapdıq və Mürsəl Qocayev**



**Gənc foto müxbir Mürsəl Qocayev**



**Mürsəl Qocayev yazacağı məqaləsini düşünür**



**Soldan sağa Əli İldırım oğlu, Muradxan Cabbarov və Mürsəl Qocayev**



**Soldan sağa Əli Qocayev, – – –,
Məzahir və Mürsəl Qocayevlər**



**Soldan sağa İlham Rəhimli və Mürsəl Qocayev**



**Soldan sağa Alməmməd Kərimov, şair Atif Zeynallı və Mürsəl Qocayev**




**«Kənd Həyatı» qəzetinin 65 illik yubileyi münasibəti ilə buraxılmış dəvətnamə**



**Mürsəl Qocayev redaksiya kollektivi və ştatdankənar əməkdaşları ilə birlikdə**



Mürsəl Qocayev redaksiya kollektivi ilə birlikdə



Mürsəl Qocayev redaksiya kollektivi ilə birlikdə



Mürsəl Qocayev redaksiya kollektivi ilə birlikdə



Sarallı Xəştab kəndinin nümayəndələri

# Mündəricat

**Mətbəənin direktoru:** ***Elman Qasımov***
**Dizayner:** ***Azər Aydın***

Çapa imzalanmışdır: 11.08.2021.
Formatı 60x90 1/16.
Həcmi 13 ç.v. Sifariş № 39. Tiraj 300

«Zərdabi Nəşr» MMC Nəşriyyat Poliqrafiya müəssisəsi
Tel: (012) 514-73-73, mob. (050; 070) 344 76 01
e-poçtu: zerdabi_em@mail.ru